بسم الله الرحمن الرحيم

# Ön söz

Həqiqətən, həmd-sənalar Allaha məxsusdur. Biz Ona həmd-səna edir, Ona sığınır, Ondan bağışlanma və hidayət diləyirik. Nəfsimizin şərindən və pis əməllərdən Allaha sığınırıq. Allahın hidayət verdiyi şəxsi heç kim doğru yoldan azdıra bilməz, haqq yoldan azdırdığı kimsəni də heç kim hidayət yoluna yönəldə bilməz. Mən şəhadət verirəm ki, Allahdan başqa ibadətə layiq haqq məbud yoxdur, O təkdir və Onun heç bir şəriki yoxdur və şəhadət verirəm ki, Məhəmməd ﷺ Onun qulu və Elçisidir.

Həqiqətən Allah, insanları gözəl məqsəd üçün yaratmışdır. Bu məqsəd, yalnız Ona, heç bir şəriki olmayana ibadət etməkdən ibarətdir. Allah taala buyurur:

﴿ وَما خَلَقْتُ ٱلْجِنَّ وَٱلْإِنسَ إِلَّا لِيَعْبُدُونِ ﴿٥٦﴾ مَآ أُرِيدُ مِنْهُم مِّن رِّزْقٍ وَمَآ أُرِيدُ أَن يُطْعِمُونِ ﴿٥٧﴾ ﴾ (الذاريات: ٥٦-٥٧)

***﴾Mən cinləri və insanları yalnız mənə ibadət etmək üçün yaratdım! Mən onlardan ruzi istəmirəm, Mən onlardan Məni (ehtiyacı olan bəndələrimi) yedirtmələrini də istəmirəm!﴿ (əz-Zəriyat: 56-57).***

Insan yer üzündə, boş yerə deyil, müəyyən bir məsuliyyəti yerinə yetirmək üçün yaradılmışdır. Allah taala buyurur:

قال تعالى: ﴿ أَفَحَسِبْتُمْ أَنَّمَا خَلَقْنَـٰكُمْ عَبَثًا وَأَنَّكُمْ إِلَيْنَا لَا تُرْجَعُونَ ﴿١١٥﴾ ﴾

(المؤمنون: ١١٥)

***﴾Yoxsa sizi əbəs yerə yaratdığımızı və (qiyamət günü dirilib haqq-hesab üçün) hüzurumuza qaytarılmayacağınızı güman edirdiniz?﴿ (əl-Muminun:115).***

Allah taala buyurur:

و قال تعالى: ﴿ أَيَحْسَبُ ٱلْإِنسَـٰنُ أَن يُتْرَكَ سُدًى ﴿٣٦﴾ ﴾ (القيامة: ٣٦)

***﴾Məgər insan elə güman edir ki, o başlı-başına (cəzasız, yaxud əmr və qadağa olunmamış) buraxılacaq?!﴿ (əl-Qiyamə:36).***

Bu məqsədi həyata keçirməkdən ötrü Allah taala elçilər göndərmiş və kitablar nazil etmişdir.

Allah taala buyurur:

﴿ وَلَقَدْ بَعَثْنَا فِى كُلِّ أُمَّةٍ رَّسُولًا أَنِ ٱعْبُدُوا۟ ٱللَّهَ وَٱجْتَنِبُوا۟ ٱلطَّـٰغُوتَ ﴾ (النحل: ٣٦)

***﴾Biz hər ümmətə: "Allaha ibadət edin və tağutdan çəkinin! - deyə peyğəmbər göndərmişdik.﴿ (ən-Nəhl: 36).***

Allah taala Peyğəmbərimiz Məhəmmədi ﷺ peyğəmbərlərin sonuncusu etmişdir, həmçinin bəşər övladına nazil etdiyi şəriətlərinin sonuncusunu peyğəmbərimiz Məhəmmədə ﷺ vermiş və onu İslam adlandırmışdır. Allahın bütün şəriətləri xeyirxah işlər görməyə və pis-münkər işləri tərk etməyə çağırmaqla seçilmişdir. Bu haqda Allah taala buyurur:

قال تعالى: ﴿ وَأَوْحَيْنَآ إِلَيْهِمْ فِعْلَ ٱلْخَيْرَٰتِ وَإِقَامَ ٱلصَّلَوٰةِ وَإِيتَآءَ ٱلزَّكَوٰةِ ۖ وَكَانُوا۟ لَنَا عَـٰبِدِينَ ﴿٧٣﴾ ﴾ (الأنبياء: ٧٣)

***﴾Biz onlara xeyirli işlər görməyi, namaz qılmağı və zəkat verməyi vəhy etdik. Onlar yalnız Bizə ibadət edirdilər.﴿ (əl-Ənbiya: 73).***

Bu din Məhəmməd peyğəmbərin ﷺ göndərildiyi vaxtdan ta qiyamətə qədər sonuncu və bütün bəşəriyyətin dinidir. Allah bu dini gözəl əməllər, yüksək əxlaq, hər bir zaman və məkanda insanın sağlam fitrətinə uyğun olan asan şəriət hökmləri üzərində qurmuşdur. Allah bu dində hər bir xeyirə rəğbətləndirmiş, bütün yaxşı şeyləri halal *(mübah)* etmiş və şərdən çəkindirmiş, hər bir pis işi və insanın dünyasına, dininə zərər verən hər bir şeyi haram etmişdir.

Bütün bunlar müsəlmanın bu dünyadakı həyatında xoşbəxt olması, yaxşı yaşaması, bundan sonra əbədi səadətə, tam zəfərə və ən böyük kəramətə, izzət və cəlal sahibi Allahın axirətdə razılığına və cənnətinə qovuşması üçündür.
Hikmətli və hər şeyi layiqincə bilən Allahın dərgahından nazil olan bu əzəmətli dinə diqqətlə nəzər salan hər bir kəs, bu dinin, yüksək mənalar və gözəl hədəflər üzərində qurulduğunu dərk edər. İzzət və cəlalət sahibi Allah bu dini insanın dünya və axirət həyatında xoşbəxt olmasından ötrü bir qanun etmişdir: Necə də belə olmasın?! Allah Öz peyğəmbəri ﷺ haqda buyurmuşdur:

﴿ ٱلَّذِينَ يَتَّبِعُونَ ٱلرَّسُولَ ٱلنَّبِيَّ ٱلْأُمِّيَّ ٱلَّذِي يَجِدُونَهُۥ مَكْتُوبًا عِندَهُمْ فِي ٱلتَّوْرَىٰةِ وَٱلْإِنجِيلِ يَأْمُرُهُم بِٱلْمَعْرُوفِ وَيَنْهَىٰهُمْ عَنِ ٱلْمُنكَرِ وَيُحِلُّ لَهُمُ ٱلطَّيِّبَٰتِ وَيُحَرِّمُ عَلَيْهِمُ ٱلْخَبَٰٓئِثَ وَيَضَعُ عَنْهُمْ إِصْرَهُمْ وَٱلْأَغْلَٰلَ ٱلَّتِي كَانَتْ عَلَيْهِمْ ۚ فَٱلَّذِينَ ءَامَنُوا۟ بِهِۦ وَعَزَّرُوهُ وَنَصَرُوهُ وَٱتَّبَعُوا۟ ٱلنُّورَ ٱلَّذِيٓ أُنزِلَ مَعَهُۥٓ ۙ أُو۟لَٰٓئِكَ هُمُ ٱلْمُفْلِحُونَ ﴿١٥٧﴾ ﴾ (الأعراف: ١٥٧)

***﴿O kəslər ki, əllərindəki Tövratda və İncildə (adını, vəsfini və əlamətlərini) yazılmış gördükləri rəsula -ümmi (heç kəsin yanında oxuyub elm öyrənməmiş) peyğəmbərə tabe olurlar. (O peyğəmbər) onlara yaxşı işlər görməyi buyurar, pis işləri qadağan edər, təmiz (pak) nemətləri halal, murdar (napak) şeyləri haram edər, onların ağır yükünü yüngülləşdirər və üstlərindəki buxovları açar (şəriətin çətin hökmlərini götürər). O peyğəmbərə iman gətirən, yardım göstərən və onunla (onun peyğəmbərliyi sayəsində) endirilmiş nurun (Quranın) ardınca gedənlər - məhz onlar nicat tapanlardır!﴾ (əl-Əraf:157).***

Həmçinin buyurmuşdur:

﴿ فَمَنِ ٱتَّبَعَ هُدَاىَ فَلَا يَضِلُّ وَلَا يَشْقَىٰ ﴿١٢٣﴾ ﴾ (طه ١٢٣)

***﴿Hər kəs Mənim haqq yolumu tutub getsə, nə (dünyada) yolunu azar, nə də (axirətdə) bədbəxt olar!﴾ (Taha:123).***

﴿ يُرِيدُ ٱللَّهُ بِكُمُ ٱلْيُسْرَ وَلَا يُرِيدُ بِكُمُ ٱلْعُسْرَ ﴾ (البقرة ١٨٥)

***﴿Allah sizin üçün ağırlıq deyil, yüngüllük istər.﴾ (əl-Bəqərə:185).***
Həmçinin buyurmuşdur:

: ﴿ وَمَا جَعَلَ عَلَيْكُمْ فِى ٱلدِّينِ مِنْ حَرَجٍ ﴾ (الحج ٧٨)

***"Dində sizin üçün heç bir çətinlik yeri qoymadı ..." (əl-Həcc: 78).***
Peyğəmbər ﷺ buyurmuşdur:

«إنما بعثت لأتمم مكارم الأخلاق» أخرجه البيهقي في سننه وابن عبد البر في التمهيد، وصححه الألباني في السلسلة الصحيحة.

***"Mən gözəl əxlaqları tamamlamaq üçün göndərilmişəm"[1].***
Həmçinin Peyğəmbər ﷺ buyurmuşdur:

«إنه لم يكن نبي قبلي إلا كان حقا عليه أن يدل أمته على خير ما يعلمه لهم وينذرهم من شر ما يعلمه لهم» أخرجه مسلم.

***"Məndən öncə olmuş hər bir peyğəmbərin boynuna düşən borc, öz ümmətini onlar üçün xeyirli bildiyinə yönəltmək və şər bildiyindən də çəkindirmək idi."[2].***

Necə də belə olmasın?! Artıq Peyğəmbər ﷺ ən gözəl əxlaq, namus, təmizlik, bağışlama, Allaha olan tam mütilik, zillət və

---

[1] Beyhəqi: 10\ 191. İbn Əbdül Bərr: 16\ 254. Albani "Silsilətus Səhihə" kitabında (№ 45) hədisin səhih olduğunu demişdir.

[2] Müslim: 3\ 1472\ № 1844.

təvazükarlıq kimi keyfiyyətlərin son kamillik dərəcəsinə nail olmuşdur. Rəbbi ona bu sözü ilə şahidlik edərək buyurmuşdur:

﴿ وَإِنَّكَ لَعَلَىٰ خُلُقٍ عَظِيمٍ ۝٤ ﴾(القلم:٤)

***﴿Doğrudan da, sən böyük bir əxlaq sahibisən!﴾ (əl-Qələm: 4).***

Sonra isə Allah, bizə, onu özümüzə örnək qötürərək ardınca getməyi əmr etmişdir. Allah taala buyurur:

﴿ لَّقَدْ كَانَ لَكُمْ فِي رَسُولِ ٱللَّهِ أُسْوَةٌ حَسَنَةٌ لِّمَن كَانَ يَرْجُواْ ٱللَّهَ وَٱلْيَوْمَ ٱلْآخِرَ ﴾ (الأحزاب: ٢١)

***﴿Həqiqətən, Allahın Rəsulu Allaha və qiyamət gününə ümid bəsləyənlər üçün gözəl nümunədir!﴾ (əl-Əhzab: 21).***

İslam əhli üçün minnət və hər cür nemət kimi əmr olunan itaət və xeyirli işlər, qadağa olunan asilik və pisliklər, kamil özəllik və sifətləri örnək götürmək və s. buna bənzər nemətlər tamamlanmışdır. Bununla dinimiz hər bir cəhətdən kamil din olmuşdur. O, etdiyi hər bir əmrdə, qoyduğu qadağada, buyurduğu əməldə və həvəsləndirdiyi işlərdə bütün gözəllikləri cəm etmişdir.

İslamın gözəllikləri haqqında bilmək müsəlmanın öz dinindən daha bərk yapışmasını, ona olan məhəbbətini və bağlılığını artırır. Həmçinin bu gözəlliklər haqqında bilmək İslamdan uzaqlaşan hər kəsdə ona yenidən qayıtmağa rəğbət oyadır, onun üzünə təminat qapılarının ən əzəmətlisini açır ki, bəlkə hidayət tapıb təslim ola və bununla da, həm bu dünyada və həm də axirətdə salamat və qalib çıxar.

İbn əs-Səkən öz isnadı ilə rəvayət etmişdir ki, Əksəm ibn Seyfi Peyğəmbərin ﷺ çıxmasını eşidərkən onun yanına gəlmək istədi, amma qəbilə adamları ona imkan verməyərək dedilər: "Sən bizim böyüyümüzsən və səni tanıyacaqdır". İbni Seyfi dedi: "Məndən ona, ondan da mənə xəbər çatdıran gəlsin!". İki nəfər onun dediyini yerinə yetirmək üçün qarşıya çıxıb Peyğəmbərin yanına gəlib

dedilər: "Biz Əksəm ibn Seyfinin elçiləriyik. O sənin kim olduğunu və nə gətirdiyini soruşur". Peyğəmbər ﷺ buyurdu:

فقال النبي ﷺ: «إن الله يأمر بالعدل والإحسان وإيتاء ذي القربى وينهى عن الفحشاء والمنكر» فأتيا أكثم فقالا: أبى أن يرفع نسبه، فسألنا عن نسبه فوجدناه زاكي النسب واسطاً في مضر، وقد رمى إلينا بكلمات قد حفظناهن فلما سمعهن أكثم قال: أي قوم أراه يأمر بمكارم الأخلاق وينهى عن ملائمها فكونوا في هذا الأمر رؤساً ولا تكونوا فيه أذناباً، كونوا فيه أوّلاً ولا تكونوا فيه آخراً، فلم يلبث أن حضرته الوفاة فقال: أوصيكم بتقوى الله وصلة الرحم فإنه لا يبلى عليهما أصل. *انظر: الاستيعاب (١/١٤٦) الإصابة (١/٢١١)*

***"Allah adilliyi, yaxşılığı və yaxınlara əl tutmağı əmr edir, pis və münkər işlərdən çəkindirir." Elçilər Əksəmin yanına gəldilər və dedilər: O, öz nəslini ucaltmaqdan boyun qaçırtdı, mənsubiyyətini soruşduqda təmiz nəsəbli və Mudar tayfasında orta olduğunu gördük. O bizə bəzi sözlər dedi və biz onları əzbərlədik. Əksəm bu sözləri eşitdikdə dedi: "Ey qövmüm! Mən onun gözəl əxlaqa çağırdığını və pis əxlaqdan çəkindirdiyini görürəm. Siz bu işdə baş olun, quyruq olmayın! Bu işdə birinci olun, axırıncı olmayın!". Bir müddət sonra Əksəmin vəfatı yetişdi və o dedi: "Sizə Allahdan təqvalı olmanızı, qohumluq əlaqələrini birləşdirməyi vəsiyyət edirəm, çünki bu iki şeyin üzərindəki bünövrə nəmlənməz"[1].***

Allah Əksəm ibn Seyfini İslamın gözəlliklərindən bir parça bildiyi zaman onu küfrün alçaqlıqlarından imanın yüksəkliklərinə

[1] Bax: əl-İstiyab kitabı: 1\ 146. Əl-İsabə: 1\ 211.

qaldırdı. Əgər o, İslamın sonralar nazil olmuş mənalarını və qanunlarını görsəydi, görəsən necə olardı?!

Heç şübhəsiz bu belədir. Bəzi alimlər demişlər: Bu gün müsəlmanların, hətta bütün dünyanın, Allahın dininin bəyan edilməsinə, gözəlliklərinin izhar və həqiqətinin aşkar edilməsinə böyük ehtiyacları vardır. Allaha and olsun ki, əgər bu gün insanlar və bütün aləm bu dinin həqiqətini bilsəydilər, ona dəstə-dəstə daxil olardılar.

Bu yerdə qeyd edilməsi vacib olan odur ki, İslamın gözəlliklərini heç kəs sayıb qurtara bilməz. Ona görə ki, gözəllik və kamillik onun hər bir əmri və qadağasında, kiçik yaxud böyük mənası və əsasında vardır. Əgər kimsə tövhidin və ya namazın gözəlliklərindən danışmaq istəsə bu haqda çoxlu kitablar yazmalı olar.

Bu kitabın yazılmasında məqsəd İslamın gözəlliklərini tam əhatə etmək deyil, sadəcə olaraq işarəli sözlərə və özündən sonrakı mənalara aydınlıq gətirən kəlamları xatırlatmaqdır. Yaxşı başa düşən az sözlə də başa düşər. Hidayət olunan kəs Allahın hidayət verdiyi şəxsdir. Zəlalətə düşən isə haqdan köksü daralandır. Əgər ona mələklər nazil olsaydı və onu ölülər danışdırsaydı belə, Allahın istəyi olmadan yenə də hidayət olunmazdı. Bizi Öz dininə hidayət etdiyinə görə, Allaha həmd olsun. Əgər Allah bizə doğru yol göstərməsəydi biz onu tapa bilməzdik. Həqiqətən, Rəbbimizin rəsulları haqqı gətirmişlər. Allahın salat və salamı Peyğəmbərimiz Məhəmmədə, onun ailəsinə və səhabələrinə olsun.

***

# İslam dininin xüsusiyyətləri və digər özəllikləri haqda anlayış:

Şəriət: Allahın, Peyğəmbəri Məhəmmədə ﷺ nazil etdiyi əqidə və gündəlik həyatda zərüri olan hökmlərin adıdır.

Bu hökmlər doğruluğu və düzgünlüyünə görə saf su mənbəyinə bənzədilərək şəriət adlandırılmışdır. Həqiqətən, insan həyatı susuz mövcud ola bilməyəcəyi kimi, nəfslərin islah olunması və yaşayışı, ağılların qidası və sağlamlığı da bu şəriət qanunlarıdır.

İslam şəriətinin xüsusiyyətləri çox və müxtəlifdir. Bu, onun şərəfinin, mövqeyinin ucalığına və şəninin yüksəkliyinə dəlalət edir.

Bu xüsusiyyətləri çoxluğuna görə əhatə etmək mümkün deyil, amma bunların daha əhəmiyyətlilərini göstərmək olar və onlar aşağıdakılardan ibarətdir:

**1) Rəbbaniyyə:**

İslam şəriətinin ilk özəlliyi onun Rəbbani olmasıdır.

Burada Rəbbaniyyə dedikdə iki şey nəzərdə tutulur:

**<u>Birincisi:</u>** Həqiqətən, bu şəriət Rəbb *(Allah)* sübhənəhu və taala tərəfindən nazil edilmişdir. O, Allahın peyğəmbərlərinin sonuncusu Məhəmmədə ﷺ vəhy etdiyi şəriətdir. Bu şəriət heç bir məxluqun uydurması deyildir. Allah taala bunu təsdiqləyərək buyurur:

قال تعالى: ﴿ الٓرۚ كِتَٰبٌ أُحۡكِمَتۡ ءَايَٰتُهُۥ ثُمَّ فُصِّلَتۡ مِن لَّدُنۡ حَكِيمٍ خَبِيرٍ ١ ﴾ (هود: ١)

***﴿Əlif, Lam, Ra! Bu, ayələr hikmət sahibi və hər şeydən agah olan (Allah) tərəfindən təsbit olunmuş, sonra da müfəssəl izah edilmiş bir kitabdır.﴾ (Hud: 1).***

قال تعالى: ﴿ يَٰٓأَيُّهَا ٱلنَّاسُ قَدۡ جَآءَتۡكُم مَّوۡعِظَةٌ مِّن رَّبِّكُمۡ وَشِفَآءٌ لِّمَا فِي ٱلصُّدُورِ وَهُدًى وَرَحۡمَةٌ لِّلۡمُؤۡمِنِينَ ٥٧ ﴾ (يونس: ٥٧)

***﴿Ey insanlar! Sizə Rəbbinizdən bir öyüd-nəsihət, ürəklərdə olana (cəhalətə, şəkk-şübhəyə, nifaqa) bir şəfa, möminlərə hidayət və mərhəmət (Quran) gəlmişdir!﴾ (Yunus: 57).***

Peyğəmbərin bu şəriətdəki rolu sadəcə olaraq onu əyrilikdən qorumaq, sonra isə onu təbliğ etmək və aydınlaşdırmaqdır. Bu haqda Allah taala buyurmuşdur:

﴿ ۞ يَـٰٓأَيُّهَا ٱلرَّسُولُ بَلِّغۡ مَآ أُنزِلَ إِلَيۡكَ مِن رَّبِّكَۖ وَإِن لَّمۡ تَفۡعَلۡ فَمَا بَلَّغۡتَ رِسَالَتَهُۥۚ وَٱللَّهُ يَعۡصِمُكَ مِنَ ٱلنَّاسِۗ إِنَّ ٱللَّهَ لَا يَهۡدِي ٱلۡقَوۡمَ ٱلۡكَـٰفِرِينَ ٦٧ ﴾ (المائدة: ٦٧)

***﴿Ya Peyğəmbər! Rəbbin tərəfindən sənə endirilmiş olanı (Quranı) təbliğ et. Əgər (bunu) etməsən, Allahın risalətini (sənə həvalə etdiyi elçilik, peyğəmbərlik vəzifəsini) yerinə yetirmiş olmazsan. Allah səni insanlardan qoruyacaq. Həqiqətən, Allah kafir camaatı düz yola yönəltməz!﴾ (əl-Maidə: 57)***

Başqa bir ayədə isə belə buyurmuşdur:

﴿ وَأَنزَلۡنَآ إِلَيۡكَ ٱلذِّكۡرَ لِتُبَيِّنَ لِلنَّاسِ مَا نُزِّلَ إِلَيۡهِمۡ وَلَعَلَّهُمۡ يَتَفَكَّرُونَ ٤٤ ﴾(النحل: ٤٤)

***﴿Sənə də Quranı nazil etdik ki, insanlara onlara göndəriləni (hökmləri, halal-haramı) izah edəsən və bəlkə, onlar da düşünüb dərk edələr!﴾ (ən-Nəhl: 44).***

İslam şəriəti dünyada yeganə din və şəriətdir ki, onun mənbəyi yalnız Allahın vəhyidir. Bu din artırıb-əksiltmədən mühafizə edilən, tam və kamil olan, Allah kəlamıdır. Bu haqda Allah taala buyurmuşdur:

﴿ إِنَّا نَحۡنُ نَزَّلۡنَا ٱلذِّكۡرَ وَإِنَّا لَهُۥ لَحَـٰفِظُونَ ٩ ﴾ (الحجر:٩)

***﴿Şübhəsiz ki, Quranı Biz nazil etdik və, sözsüz ki, Biz də onu (hər cür təhrif və təbdildən; artırıb-əksiltmədən) qoruyub saxlayacağıq!﴾ (əl-Hicr: 9).***

Buna görə də İslam şəriəti ən yüksək kamillik, şamillik, rəhmət və ədalət kimi vəsf olunur. Çünki bu şəriəti nazil edən, məxluqatı yaradan və onların işlərinin sahibi, cəlal və kamal sifətləri ilə vəsf olunan Allahdır. O, hər bir naqislik, eyib, cahillik və nəfsinə uymaqdan pakdır. O, bəşər övladını tərbiyələndirən, onlar üçün əmin-amanlıq, rahatlıq və xoşbəxtlik yaradan nə varsa onu biləndir. Həqiqətən, Allah insanı müəyyən bir məqsəd üçün yaratmış, onlara şəriət göndərmiş, sayğı göstərmiş və yaratdıqlarının çoxundan üstün etmişdir. O, verdiyi əmrlərində mərhəmətli, Öz hökmündə hakim, yaratdıqları üzərində qadir, işində alim olan və bəndələrinə rəhm edəndir.

İnsanlardan ancaq bu şəriəti qəbul etmək və ona əməl etmək tələb olunur. Bununla onlar üçün bu dünyada xeyir, axirətdə səadət və dəhşətli qiyamət günündə aman hasil olar.

Bu şəriətin möminlər yanında müqəddəsliyi, nəfsləri üzərində hakimliyi və qəlblərində qorxusu vardır. Heç bir süni nizam və ya quruluş bu şəriətə bərabər ola bilməz.

**<u>İkincisi:</u>** Bu şəriətin yüksək məqsədi və gözəl hədəfi Allahın rəhməti və razılığını qazanmaqdır. Onun qayəsi və məqsədi Rəbbanidir. Bu haqda Allah taala buyurmuşdur:

﴿ قُلْ إِنَّ صَلَاتِي وَنُسُكِي وَمَحْيَايَ وَمَمَاتِي لِلَّهِ رَبِّ الْعَالَمِينَ ﴿١٦٢﴾ لَا شَرِيكَ لَهُ ۖ وَبِذَٰلِكَ أُمِرْتُ وَأَنَا أَوَّلُ الْمُسْلِمِينَ ﴿١٦٣﴾ ﴾ (الأنعام:١٦٢-١٦٣)

***"De: "Mənim namazım da, ibadətim də, həyatım və ölümüm də aləmlərin Rəbbi Allah üçündür! Onun heç bir şəriki yoxdur. Mənə belə buyurulmuşdur və mən ilk müsəlmanam!"" (əl-Ənam: 162-163).***

Heç şübhə yoxdur ki, İslam şəriətinin qayə və hədəfləri bu dünyada bəndələr üçün gözəl həyat şəraiti yaratmaqdır. Amma diqqətlə fikir verdikdə görürük ki, həqiqətdə həmin bu qayə və hədəflər əzəmətli hədəfə və böyük məqsədə xidmət edir. Bu, Allahın razılığına və Onunla möhkəm bağlılığa nail olmaqdır. Hədəflərin hədəfi və qayələrin qayəsi elə budur.

İnsanın bu Rəbbani şəriətə əməl etməsi onun mənəvi, ruhi xoşbəxtliyinin mənbəyidir. Çünki o, göylərin və yerin Rəbbinin yolu ilə gedir və Onun razılığını qazanmağa can atır, bu dində olan hər bir şeyin Allahdan və hər şeyin Allah üçün olmasına iman gətirir.

**2) Kamillik və şamillik:**

İslam şəriətinin dayağı möhkəm, binası isə kamildir. Həqiqətən bu şəriət, dünyada insanı bəşəriyyətin kamillik dərəcələrinə yüksəldən və axirətdə onu nicata yetişdirən şəriət qaydaları gətirmişdir.

Həmçinin İslam şəriəti cin və insanlar üçün nazil edilmiş ümumi bir dindir. O, bir tayfaya və nəslə xas olub digərlərinə aid olmayan şəriətlərdən deyil, əksinə bütün insanlar üçün nəzərdə tutulmuşdur.

Eləcə də İslam şəriəti, həyatın bütün sahələrini və cəmiyyətin hər bir təbəqəsini əhatə edir. Bu din hər təfərrüat haqqında məlumat vermədən, yaxud ona bir hökm aid etmədən və ya onu bir qaydanın daxilində qeyd etmədən onu tərk etməyib. Islam şəriəti insanların işi qarşısında aciz olmaz, bir cəmiyyətin yetişdiyi yüksək mərtəbədən geri qalmaz. Əksinə hər zaman və hər məkanda insanların mənfəətlərini həyata keçirər, hər bir anda və hər bir vəziyyətdə onların ehtiyaclarını ödəyər.

Quran və Sünnədə İslam şəriətinin ümumi və şamil olması haqda bir çox dəlillər mövcuddur. Bunlardan birində Allah taala buyurur:

﴿ قُلۡ يَٰٓأَيُّهَا ٱلنَّاسُ إِنِّي رَسُولُ ٱللَّهِ إِلَيۡكُمۡ جَمِيعًا ﴾ (الأعراف:١٥٨)

***"(Ya Rəsulum!) De: "Ey insanlar! Mən Allahın sizin hamınıza göndərilmiş peyğəmbəriyəm...." (əl-Əraf: 158).***

Allah taala buyurur:

﴿ وَمَآ أَرۡسَلۡنَٰكَ إِلَّا كَآفَّةً لِّلنَّاسِ بَشِيرًا وَنَذِيرًا وَلَٰكِنَّ أَكۡثَرَ ٱلنَّاسِ لَا يَعۡلَمُونَ ٢٨ ﴾ (سبأ:٢٨)

***"(Ya Rəsulum!) Biz səni (təkcə öz qövmünə deyil) bütün insanlara (möminlərə Cənnətlə) müjdə verən, (kafirləri isə Cəhənnəm əzabı ilə) qorxudan bir peyğəmbər olaraq göndərdik. Lakin insanların əksəriyyəti (bunu) bilməz!" (Səba: 28).***

Allah taala buyurur:

﴿ وَنَزَّلۡنَا عَلَيۡكَ ٱلۡكِتَٰبَ تِبۡيَٰنًا لِّكُلِّ شَيۡءٖ وَهُدٗى وَرَحۡمَةٗ وَبُشۡرَىٰ لِلۡمُسۡلِمِينَ ٨٩ ﴾ (النحل:٨٩)

***"Biz Quranı sənə hər şeyi (dini hökmləri, halal-haramı, günahı və savabı) izah etmək üçün, müsəlmanlara (və ya Allahın vəhdaniyyətini qəbul edən bütün insanlara) da bir hidayət, mərhəmət və müjdə olaraq nazil etdik!" (ən-Nəhl: 89).***

Bir hədisdə isə Peyğəmbər ﷺ buyurmuşdur:

«أعطيت خمساً لم يعطهن أحد قبلي..» «وكان النبي يبعث إلى قومه خاصّة، وبعثتُ إلى الناس عامّة» رواه البخاري في صحيحه.

***"Mənə, öncəkilərə verilməyən beş şey verildi...." sonra dedi: "Hər bir peyğəmbər ancaq öz tayfasına-göndərilirdi, mən isə bütün insanlara göndərilmişəm"[1].***

Başqa bir rəvayətdə deyilir ki:

---

[1] Buxari: 1\ 435-436\ № 355.

«كان كلّ نبيّ يبعث إلى قومه خاصة وبعثت إلى كل أحمر وأسود» رواه مسلم.

***"Hər bir peyğəmbər ancaq öz tayfasına məxsus göndərilirdi, mən isə hər bir qırmızı və qaraya (bütün insanlara) göndərilmişəm"[1].***

Bəzi qeyri müsəlman tarixçilərin: "İslam dəvəti yerli camaat olan ərəblər üçün gəlmiş və onların arasında yayılmışdır və fəthlərdən, İslam aləminin genişlənməsindən sonra bu dinin ümumdünya din olması qərara alınmışdır" – deməsi batil bir iddiadır. Quran və Sünnədən gətirdiyimiz əsaslar Məhəmməd ﷺ şəriətinin ümumbəşəriliyinə və bütün dünyaya aid olmasına dəlalət edir. İslam dini ümumbəşəri dindir və bu din dilindən, irqindən və cinsindən asılı olmayaraq hər zaman və hər məkanda bütün insanlara yönəldilmiş dindir.

Qurani-Kərim keçmiş peyğəmbərlərin şəriətindən bəhs edərkən həmin şəriətlərin öz tayfalarına aid olduğunu qeyd edir. Bu haqda Allah taala buyurmuşdur:

﴿ لَقَدْ أَرْسَلْنَا نُوحًا إِلَىٰ قَوْمِهِۦ فَقَالَ يَـٰقَوْمِ ٱعْبُدُوا۟ ٱللَّهَ مَا لَكُم مِّنْ إِلَـٰهٍ غَيْرُهُۥٓ ﴾ (الأعراف:٥٩)

***"Biz Nuhu öz tayfasına (peyğəmbər) göndərdik. O dedi: "Ey camaatım! Allaha ibadət edin. Sizin Ondan başqa heç bir tanrınız yoxdur..." (əl-Əraf: 59).***

﴿ وَإِلَىٰ عَادٍ أَخَاهُمْ هُودًا ﴾(هود:٥٠)

***"Ad tayfasına da qardaşları Hudu (peyğəmbər göndərdik)..." (Hud: 50).***

﴿ وَإِلَىٰ ثَمُودَ أَخَاهُمْ صَـٰلِحًا ﴾ (الأعراف:٧٣)

***"Səmud tayfasına da qardaşları Salehi (peyğəmbər göndərdik)..." (əl-Əraf: 73).***

---

[1] Müslim: 1\ 370-371\ № 521.

Allah taala Peyğəmbərimizin ﷺ şəriəti haqda danışarkən onun ümumi və ümumbəşəri olmasını açıq-aşkar qeyd edərək buyurur:

﴿ تَبَارَكَ ٱلَّذِى نَزَّلَ ٱلْفُرْقَانَ عَلَىٰ عَبْدِهِۦ لِيَكُونَ لِلْعَٰلَمِينَ نَذِيرًا ۝١ ﴾(الفرقان:١)

***"Aləmləri (insanları və cinləri Allahın əzabı ilə) qorxutmaq üçün (haqqı batildən ayıran) Quranı Öz bəndəsinə (Muhəmmədə) nazil edən Allah nə qədər (uca, nə qədər) uludur! (Ucalardan ucadır; əzəli və əbədidir, xeyir-bərəkəti bol və daimidir!)" (əl-Furqan: 1).***

﴿ وَمَآ أَرْسَلْنَٰكَ إِلَّا رَحْمَةً لِّلْعَٰلَمِينَ ۝١٠٧ ﴾ (الأنبياء:١٠٧)

***"Səni də (Ya Rəsulum!) aləmlərə (bütün insanlara və cinlərə) ancaq bir rəhmət olaraq göndərdik..." (əl-Ənbiya: 107).***

Bəzi alimlər bu məsələni təsdiqləyərək demişlər: "İslam dininin zəruriliyindən bəlli olmuşdur ki, Məhəmmədin ﷺ şəriəti hər bir ərəb-əcəm, varlı-kasıb, alim-cahil insanlar və hətta cinlər üçündür. O qiyamətə qədər davam edəcəkdir. Məxluqatdan heç kəsin bu dindən çıxmağa və ona əməl etməməyə haqqı yoxdur. Ümməti üçün qoyduğu dini qaydalara, sünnələrə, əmr və qadağalara, əməl etmək vacibdir. Əgər Məhəmməd peyğəmbərdən ﷺ öncəki peyğəmbərlər sağ olsaydılar ona itaət edər və onun ardınca gedərdilər".

Həqiqətən, bu sonuncu şəriətdir. O, özündən əvvəlki şəriətlər kimi, heç bir ayrıca götürülmüş tayfaya, cinsə və heç bir ayrıca götürülmüş zamana məxsus deyil. İnsanların əvvəlki şəriətlərə riayət etmələri bu dinə hazırlıq idi. Bu şəriət əvvəlki şəriətlərdən fərqli olaraq bünövrəsində kamil və prinsipial müddəaları ilə hər şeyi əhatə edir. O, bütün bəşəriyyət üçün nazil edilmiş din qanunvericiliyinin əsasıdır.

Bəli, İslam şəriəti öz hökmləri və əsasları ilə həyatın bütün sahələrini və insanın ehtiyaclarını tam əhatə etmişdir. Bu şəriət

insanın məqsədlərini nəzərə almış və onun yaradılış qayəsini açıqlamışdır. Rəbbi ilə onun bağlılığını, qohum-qardaşla və yaşadığı cəmiyyətlə əlaqəsini qaydaya salmış, hüquqlarını və vacib əməllərini müəyyən etmiş, münaqişələri həll etmək və hər kəsin haqqını özünə qaytarmaq üçün əsaslar qoymuş, insanlar arasında onların həyatını və işlərini hər cəhətdən qoruyan ədalət qaydalarını sabitləşdirmişdir.

Həqiqətən, bu şəriət dini, dünyanı, zahiri və batini özündə cəm etdiyinə görə həyatın kamil yoludur. Bununla o, insan üçün dünya və axirət xeyrini bir araya toplamışdır.

Belə kamil və əhatəli şəriətin müsəlmanın yolunu işıqlandırması onun üçün müjdədir. Həmçinin bu şəriət hər böyük-kiçik, gizli-aşkar, zahir-batin işdə müsəlmana yol göstərir.

Peyğəmbər ﷺ şəriəti vəsf edərək buyurmuşdur:

«قد تركتكم على البيضاء ليلها كنهارها ، لا يزيغ عنها بعدي إلا هالك» رواه ابن ماجة والإمام أحمد في مسنده، وصححه الألباني في ظلال الجنة .

***"Sizi ağ (işıqlı) yolun üzərində tərk etdim, onun gecəsi gündüz kimidir. Məndən sonra ondan yalnız məhv olmağı seçən kimsə azar"[1].***

**3) Əvvəlki şəriətlər üzərində hakimlik:**

Bir neçə gerçəkliklər vardır ki, onlarda heç bir şəkk-şübhə yoxdur. O həqiqətlər bunlardır: Allahın dini birdir, bütün rəsullar - Adəmdən (*ona Allahın salamı olsun*) peyğəmbərlərin sonuncusu Məhəmmədə ﷺ qədər hamı bu dini yaymış və davam etdirmişlər. Bu haqda Allah taala buyurur:

[1] İbn Macə: 1\ 16\ № 43. Əhməd: 4\ 126. Albani "Zilalul Cənnə" kitabı, № 48-də hədisin səhih olduğunu demişdir.

﴿ شَرَعَ لَكُم مِّنَ ٱلدِّينِ مَا وَصَّىٰ بِهِۦ نُوحًا وَٱلَّذِىٓ أَوۡحَيۡنَآ إِلَيۡكَ وَمَا وَصَّيۡنَا بِهِۦٓ إِبۡرَٰهِيمَ وَمُوسَىٰ وَعِيسَىٰٓۖ أَنۡ أَقِيمُواْ ٱلدِّينَ وَلَا تَتَفَرَّقُواْ فِيهِ ﴾ (الشورى:١٣)

***"(Ya Peyğəmbər!) Allah: "Dini doğru-dürüst tutun (qoruyub saxlayın), onda ayrılığa düşməyin!" – deyə Nuha tövsiyə etdiyini, sənə vəhy buyurduğunu, İbrahimə, Musaya, və İsaya tövsiyə etdiyini dində sizin üçün də qanuni etdi. Sənin dəvət etdiyin (tövhid dini) müşriklərə ağır gəldi. Allah istədiyi kimsəni özünə (peyğəmbər) seçər və tövbə edib Ona tərəf qayıdan kimsəni də doğru yola yönəldər!" (əş-Şura: 13).***

Peyğəmbərlərin və rəsulların dinləri bünövrə baxımından eyni olsa da onların şəriətləri və yolları başqa-başqa idi. Bu haqda Allah taala buyurur:

﴿ لِكُلٍّ جَعَلۡنَا مِنكُمۡ شِرۡعَةً وَمِنۡهَاجًا ﴾ (المائدة:٤٨)

***"Sizin hər biriniz üçün bir şəriət və bir yol təyin etdik...." (əl-Maidə: 48).***

Səmavi dinlərin əsası eyni, şəriətləri isə insanların hal-əhvalına, vəziyyətlərinə və Allah təbarəkə taalanın bildiyi şeylərə görə müxtəlifdir.

Artıq İslam şəriəti ötən şəriətlərin sonuncusu olaraq gəlmişdir. O, əvvəlki şəriətlərin gözəlliklərini özündə cəm etmiş və onların üzərində hakim olmuşdur. Bu haqda Allah taala buyurur:

﴿ وَأَنزَلۡنَآ إِلَيۡكَ ٱلۡكِتَٰبَ بِٱلۡحَقِّ مُصَدِّقًا لِّمَا بَيۡنَ يَدَيۡهِ مِنَ ٱلۡكِتَٰبِ وَمُهَيۡمِنًا عَلَيۡهِ ﴾ (المائدة:٤٨)

***"(Ya Rəsulum!) Biz (Quranı) sənə haqq olaraq, özündən əvvəlki kitabı (bütün ilahi kitabları) təsdiq edən və onu qoruyan (və ya onların doğruluğuna şahid) olaraq endirdik..." (əl-Maidə: 48).***

Məhəmməd şəriəti özündən əvvəlki bütün səmavi şəriətləri əhatə etmiş, onlardan kamilliyinə və gözəlliyinə görə üstün olmuşdur.

Bəzi alimlər deyirlər: "Allah yüz dörd kitab nazil edib və onların elmini dörd kitabda cəm etmişdir: Tövrat, İncil, Zəbur və Furqan. Sonra bu dörd kitabın elmlərini Quranda cəm etmişdir".

Digər alimlər isə belə deyirlər: "Quran, özündən əvvəlki kitablarda olan, Allah və axirət günü haqda xəbərləri təsdiq etmiş və açıqlamış, təfsilatını vermiş, onlara olan dəlil və sübutları bəyan etmişdir. Bütün peyğəmbərlərin peyğəmbərliyini və rəsulların şəriətlərini təsdiq etmişdir. Cürbəcür dəlillər və sübutlarla ötən şəriətləri təsdiq etmiş, Allahın onlara nəsib etdiyi aqibəti və kitablara tabe olanlara etdiyi kömənkləri açıqlamışdır. Şəriətlərə insanlar tərəfindən edilən artırıb-əskiltməni, kitab əhlinin əvvəlki kitablara etdikləri dəyişiklikləri, bəyan edilməsi əmr olunmuş hökmləri gizli saxladıqlarını bildirib aşkara çıxartmışdır. Həmçinin peyğəmbərlərin gətirdikləri gözəl şəriətləri və yolları da açıqlamışdır. Beləliklə, Qurani-Kərim ondan əvvəlki kitablardan bir-sıra cəhətlərinə görə üstündür. Məsələn, o, doğru olanları təsdiqləyir, insanlar tərəfindən dəyişdirilən hökmlərə şahidlik edir, Allahın buyurduqlarını təsdiqləyir, nəsx *(hökmünü ləğv)* etdiyi şəriət qanunlarını ləğv edir və Qurani-Kərim xəbər verilənlərə şahid, əmr olunanlara hakimdir. Ta qədim zamanlardan bu günə qədər insanların dini əsaslar, ilahi elmlər, qiyamət, peyğəmbərlik, əxlaq, siyasət, ibadət, nəfsi kamillik, səadət, nicat və s. haqda dedikləri sözlər, Qurani-Kərimdə buyurulanlara nisbətən, onun çox az bir hissəsini təşkil edir".

Sözün qısası, İslam dini insanlara verilmiş ilahi şəriətlərin axırıncısı, Məhəmməd ﷺ isə peyğəmbərlərin sonuncusudur. İslam şəriəti və ona dəvət qiyamət qopana qədər davam edəcəkdir. İslam şəriəti müəyyən bir vaxtla məhdudlaşmayıb. Ona görə də bəşəriyyətin həyatını təkmilləşdirməkdən ötrü onun tətbiqi

dondurulmazdır. Əksinə, o, bütün bəşəriyyətə göndərilmiş ümumi və sonuncu şəriətdir. Bu şəriət, insanın fitrətinə və ağlına müraciət edərək gözəl işlərə can yandırmağı artırır, onun üçün qayda-qanun qoyur, getdiyi yolu müəyyən edir və həyatında onun üçün işıq saçır. İnsandan, sadəcə olaraq, İslam şəriətinə riayət etmək tələb olunur. İnsan onunla hər bir çətinliyin həllini, yeniliyin hökmünü, hər kiçik və böyük işdə yönəldilmə və ya əmr tapacaqdır.

**4) İslamın ədalətli şəriət olması:**

İslam şəriəti öz əsasında, məsləkində, kamilliyində və hökmlərində Rəbbani şəriətdir. O, ötən şəriətlər üzərində hakimdir və Qiyamət qopanadək daima qalacaqdır. Ona görə də onun bütün hökmləri orta və ədalətlidir. Bu haqda Allah taala buyurur:

﴿ وَكَذَٰلِكَ جَعَلۡنَٰكُمۡ أُمَّةٗ وَسَطٗا ﴾(البقرة: ١٤٣)

*"(Ey müsəlmanlar!) Beləliklə də, sizi (ədalətli və seçilmiş) bir ümmət etdik..."* ***(əl-Bəqərə: 143).***

Bəzi alimlər deyirlər: "Allah onları dində orta yol tutduqlarına görə adil adlandırmışdır. Onlar nə həddini aşanlar, nə də qayğısızdırlar, lakin onlar ədalətlidirlər. Allah onları belə təsvir etmişdir. Çünki Allahın ən çox sevdiyi iş, adil işdir".

Ərəb dilində *"vəsət"* sözü xeyir mənasını daşıyır. Buna görə də bir nəfəri tərifləmək üçün misal olaraq: "Filankəs öz tayfası arasında vəsətdir (ədalətli və ortamövqelidir)" - deyirlər. Bu baxımdan vəsət sözü adillik və ortamövqelilik mənası ilə açıqlanmışdır. Çünki insanların ən xeyirlisi adıl olanıdır.

Qanun və düsturların tətbiqində adil, orta mövqeli olmaq asan iş deyil. Qanun və düstur qoyan bəşər övladları orta mövqe tutmaqda acizlik çəkirlər. Onlardan bəziləri tam sol tərəfə, bəziləri isə tam sağ tərəfə yönəlirlər. İslam şəriəti bu yöndə tayı-bərabəri olmayan, yeganə mövqe tutur. Onun müəyyən etdiyi işlərdə nə

ifratçılıq *(həddini aşmaq),* nə də laqeydlik vardır. Əksinə o, adillikdən əsla üz döndərməyən ortamövqeli və ədalətli şəriətdir.

Bu sübut edir ki, adil və orta mövqeli qayda-qanun yaratmağa yalnız İslam şəriəti qadirdir. Çünki bu şəriət Allah tərəfindən nazil olunmuşdur. O, hər şeyin haqqını doğru hesaba alan, əməlləri dəqiq tərəzidə çəkən, hər şeyi saya-hesaba alan, heç bir şeyi faydasız yaratmayan, naqis və eyibli sifətlərdən uzaq olan Allahdır. Elə buradan da, İslam şəriəti ortamövqeliliklə vəsf olunmuşdur. İslam şəriətinin ədalətli olması, naqis məxluqun təsəvvür etdiyi kimi deyil, Allah taalanın istəyinə uyğun, adil olmasıdır. Orta: həddi aşmadan adil, naqislik olmadan ədalətlilikdir.

Bəzi alimlər deyirlər: "Orta: dairənin mərkəzi kimi, tərəf nisbətlərinin özünə bərabərməsafəli olmasıdır. İfrat *(həddini aşmaq)* və təfrit *(laqeydlik)* baxımından, hər tərəfdən özünü əhatə etmiş pis işlərin ortası olan bu yaxşı işlər, sonralar bəşəriyyətin gözəl işlərinə bir ad olaraq verilmişdir".

İslam şəriətinin ədalətli olması müəyyən cəhətə və ya sahəyə xas deyil, onun bütün əhkamlarına aiddir. Ona görə şəriətin ədalətli olmasını çəkiləcək misallar və dəlillərlə əhatə etmək mümkün deyil. Şəriətin ruhla bədən, fərdlə cəmiyyət rəyi arasındakı bərabərliyini misal çəkmək olar:

İslam şəriəti öz hökmlərində ruhla vücud arasında münasibətləri nəzərə almışdır. O, bəzi dinlərdəkindən fərqli olaraq, nə bədəni rədd edib, ruh haqqında təsəvvürlərin dərinliyinə gedən, nə də – batil və təhrif olunmuş dinlərdə olduğundan fərqli olaraq - bədəni və maddiliyi üstün tutaraq ruhun haqqını inkar edən deyildir. Həqiqətən o, Peyğəmbərin ﷺ nişan verdiyi ədalətli şəriətdir:

«والله إني لأخشاكم لله، وأتقاكم له لكني أصوم وأفطر، وأصلي وأرقد، وأتزوج النساء، فمن رغب عن سنتي فليس مني». رواه البخاري في صحيحه ومسلم.

***"Allaha and olsun ki, mən sizin Allahdan ən çox qorxanınız, ən çox təqvalı olanıyam, buna baxmayaraq mən oruc tutur və iftar açıram, namaz qılıram və yatıram, qadınlarla da evlənirəm. Kim mənim Sünnəmdən (qoyduğum yoldan) üz döndərərsə məndən deyildir"[1].***

Fərdin və cəmiyyətin münasibətləri arasındakı bərabərlik: İslam dini, müəyyən bir şəxsin və ya toplumun məsləhətinə görə insanları təhqir etməklə, aldatmaqla, hüquqlarını pozmaqla özlərini demokratik adlandıranlardan, yaxud, bir toplumun rəyinə görə fərdin hüquqlarını heç edən kommunistlərdən fərqli olaraq fərdin və ictimaiyyətin maraqlarını ədalətlilik mövqeyindən nümayiş etdirir.

İslam şəriəti iki rəy arasında bərabərlikdir. Şəriətə görə hər kəsin tam xüsusi mülkiyyəti vardır. Əgər o, öz mülkiyyəti xatirinə təcavüz edərək, camaatın haqqına toxunarsa, heç bir təhqir və ya mübaliğə olmadan, olduğu yerdə də dayandırılmalıdır. Bunun əvəzində yer üzünün adamları birləşərək bir adamı öldürərlərsə, onlardan həmin adamın qisası alınmalıdır. Çünki, öldürən kimsələr ölən kimsəylə yaşamaq hüququnda bərabərdirlər.

Xülasə: İslam öz mütəkamil şəriəti ilə icma hüquqlarını təsdiq etdiyi kimi, fərdin hüquqlarını da isbat edir. Onların hər ikisinin arasında müəyyən tənzimləmə, uyğunluq və birlik yaradır, onlara münasib qanunlar buyurur, hər ikisinin əlaqəsini biri-birinə sıx bağlayır. Toplumla fərdin mənfəəti arasında hər hansı ziddiyət olduqda İslam şəriəti cəmiyyətin mənafeyini fərdin mənafeyindən daha üstün tutur.

---

[1] Buxari: 9\ 104\ № 5063. Müslim: 2\ 1020\ № 1401.

Eləcə də bütün şəriət hökmlərində orta mövqe tutub, bərabərlik yaradaraq dünya və axirət tələbatlarını tənzimləyir. Dünyanın öz tələbləri, axirətin də öz lazımı müvafiq tələbləri mövcuddur. Şəriətdə hər ikisinin kifayəti vardır. Dünya və axirəti qazanmaq üçün nə ifrata *(həddini aşmaq)* nə də laqeydliyə yer yoxdur. Əksinə, İslam dininin mövqeyi orta mövqedir. Bunun təfsilatı çox uzundur. Bu müxtəsər kitabçada buna kifayət qədər yer ayırmaq mümkün deyil. Amma qarşıda gələn fəsillərdə İslam şəriətinin qaydalarından çəkiləcək bəzi misallar məsələyə tam aydınlıq gətirəcəkdir.

**5) İslam şəriətinin xeyri (məsləhəti) cəlb etmək və zərəri (məfsədəni) dəf etməyin üzərində qurulması:**

İslam, Rəbbani, ümumbəşəri və dünyanın son günlərinə qədər davam edəcək şəriət olduğu üçün, həm şəxsiyyətin və həm də cəmiyyətin dünya və axirətini islah edəcək bütün ehtiyaclarını özündə əhatə etmişdir. Ona görə bu sonuncu şəriət külli əsaslarla, həmişə və hər yerdə diqqət edilən böyük məqsədlər üçün varid olmuşdur. Bu səbəbdən həmin əsasların və məqsədlərin dövrəsində ictihad qapısını açmışdır ki, bəşər övladı onun hökmlərinə əməl etsin, itaət, ibadət və bunları şəriət edənin hakimliyini etiraf edərək savab qazansın.

Bu haqda bəzi alimlər deyiblər: "Şəriətin əsası və binası hikmətlər, bəndələrin yaşayışı və Allaha qayıdışı üçün xeyir, hər şeyi adillik, rəhmət, mənafelər üzərindədir. Ədalətdən zülmə, rəhmətdən onun əksinə, xeyirdən şərə, hikmətdən əbəsə çıxan və çevrilən hər bir iş şəriətdən deyildir. Əgər bir şeyin forması, zahiri görünüşü dəyişdirilib bu şəriətə aid edilərsə həmin əməl gec-tez özünün batilliyini biruzə verəcəkdir. Çünki İslam şəriəti Allahın bəndələri arasında ədaləti, mərhəməti, yerdəki kölgəsi və Onun varlığına dəlalət edən hikmətidir. İslam şəriəti Allahın, Onun Rəsulunun ﷺ sadiqliyinə tam və doğru sübutu, bəsirət sahiblərinin gördükləri nuru və hidayət olunanların hidayətidir. O, hər xəstəliyin dərmanı

və ona riayət edənlərin doğru və düz yoludur. O, gözlərin işığı, qəlblərin canı, ruhların ləzzətidir. Həyat, qidalanma, dərman, nur, şəfa, sağlamlıq və hər bir xeyir onunla hasil olmuş, ondan götürülmüşdür. Mövcud olan bütün naqisliklərin səbəbi onun tərk edilməsidir. Əgər İslam şəriətinin əsasları qalmasaydı bütün dünya və onun təfərrüatları xarab olardı. O, insanların qorunmasına və dünyanın qalmasına səbəbdir. Allah, göyləri və yeri düşməsin deyə onunla saxlayır. Allah dünyanın və onun incəliklərinin xarab olmasını istədiyi zaman şəriətin orada qalmış əsaslarını götürər. Allahın peyğəmbərlərinə verdiyi şəriət dünyanın dirəyi, dünyadakı və axirətdəki nicat, xoşbəxtlik qütbüdür".

Digər alim belə deyir: "İslam şəriətini və onun kamil bir şəriət olduğunu dərk edən şəxs, ədalətli siyasətin İslamın bir hissəsi və şöbəsi olduğunu anlayar. Kim bu şəriətin məqsədlərini, halını və yerini layiqincə dərk edərək bacarıqlı düşüncə sahibi olarsa, heç vaxt başqa siyasətə ehtiyac duymaz. Çünki bu şəriət bəndələrin dünya və axirəti üçün xeyirli olan bir şəriətdir. O, insanlar arasında hakim olacaq tam ədalətli şəkildə formalaşdırılmışdır. Onun ədalətindən başqa üstün bir ədalət, onun özündə cəm etdiyi xeyirxahlıqdan başqa üstün xeyirxahlıq yoxdur.

İslam alimləri şəriət hökmlərini dərindən öyrəndikdən sonra bu həqiqət barədə yekdil qərara gəlmişlər. Onlardan biri belə deyir: "İslam şəriəti xeyirli olanları toplayıb təkmilləşdirmək, pozğunluqları yox etmək və azaltmaq üçün gəlmişdir".

Başqa bir alim isə buyurur: "İslam şəriəti bütünlükdə xeyir deməkdir. O, ya pozğunluğun qarşısını alır ya da xeyirli olanları özünə cəlb edir. Sən Allah təalanın: "Ey iman gətirənlər!" - sözünü eşitsən diqqətli ol! Çünki bu, ayədə ya səni xeyirə sövq etdirir, ya da şərdən çəkindirir. Ola bilsin ki, bir ayə həm xeyrə sövq etdirsin və həm də şərdən çəkindirsin.

Alimlər ümmətin həyatını möhkəmlətməkdə təsiri olan məsləhətləri *(qanunları)* üç qismə bölmüşlər: Zəruri, lazımlı, yaxşılaşdırıcı.

**Zəruri məsləhətlər:** Bu, insanların həyatı üçün mühüm və zəruri sayılan məsləhətlərdir. Bu isə o deməkdir ki, həmin məsləhətlər mövcud olmadıqda pis və qüsurlu qayda-qanun yaranar, özbaşınalıq hökm sürər. Bəzi alimlər zəruri məsləhətlərə belə tərif veriblər: "Zərurət**:** Din və dünya mənfəətlərini və məqsədlərini həyata keçirmək üçün onun mövcudluğu mütləqdir - deməkdir. Əgər o olmazsa, dünya mənfəət və məqsədləri öz axını ilə deyil, əksinə fitnə-fəsad və özbaşınalıq üzərində cərəyan edər. Beləliklə, axirət xoşbəxtliyi və nemətləri də əldən çıxar".

Şəriətin qorunmasını nəzərdə tutduğu zəruri məsləhətlər beşdir: Din, nəfs, ağıl, mal və nəsəb. Şəriətin bu zərurətləri qoruması iki əsas amillə həyata keçirilir:

***Birinci:*** Onun rüknlərini və əsaslarını möhkəmlətmək və həyata keçirmək. Bu əsaslar, bəndələrdən tələb olunan şəriət hökmlərində vardır. Həmin hökmlər iman və İslamın əsasları və bu əsasları pozan hər bir küfr və mürtədliklə bağlı hökmlər sırasındadır.

***İkinci:*** Nəfsi, yemək, içmək, paltar və məskən ilə baş verə biləcək hər bir çatışmazlıqdan qorumaq; ona zərər verəcək və onu məhv edəcək hər bir təhlükədən: düşmənçilik, qətl və s. pisliklərdən çəkindirməkdir.

Ağılın qorunmasını, onu məcrasından çıxaran sərxoşedici və uyuşdurucu maddələrin haram edilməsi ilə həyata keçirir. Beləcə, İslam şəriətinin bu beş zəruriyyəti iki yöndən: onun mövcudluğu və onu məhv edən amilləri qadağan etməklə - qoruduğunu görürük.

**Lazımlı məsləhətlər:**

Bu məsələlərin tətbiq olunmaması insanların həyatını tam korlamır, lakin bir sıra çətinliklər yaradır. Buna görə alimlərdən biri belə buyurub: "Lazımlı məsləhətlərin mənası, mətləbə mane olan

çətinlikləri aradan qaldırmaq üçündür. Bu məsləhətlər qorunmadıqda insan cəmiyyətində müəyyən çətinliklər meydana çıxır. Lakin buna baxmayaraq bu məsləhətə olan laqeydlikdən irəli gələn korlanma, digər ümumi məsləhətə olan laqeydlikdən nəticələnən fəsad dərəcəsinə yetişmir". Ehtiyaci məsləhət ibadətlər, adətlər, əlaqələr və cinayətlərdə olur və məsələn:

*Ibadətlərdə:* məşəqqətə görə xəstəyə verilən rüxsət.

*Adətlərdə:* ovun halal olması, yeyilən, içilən, geyilən, minilən və yaşanılan və s. bu kimi halal nemətlərdən ləzzət almaq.

*Əlaqələrdə:* Borc vermək, nisyə mal satmaq və s.

*Cinayətlərdə isə:* zərər verənlərin *(cinayətkarların)* boynuna düşən cərimələr *(diyətlər, qanbahaları)*.

**Yaxşılaşdırıcı məsləhətlər:**

Bu haqda alimlərdən biri buyurur: "Bu cür məsləhətlər - gözəl adətlərdən layiqlisini götürmək, sağlam ağılların inkar etdiyi pis işlərdən isə uzaq olmaqdır". Bu bölüm gözəl əxlaq mövzusuna aiddir.

Bu cür məsləhətlər ibadətlər, adətlər, əlaqələr və cinayətlərdə olur.

*Ibadətlərdə:* Təharətin bütün növləri, övrət yerlərinin örtülməsi, zinətlərdən (qızıl-gümüş və s.) istifadə, könüllü xeyirxahlıq və sədəqə ilə Allaha yaxınlaşmaq və bunlara bənzəyən digər məsələlərdə olur.

*Adətlərdə:* Yemək və içməyin ədəbləri, pis yeməklərdən və israfçılıqdan uzaq olmaq və s.

*Əlaqələrdə:* Qüsurlu, nöqsanlı şeyləri satmağın qadağan olması.

*Cinayətlərdə:* Azad insanın, qulu öldürdüyünə görə, ölüm cəzasından azad olunması. Yaxud cihad zamanı qadınları, uşaqları və qocaları öldürməyin yasaq olması. Çəkdiyimiz bu misallar, bunlara bənzəyən misalları əvəz edir. Bu dediklərimiz zəruri və ehtiyac üzündən doğan məsləhətlərin əsasına əlavə edilən gözəlliklərdir. Bunların

olmaması zəruri və ya ehtiyacdan doğan bir məsləhətə xələl gətirmir. Bu cür məsləhətlər yalnız gözəllik rolu oynayır".

**Çətinliyin dəf edilməsi və şəriət hökmlərinin yüngülləşdirilməsi:**

İslam dini, çətinlikləri dəf etmək və şəriət hökmlərini yüngülləşdirməklə digər şəriətlərdən fərqlənir. Bu dinin hökmləri insanın dəyişən əhvalını, zəifliyini və qüvvətini, səfərdə və qeyri səfərdə olmasını nəzərə almışdır. Xüsusən də bu şəriət ümumiyyətlə və həmişə bütün dinlərin sonuncusudur. Bu şəriət göndərilən elçi: peyğəmbərlərin sonuncusu, Peyğəmbərimiz Məhəmməddir ﷺ. Həmçinin onun şəriətinin gəlməsi dövrü qiyamətin lap yaxınlaşması deməkdir. Belə ki, Peyğəmbər ﷺ buyurub:

«بعثت والساعة كهاتين» . رواه البخاري ومسلم في صحيحه.

*"Mənim gəlməyim ilə qiyamətin qopması belədir! (deyib, şəhadət barmağı ilə orta barmağını birləşdirərək göstərdi)".*

Xitab olunan ümmət bəşəriyyətin son sülaləsi olması, qiyamətdən öncə baş verəcək fitnələr, ömrün qısalığı və s. bu kimi şeylərin olması bu şəriətin hökmlərinin mülayimlik, bağışlanma və lütf üzərində qurulmasına səbəb olmuşdur. Çünki şəriətləri göndərməkdə və ibadətləri əmr etməkdə məqsəd; Allaha olan itaəti yaymaq və bu işi davam etdirməkdir. İbadət tövhidin təsdiqi və onun verdiyi əmrlərin qəbul edilməsidir. Belə ki, tövhid; göylərin və yerin əsası, bəşəriyyətin ondan ötrü yaradıldığı bir haqdır. Şəriət Allahdan bir rəhmətdir və həqiqətən Allah Rəhman və Rəhimdir. Allah təala buyurur:

﴿وَمَآ أَرۡسَلۡنَٰكَ إِلَّا رَحۡمَةٗ لِّلۡعَٰلَمِينَ ١٠٧﴾ (الأنبياء:١٠٧)

*"(Ey Məhəmməd!)Biz səni aləmlərə rəhmət olaraq göndərdik". (əl-Ənbiya: 107)*

Allah öz kəramətli Peyğəmbərinə ﷺ müraciət edərək buyurur:

﴿ وَنُيَسِّرُكَ لِلْيُسْرَىٰ ﴿٨﴾ ﴾ (الأعلى:٨)

*"Səni rahatlığa müyəssər edəcəyik". (əl-Ələ: 8).*

Yəni səni ən rahat şəriətə müvəffəq edəcəyik. Bu da səmavi şəriətlərin sonuncusu olan İslam şəriətidir. Peyğəmbərin ﷺ ümməti ən sonuncu ümmətdir. Ona görə də bu şəriətin hökmləri rahatlıq, yüngüllük və insanın daşıya biləcəyi təqdirlə gəlmişdir.

Rahatlıq çətinliyin tam əksidir. Çətinlik isə məşəqqət və narahatlıqdır.

Məşəqqət iki qismə bölünür:

1. **Adət edilən məşəqqət.** Bu cür məşəqqətlərdə: dini və ya dünyəvi olmasından asılı olmayaraq - çətinlik olur.
2. **Adət edilməyən məşəqqət.** Bu cür məşəqqətlər alimlərdən birinin dediyi kimidir: "Adət edilməyən məşəqqət: müəyyən bir müddət əməl etdikdən sonra hamısı və ya bəzisi tərk edilən məşəqqətlərdir. Bu da həmin əməlin sahibində naqisliyin baş verməsi ilə nəticələnir". Bu cür məşəqqətlər adətdən xaricdir.

Şəriətdə çətinliyin aradan qaldırılması ikinci məşəqqətlə bağlıdır. Bunu təkid edərək alimlərdən biri deyir: "Çətinlik mükəlləfdən (həddi-buluğa yetişmiş adamdan) iki səbəbə görə götürülür:

**Birinci:** yarı yolda dayanmaq və ibadətə nifrət etmək qorxusu.

**İkinci:** bir kəsin boynuna düşən vəzifənin müxtəlifliyi və çoxluğu. Buna misal olaraq: ailəyə və uşaqlara nəzarət, üzləşəcək hər bir çətinlik və s. demək olar. Ola bilər ki, bir insan bəzi işlərlə dərindən məşğul olsun və digər tərəfdən ibadətdən tamamilə yayınsın. Yaxud bir insan iki çətin işi öz öhdəsinə götürüb onu layiqincə yerinə yetirmək istədikdə, bu çətinliyin qarşısında aciz qalıb hər ikisindən əl çəkər".

İslam şəriətinin asan və məşəqqətsiz olması haqda Quran və Sünnədə *(hədislərdə)* bir çox dəlillər gəlmişdir.

**Qurandan dəlillər:** Allah təala buyurur:

﴿ يُرِيدُ ٱللَّهُ بِكُمُ ٱلۡيُسۡرَ وَلَا يُرِيدُ بِكُمُ ٱلۡعُسۡرَ ﴾ (البقرة ١٨٥)

***"Allah sizin üçün ağırlıq deyil, yüngüllük istər" (əl-Bəqərə: 185).***

وقوله تعالى: ﴿ مَا يُرِيدُ ٱللَّهُ لِيَجۡعَلَ عَلَيۡكُم مِّنۡ حَرَجٖ ﴾(المائدة: ٦)

***"Allah sizi çətinliyə salmaq istəməz" (əl-Maidə: 6)***

﴿ وَمَا جَعَلَ عَلَيۡكُمۡ فِي ٱلدِّينِ مِنۡ حَرَجٖۚ ﴾ (الحج ٧٨)

***"O (Öz dini üçün) sizi seçdi və dində sizin üçün heç bir çətinlik yeri qoymadı " (əl-Həcc: 78).***

Bu və digər ayələrdən görünür ki, Allah təala Öz şəriətini rahat və asan etmişdir. Bu, Allahın bizə olan rəhməti və ümmətinə göstərdiyi lütfüdür. O, hər şeyi biləndir. O, insanların müxtəlifliyini, güclü və zəif, sağlam və xəstə, varlı və kasıb olduqlarını biləndir.
Allah təala buyurur:

﴿ أَلَا يَعۡلَمُ مَنۡ خَلَقَ وَهُوَ ٱللَّطِيفُ ٱلۡخَبِيرُ ١٤ ﴾(المُلك:١٤)

***"Məgər yaradan (sizin gizli saxladığınız hər şeyi) bilməzmi?! O, (hər şeyi) incəliyinə qədər biləndir, (hər şeydən) xəbərdardır! " (əl-Mulk: 14).***

Allah, şəriət qanunlarını endirmiş, bütün əmrlərin və qadağaların təməlini qayğıkeşlik, mərhəmət, asanlıq və mülayimlik prinsipləri ilə qurmuşdur.

**Sünnədən dəlillər:**

**1. Peyğəmbər ﷺ buyurub:**

«إن الدين يسر، ولن يشاد الدين أحد إلاّ غلبه، فسددوا وقاربوا وأبشروا» . رواه البخاري في صحيحه.

*"Həqiqətən din asanlıqdır. Kim onu çətinləşdirmək istəyərsə din ona qalib gələr. (İnsanları) Müjdələyin, (onları dinə) yaxınlaşdırın, (şəriət hökmlərini) qoruyun"[1].*

**2. Peyğəmbər ﷺ buyurub:**

«يسّروا ولا تعسّروا وبشّروا ولا تنفّروا» . رواه البخاري في صحيحه.

*"Asanlaşdırın, çətinləşdirməyin. Müjdələyin, ürkütməyin"[2].*

**3. Peyğəmbər ﷺ buyurub:**

«رفع عن أمتي الخطأ والنسيان وما استكرهوا عليه» . رواه ابن ماجة وصححه الألباني في إرواء الغليل.

*"Ümmətimə etdikləri xətaya, unutduqları və məcbur edildikləri işlərə görə günah yoxdur"[3].*

**4. Peyğəmbər ﷺ buyurub:**

«إن الله تعالى يحب أن تؤتى رخصه كما يحب أن تؤتى عزائمه» . رواه الإمام أحمد في مسنده وصححه الألباني في إرواء الغليل.

*"Allah Onun əzimətlərinə (qətiyyətli əmrlərinə) itaət edilməsini sevdiyi kimi, Onun rüxsətlərinə (insana ixtiyar verilmiş əmrlərinə) də əməl etməyi sevir"[4].*

Bu və digər hədislərə baxdıqda görürük ki, şəriətin insana əmr etdiyi əməllərdə heç bir məşəqqət və çətinlik yoxdur. İslam şəriətinin əsası rahatlıq üzərində qurulmuşdur. İmkanı olduqda çətin ibadət və

---

[1] Buxari: 1\ 93\ №39.

[2] Buxari: 10\ 524\ №5124.

[3] İbn Macə: 1\ 659\№2043. Albani Əl-İrva kitabında bu hədisin səhih olduğunu qeyd etmişdir (№82).

[4] Əhməd: Müsnəd kitabı\ 2\№108. Albani Əl-İrva kitabında bu hədisin səhih olduğunu qeyd etmişdir (№564).

itaətlərə baş əyən adam bir vaxt bu əməlləri yerinə yetirməkdə aciz ola bilər. Ona görə də Peyğəmbər ﷺ öz əshabələrinə bacardıqları işi etmələrini tövsiyə edib deyərdi: "***Allah az, lakin davamlı olan işləri daha çox sevər"***. İbrət, Allaha ibadətdə, Onun razı qaldığı əməllərdə və bizə rəhmət və şəfqət olaraq verilmiş Peyğəmbərin ﷺ sünnəsindədir. Allah təala də Öz Peyğəmbərini ﷺ belə vəsf etmiş və buyurmuşdur:

﴿ لَقَدْ جَآءَكُمْ رَسُولٌ مِّنْ أَنفُسِكُمْ عَزِيزٌ عَلَيْهِ مَا عَنِتُّمْ حَرِيصٌ عَلَيْكُم بِٱلْمُؤْمِنِينَ رَءُوفٌ رَّحِيمٌ ﴿١٢٨﴾ ﴾ (التوبة: ١٢٨).

***"(Ey ümmətim!) Sizə özünüzdən bir peyğəmbər gəldi ki, sizin əziyyətə (məşəqqətə) düşməyiniz ona ağır gəlir, o sizdən (sizin iman gətirməyinizdən) ötrü təşnədir, möminlərlə şəfqətli, mərhəmətlidir! " (ət-Tövbə: 128).***

Alimlərdən biri *"Həqiqətən din asanlıqdır"* hədisinin şərhində buyurur: "Bu necə də gözəl və əzəmətli bir hədisdir. O, özündə xeyirli və faydalı nəsihətləri cəm etmişdir. Peyğəmbər ﷺ hədisin əvvəlində bu əzəmətli əsasın təməlini qoymuş və buyurmuşdur: *"Həqiqətən din asanlıqdır*" yəni, din öz əqidə, əxlaq və qaydalarında rahatdır. Onun buyurduğu əməl və əxlaq, ən yaxşı əməl və ən kamil əxlaqdır. Bu deyilənlər həyata keçirilərsə, din, dünya və axirət səadəti gerçəkləşər, əks halda isə itirilər. Bu din –Allaha şükürlər olsun- rahat və asandır. Hər bir insan bu dinə riayət etməyin rahat olduğunun şahididir. Bu dinin əqidəsi doğru və sadə olduğundan sağlam ağıl və saf fitrət onu qəbul edir. Onun buyurduğu fərzlər çox asan, digər əmrləri isə ondan da rahatdır... Kim məxluqatın rəhbəri, ən kamil insan Məhəmmədi ﷺ özünə nümunə götürmək istəyirsə bu heç də çətin deyil. Belə etmək onun dünya işlərinə maneçilik etmir. Əksinə, o belə etdikdə bütün haqları, Allahın, öz nəfsinin,

ailəsinin və dostlarının haqqını, ümumiyyətlə hər bir adamın haqqını rahat və mülayimliklə ödəyə bilər".

İslam şəriətində böyük və mühüm yer tutan bu qaydaya əsaslanaraq alimlər "Asanlaşdırmaq və çətinliyi aradan qaldırmaq" haqda ümumi qaydalar qoymuşlar.

1. Qayda: Məşəqqət rahatlığı cəlb edir *(insana baş verə biləcək hər hansı çətinliyə qarşı asanlaşdırıcı hökmlər, çıxış yolları verilir)*.
2. Qayda: Bir məsələ genişləndikdə daralır, daraldıqda isə genişlənir.
3. Qayda: Zərər aparılmalıdır (Hər hansı işdə zərər olarsa şəriət onu qadağa edir).
4. Qayda: Zərər özü mislində bir zərər ilə aparılmamalıdır.
5. Qayda: Zərəri çox olan bir iş, zərəri az olan işlə aparılır.
6. Qayda: Ümumi və ya xüsusi ehtiyac zərurət mərtəbəsinə endirilir.
7. Qayda: Zərurət, qadağaları mübah edir.
8. Qayda: Zərurət öz miqdarında ölçülür.
9. Qayda: Rahat əməlin hökmü çətin əməl ilə qüvvədən düşmür.

Şəriətdə olan rahatlıq məqamlarını belə bir kitabda sayıb qurtarmaq mümkün deyil.

# Birinci fəsil

## İmanın əsasları baxımından İslamın gözəllikləri:

حدّد الرّسول ﷺ أركان الإيمان بستّة أمور هي: الإيمان بالله، وملائكته، وكتبه، ورسله، واليوم الآخر، والإيمان بالقدر خيره وشرّه. جاء ذلك في حديث جبريل الطّويل، رواه مسلم.

***Peyğəmbər ﷺ imanın altı əsası (ərkanı) olduğunu qeyd etmişdir, onlar: Allaha, Onun mələklərinə, kitablarına, peyğəmbərlərinə, axirət gününə, qədərin xeyir və şərinə iman gətirməkdir[1].***

Bu altı əsas İslam əqidəsinin prinsipləridir. Sözlər, əməllər, əxlaq və gözəl işlər bu ərkanlar üzərində qurulur. İmanın əsaslarında olan gözəlliklər İslamın beş prinsipinin[2] təməlidir. Bu baxımdan İslam əqidəsinin insan həyatında əhəmiyyəti və zəruriliyi üzə çıxır. İndi isə imanın hər bir əsasının mühüm gözəllikləri ilə tanış olaq:

**Birinci əsas; Allaha iman:**

Bu əsas dini prinsiplərin ən əhəmiyyətli vacibatıdır. Bu iman özündə Allahın rübubiyyətinə, uluhiyyətinə, ad və sifətlərinə imanı əhatə etdirir.

**Birinci: Allahın rübubiyyətinə iman:** yəni, Allah xəlq etməkdə, mülkündə, kainatı idarə etməkdə təkdir və bu işlərdə Onun heç bir şəriki yoxdur. Allah təala buyurur:

---

[1] Bu Cəbrailin uzun hədisində qeyd edilmişdir. Müslim 1\36-38\ №8.

[2] İslamın beş prinsipi aşağıdakılardır: Lə iləhə illəllah Muhəmmədən rəsuləllah kəlməsini demək, namaz qılmaq, zəkat vermək, oruc tutmaq, imkan olduqda həcc etmək.

﴿ ٱلْحَمْدُ لِلَّهِ رَبِّ ٱلْعَٰلَمِينَ ﴾ (الفاتحة:١).

***"Həmd (şükür və tərif) olsun Allaha! Aləmlərin Rəbbinə!" (əl-Fatihə: 1).***

Digər bir ayədə Allah təala buyurur:

﴿ إِنَّ رَبَّكُمُ ٱللَّهُ ٱلَّذِى خَلَقَ ٱلسَّمَٰوَٰتِ وَٱلْأَرْضَ فِى سِتَّةِ أَيَّامٍ ثُمَّ ٱسْتَوَىٰ عَلَى ٱلْعَرْشِ يُغْشِى ٱلَّيْلَ ٱلنَّهَارَ يَطْلُبُهُۥ حَثِيثًا وَٱلشَّمْسَ وَٱلْقَمَرَ وَٱلنُّجُومَ مُسَخَّرَٰتٍۭ بِأَمْرِهِۦٓ ۗ أَلَا لَهُ ٱلْخَلْقُ وَٱلْأَمْرُ ۗ تَبَارَكَ ٱللَّهُ رَبُّ ٱلْعَٰلَمِينَ ﴾ (الأعراف:٥٤)

***"Həqiqətən, Rəbbiniz göyləri və yeri altı gündə xəlq etdikdən sonra ərşə yüksəldi, (bir-birini) sürətlə təqib edən gündüzü gecə ilə (gecəni də gündüzlə) örtüb bürüyən, günəşi, ayı və ulduzları əmrinə boyun əymiş halda yaradan Allahdır. Bilin ki, yaratmaq da, əmr etmək də Ona məxsusdur. Aləmlərin Rəbbi olan Allah nə qədər ucadır (nə qədər böyükdür)!" (əl-Əraf: 54).***

Allahın rübubiyyətində, imanın çox gözəllikləri vardır. Bunlardan:

1. İslam fitrət dinidir və o heç bir halda fitrətə zidd deyildir. Fitrət: insanın əsli xilqəti deməkdir. Allah təala buyurur:

﴿ فَأَقِمْ وَجْهَكَ لِلدِّينِ حَنِيفًا ۚ فِطْرَتَ ٱللَّهِ ٱلَّتِى فَطَرَ ٱلنَّاسَ عَلَيْهَا ۚ لَا تَبْدِيلَ لِخَلْقِ ٱللَّهِ ۚ ذَٰلِكَ ٱلدِّينُ ٱلْقَيِّمُ وَلَٰكِنَّ أَكْثَرَ ٱلنَّاسِ لَا يَعْلَمُونَ ﴾ (الرّوم:٣٠).

***"(Ya Rəsulum! Ümmətinlə birlikdə) batildən haqqa tapınaraq (pak bir müvəhhid, xalis təkallahlı kimi) üzünü Allahın fitri olaraq***

***insanlara verdiyi dinə (İslama) tərəf tut. Allahın dinini (Onun yaratdığı tövhid dini olan İslamı) heç vəchlə dəyişdirmək olmaz. Doğru din budur, lakin insanların əksəriyyəti (haqq dininin İslam olduğunu) bilməz. (Allah bütün insanları xilqətcə müsəlman – təkallahlı yaratmışdır, lakin ata-anaları onları başqa dinlərə sövq etmiş, yaxud onlar yaşa dolduqda öz nadanlıqları üzündən batil dinlərə - bütpərəstliyə uymuşlar)." (ər-Rum: 30).***

Allah Öz bəndələrini yaradarkən Onu və Onun rübubiyyətini tanımalarını onların fitrətinə məxsus etmişdir. İslam dini bu fitrəti, Allahın varlığını, rübubiyyətini, uluhiyyətində, gözəl ad və yüksək sifətlərində təkliyini dəstəkləmək, daha da möhkəmlətmək üçün gəlmişdir.

Bəndə iman gətirməlidir ki, Allah onu yaradıb, həyatın üsullarını və yer üzündə yaşamağı onun üçün rahatlaşdırıb, bu kainatı insanın yaradılışına uyğun, orada yaşamasını rahat, ehtiyacı olan hər şeyi müyəssər etmişdir. Allah taala buyurur:

﴿ أَلَمْ تَرَوْاْ أَنَّ ٱللَّهَ سَخَّرَ لَكُم مَّا فِى ٱلسَّمَـٰوَٰتِ وَمَا فِى ٱلْأَرْضِ وَأَسْبَغَ عَلَيْكُمْ نِعَمَهُۥ ظَـٰهِرَةً وَبَاطِنَةً ﴾ (لقمان:٢٠).

***"(Ey İnsanlar!) Məgər Allahın göylərdə və yerdə olanları (günəşi, ayı, ulduzları və buludları; meyvələri, bitkiləri, dənizləri, çayları və gölləri) sizə ram etdiyini (sizin istifadənizə verdiyini), aşkar (görmə, eşitmə, sağlamlıq) və gizli (əql, şüur, fəhm, elm və i. a.) nemətləri sizə bolluca ehsan etdiyini görmürsünüzmü? ..." (Loğman: 20).***

Bu nemətlər Allahın bəndəyə olan böyük lütfünü ona dərk etdirməyə əsas verir. Nəticədə bəndə Allahın onun üzərindəki minnətini etiraf edir. Bunu bilməklə bəndə, ona nemət verən Allaha şükür etməyə və asilikdən çəkinməyə həvəslənir. Allahın rübubiyyəti haqda fikirləşmək insanı Allahın varlığı haqda düşünməyə, Onu tam kamillik ilə tanımağa aparır. Bəndə Allahdan

başqa rəbb olmadığını bildiyi kimi, Ondan qeyrisinin ibadətə layiq haqq məbud olmadığını da dərk edir. Allahın yaratdığı məxluqat, çoxluğu və müxtəlifliyi ilə açıq-aydın Allahın əzəmətini bildirir və Onun tövhidinə *(təkliyinə)* çağırır. Allah təala buyurur:

﴿ إِنَّ فِي خَلْقِ ٱلسَّمَٰوَٰتِ وَٱلْأَرْضِ وَٱخْتِلَٰفِ ٱلَّيْلِ وَٱلنَّهَارِ لَءَايَٰتٍ لِّأُو۟لِى ٱلْأَلْبَٰبِ ﴿١٩٠﴾ ٱلَّذِينَ يَذْكُرُونَ ٱللَّهَ قِيَٰمًا وَقُعُودًا وَعَلَىٰ جُنُوبِهِمْ وَيَتَفَكَّرُونَ فِي خَلْقِ ٱلسَّمَٰوَٰتِ وَٱلْأَرْضِ رَبَّنَا مَا خَلَقْتَ هَٰذَا بَٰطِلًا سُبْحَٰنَكَ فَقِنَا عَذَابَ ٱلنَّارِ ﴿١٩١﴾ ﴾ (آل عمران: ١٩٠-١٩١)

***"Həqiqətən, göylərin və yerin yaradılmasında, gecə ilə gündüzün bir-birini əvəz etməsində (bir-birinin ardınca gəlib-getməsində) ağıl sahibləri üçün (Allahın varlığını, qüdrətini, kamalını və əzəmətini sübut edən açıq) dəlillər vardır. O kəslər ki, ayaq üstə olanda da, oturanda da, uzananda da Allahı xatırlayarlar, göylərin və yerin yaradılması haqqında düşünərlər (və deyərlər): "Ey Rəbbimiz! Sən bunları boş yerə yaratmamısan! Sən pak və müqəddəssən! Bizi cəhənnəm odunun əzabından (Özün) qoru!" (Ali İmran: 190-191).***

2. İnsan Allahın rübubiyyətinə iman bəsləməsi nəticəsində Allahın hər bir şeyin rəbbi və sahibi olduğunu dərk etməlidir. Bilməlidir ki, Allah Öz məxluqatına möhtac deyil, O qüdrətli və varlıdır. Ondan başqa bütün məxluqlar, Rəbbinə və Xaliqinə möhtacdırlar. Bu əqidə insana öz nəfsini tanıtdırır və insan dərk edir ki, o, zəif və möhtac olandır. Belə olduqda insan həddini aşmaqdan, tüğyandan və yer üzündə təkəbbürlükdən uzaq durmalıdır.

Allahın rübubiyyətinə iman nəticəsində Ona qarşı xalis və sidq ürəklə məhəbbət yaranır. Çünki Allah insanı xəlq etmiş, onun

tərbiyələndirmiş, islah etmiş, ruzi və sağlamlıq vermiş, ümumiyyətlə din və dünyasını islah edən hər bir xeyri ona bəxş etmişdir.

Allahın rübubiyyət tövhidini iqrar etmək, anlamaq və haqqında düşünmək insanı öz Rəbbini ucaltmağa, sevməyə və Ondan qorxmağa yönəldir. Nəticədə bəndə Allahın ona etdiyi əmrləri yerinə yetirir və Onun Hənif *(İslam)* dininə əməl edənlərdən olur. Bəndə, rübubiyyət tövhidi vasitəsi ilə Allaha itaətin və Ona asi olmamağın vacibliyini dərk edir və bunun Allah haqqı olduğunu bilir. O, Allaha boyun əyməli, Ona ibadət və itaətdə təkəbbürlük etməməlidir. Hətta insan bilməlidir ki, onun səadəti və qələbəsi yalnız Allaha itaət etməkdə və Onun dininə bağlanmaqdadır. İnsanın hər bir işini və onun həyatını ona müyəssər edən Allahdır, bütün bunlar Onun əlindədir.

Rübubiyyət tövhidinə iman gətirən insan Allahdan başqasından xeyir və imdad istəməz. Çünki bütün mənfəət və zərər Onun əlindədir. Onun əta etdiyinə heç kəs mane ola bilməz, Onun qadağan etdiyini isə heç kəs bağışlaya bilməz. Allah təala buyurur:

﴿ قُلِ ٱللَّهُمَّ مَٰلِكَ ٱلْمُلْكِ تُؤْتِي ٱلْمُلْكَ مَن تَشَآءُ وَتَنزِعُ ٱلْمُلْكَ مِمَّن تَشَآءُ وَتُعِزُّ مَن تَشَآءُ وَتُذِلُّ مَن تَشَآءُ ۖ بِيَدِكَ ٱلْخَيْرُ ۖ إِنَّكَ عَلَىٰ كُلِّ شَيْءٍ قَدِيرٌ ﴿٢٦﴾ ﴾ (آل عمران:٢٦)

***"(Ya Rəsulum!) De: "Ey mülkün sahibi olan Allah! Sən mülkü istədiyin şəxsə verər, istədiyin şəxsi yüksəldər və istədiyin şəxsi də alçaldarsan. Xeyir yalnız Sənin əlindədir. Həqiqətən, Sən hər şeyə qadirsən!" (Ali İmran: 26).***

3. Kainat və onun sirləri haqda verilən suallara qaneedici cavablar vermək; Çox vaxt insan kainatda baş verən hadisələri izah etməkdə acizlik göstərir. Əksər hallarda kainatda baş verənlərin önündə heyrət içərisində dayanır. O, Allahın rübubiyyət tövhidinə iman

gətirdikdə isə hər şey onun üçün rahat olur və Allahın, hər şeyi əhatə edən qüdrətinə iman qapısı açılır. Allah təala buyurur:

﴿ وَيَسۡـَٔلُونَكَ عَنِ ٱلرُّوحِۖ قُلِ ٱلرُّوحُ مِنۡ أَمۡرِ رَبِّي وَمَآ أُوتِيتُم مِّنَ ٱلۡعِلۡمِ إِلَّا قَلِيلٗا ﴿٨٥﴾ ﴾. (الإسراء:٨٥)

*"(Ya Rəsulum!) Səndən ruh (ruhun mahiyyəti və keyfiyyəti) haqqında soruşarlar. De: "Ruh Rəbbimin əmrindədir. (Allahın əmri ilə yaradılmışdır). Sizə (bu barədə) yalnız cüzi (az) bir bilik verilmişdir!" (əl-İsra: 85).*

**İkinci:** Allahın ad və sifətlərinə iman: Bu, Allahın və Onun Elçisinin ﷺ təsdiq etdiyi ən gözəl adların və yüksək sifətlərin Allaha məxsus olduğuna iman gətirməkdir. Allahın sifətlərində və işlərində şəriki ola bilməz. Allahın ad və sifətlərinə iman, Ona imanın ən mühüm hissəsidir. Ona görə də bu ad və sifətləri yalnız Quran və Peyğəmbərin ﷺ Sünnəsində verilmiş tərzdə qəbul etməliyik. Bu məsələdə təvil[1] edərək ad və sifətləri olduğu gözəllikdən, kamillikdən çıxararaq zahiri mənasından digər mənaya dəyişmək olmaz. Çünki Allah Özünü bu ad və sifətləri vasitəsilə bəndələrinə tanıtmış, ad və sifətlərə iman gətirməyin ibadət olduğunu bildirmiş və bunlarla Ona həmdi-səna və dua edilməsini buyurmuşdur. Allah təala buyurur:

﴿ وَلِلَّهِ ٱلۡأَسۡمَآءُ ٱلۡحُسۡنَىٰ فَٱدۡعُوهُ بِهَاۖ وَذَرُواْ ٱلَّذِينَ يُلۡحِدُونَ فِيٓ أَسۡمَـٰٓئِهِۦۚ سَيُجۡزَوۡنَ مَا كَانُواْ يَعۡمَلُونَ ﴿١٨٠﴾ ﴾ (الأعراف:١٨٠)

*"Ən gözəl adlar (əsmayi-hüsna) Allahındır. Onu bu adlarla çağırıb dua edin. Onun adları barəsində küfr edənləri (əziz sözündən Uzza, Allah sözündən əl-Lat, mənnan sözündən Mənat kimi adlar*

[1] Təvil: sözü yozmaqla mənasını dəyişmək.

***düzəldib haqq yoldan azanları) tərk edin. Onlar etdikləri əməllərin cəzasını alacaqlar!" (əl-Əraf: 180).***

Allahın ad və sifətlərinin sayı-hesabı olmadığından, ona iman gətirmək gözəlliklərinin də sayı-hesabı yoxdur. Burada, bu gözəlliklərin təkcə bəzilərinə işarə edəcəyik, onlar:

1. Allahla həqiqi tanışlıq. Allah təala qeybdir. Onun sifətlərinin təfsilatını təkcə ağılla bilmək mümkün deyildir. Ona görə də Allah bu sifətləri Quran və Sünnədə bizə çatdırmışdır ki, bəndələri Onu düzgün, cəlalətinə və müqəddəsliyinə uyğun olaraq tanısınlar.

Ad və sifətlərinə iman gətirməklə Allahla doğru tanışlığı əldə etmək üçün bu iman Peyğəmbərin ﷺ, onun səhabələrinin (Allah onlardan razı olsun!) və Sünnə alimlərinin imanı kimi olmalıdır. Bu iman - ad və sifətləri digər məxluqatın ad və sifətlərinə bənzətmədən və necəliyini araşdırmadan təsdiqləmək; təvil və inkar etmədən onları təsdiqləməkdən ibarətdir. Kim bu doğru yolla Allahın ad və sifətlərini təsdiq edərək iman gətirərsə, Allahı daha doğru və daha yaxşı tanıyar.

2. Bu iman nəticəsində mömin bəndənin qəlbində Allaha olan sevgi, ehtiram, qorxu, ümid və istək bərqərar olur. Bu, Allaha imanın ən gözəl və ən əhəmiyyətli nöqtəsidir. Bu xüsusiyyətlər başqalarına deyil, yalnız Allaha məxsusdur. Çünki Allah başqalarının malik olmadıqları sifətlərə malikdir, məsələn: rəhmət, əzəmət, hakim, qalib, yaxşılıq, lütfkarlıq və hər şeyi əhatə edən və s. olması. Kim Allaha, Onun buyurduğu ad və sifətlərə uyğun olaraq iman gətirərsə deyilən mənalar onun qəlbində imanının dərəcəsinə uyğun yer tapar. O, Allahdan qorxar, çəkinər, Onu sevər, hər şeydən uca tutar, Ona rəğbət və ümid bəsləyər və etdiyi bu əməlləri yalnız Allah üçün edər.

3. Allahı alçaltmaqdan və nalayiq vasitələrlə təsvir etməkdən uzaq olmaq: Allahın gözəl ad və ali sifətləri Onun hərtərəfli tam kamilliklə vəsf olunduğunu əks etdirir. O, bütün naqislik və eyiblərdən

təmamilə uzaqdır. Kim ad və sifətlərə Allah təaləyə layiq qaydada iman gətirərsə, Ona nalayiq şəkildə vəsf verməkdən uzaq olar. Kim ad və sifətlərdə boşluğa yol verərsə, bu boşluğun əvəzi qədər Allahı naqis ad və sifətlərlə vəsf etmiş olar.

Ona görə də yəhudi və xaçpərəstlərin əqidələrində gördüyümüz Allaha verilən nalayiq vəsflərdən: məsələn, Allahın Özünə oğul götürməsi, Allahın ağlaması, kədərlənməsi, kasıb olması və s.- Allahı uca, pak tutmalıyıq. Hətta müsəlmanların bəzi zəlalətə düşmüş firqələrində də Allahın Ona layiq olmayan sifətlərlə vəsf edildiyini görürük. Allah, belə sifətlərdən pak və ucadır. Məsələn, Allahı bəndələrinə bənzətmək, dolayı yollarla ad və sifətləri inkar etmək, şirk və s. Bütün bunlar, Allahın Özünü Quranda və Peyğəmbərinin ﷺ dili ilə vəsf etdiyinə ziddir.

4. Gizlidə və aşkarda Allahın buyurduqlarına diqqətli olmaq, söz və əməldə ixlaslı olmaq *(yalnız Allah üçün etmək)* və etdiyi əmrlər, qadağalar, qəza-qədərdə Ona qarşı yaxşı rəydə olmaq. Mənfəətə nail olmaq və müsibəti dəf etmək üçün sidq ürəklə Ona təvəkkül etmək. Ad və sifətlərin mənasında olan qəlbi, əməli və sözlü ibadətlərlə Allaha doğru ibadət etmək.

5. Allahın Özünü vəsf etdiyi və sevdiyi gözəl sifətlərə: rəhmət, sadiqlik, adillik, mülayimlik, şəfqət, səbr, yaxşılıq və s. - əsasən, bəndənin özünə layiq tərzdə bu sifətlərə yiyələnməsi: Bilmək lazımdır ki, Allahın bu sifətlərə malik olması ilə, bəndənin bu sifətlərə yiyələnməsi arasında fərq vardır. Allahın ad, sifət, fel və zatında Onun tayı-bərabəri yoxdur. Bir hədisdə Peyğəmbər ﷺ buyurur:

«إن الله جميل يحبّ الجمال»، رواه مسلم.

***"Allah gözəldir və gözəlliyi sevir"[1].***

---

[1] Müslim: 1\93\ № 91.

***Həmçinin Peyğəmbər ﷺ buyurmuşdur:***

«إنّ الله رفيق يحبّ الرّفق» رواه مسلم.

***"Allah mülayimdir və mülayimliyi sevir"[1].***

Bu sifətlərə yiyələnməyin əvəzində bəzi sifətlər vardır ki, bəndənin o sifətlərə yiyələnməsi ona yaraşmaz. Bu sifətlərə sahib olmaq Allaha mütilik etməyə *(ubudiyyətə)* ziddir. Məs, təkəbbürlük, yüksəklik, nəfsini müqəddəs görmək və s. Bu kimi sifətlər yalnız aləmlərin rəbbi olan Allaha məxsusdur və bəndənin bu sifətlərə nail olmağa haqqı yoxdur. Çünki Ondan başqa ibadətə layiq haqq məbud yoxdur, cəlalət, kamillik və kibriya *(təkəbbürlük)* sifətləri yalnız Ona məxsusdur.

6. Allaha, Onun bütün gözəl ad və ali sifətləri ilə ibadət etmək: Bilmək lazımdır ki, Allahın hər bir ad və sifətinin özünə məxsus mənası vardır. Bəndənin də bu mənalara bağlılığı və asılılığı mövcuddur. Buna misal olaraq:

a) Əs-Səmii, əl-Bəsir (eşidən və görən). Bəndə bu iki ad və sifətə iman gətirir. O bilir ki, Allah eşidir və görür. Bəndənin, Allahın onu gizlidə və aşkarda görüb eşitməsini bilməsi, dediyi sözlərə və etdiyi əməllərə, hər vaxt və hər yerdə diqqətlə yanaşmasına səbəb olur.

b) Ər-Rəhman və ər-Rəhim (Mərhəmətli və rəhimli). Bəndə bu iki ada və bir sifətə (rəhmət sifəti) iman gətirir. O, bilir ki, Allahın rəhməti genişdir. Allah Öz bəndələrinə rəhm edəndir. Bunu bilən bəndə, Allaha böyük ümid bəsləyir. Naümid yaşamır və Allahın rəhmətindən əlini üzmür.

c) Əl-Əlim (Hər şeyi bilən). Bəndə bu ad və sifətə iman gətirir. O, dərk edir ki, Allah hər şeyi bilәndir. Elm Allahın əzəmətli zatı ilə bağlı sifətlərindəndir. Onun nəyisə bilməməyi mümkün deyildir. Ümumiyyətlə Allah hər cür cahillikdən *(bilməməzlikdən)* pakdır,

---

[1] Müslim: № 2593.

müqəddəsdir. Elm *(bilmək)* sifətinə iman gətirən adam bütün əməllərini xalis Allah üçün etməli, hər bir vəziyyətində ondan qorxmalı və təqvalı olmalıdır. Çünki Allah, onun gizlində və aşkarda, zahirdə və batində etdiklərinin hamısını bilir və bəndənin heç bir əməli Allahdan gizli qala bilməz.

**Üçüncü:** Allahın uluhiyyətinə iman: "O, yalnız Allahın ibadətə layiq haqq məbud olduğunu, Onun bu ibadətdə heç bir şəriki və ortağı olmadığına etiqad etməkdir". Bütün ibadətlərin yalnız Allaha məxsusluğunu bilmək və heç bir ibadəti, kimliyindən asılı olmayaraq, Allahdan başqasına etmək olmaz. Allah taala buyurur:

﴿ ذَٰلِكَ بِأَنَّ ٱللَّهَ هُوَ ٱلۡحَقُّ وَأَنَّ مَا يَدۡعُونَ مِن دُونِهِ ٱلۡبَٰطِلُ وَأَنَّ ٱللَّهَ هُوَ ٱلۡعَلِيُّ ٱلۡكَبِيرُ ٣٠ ﴾ (لقمان:٣٠).

***"Bu (deyilənlər) ona görədir ki, Allah – haqq, (müşriklərin) Ondan qeyrisinə ibadət etdikləri isə batildir. Həqiqətən, Allah (hər şeydən) ucadır, (hər şeydən) böyükdür!" (Loğman: 30).***

Elə "Lə iləhə illəllah" kəlməsinin mənası budur. Allah bütün peyğəmbərləri və kitabları bu kəlmə ilə göndərmiş, insanları və cinləri yaratmışdır. Allah taala buyurur:

﴿ وَمَآ أَرۡسَلۡنَا مِن قَبۡلِكَ مِن رَّسُولٍ إِلَّا نُوحِيٓ إِلَيۡهِ أَنَّهُۥ لَآ إِلَٰهَ إِلَّآ أَنَا۠ فَٱعۡبُدُونِ ٢٥ ﴾ (الأنبياء:٢٥)

***"(Ya Rəsulum!) Səndən əvvəl elə bir peyğəmbər göndərmədik ki, ona: "Məndən başqa ibadətə layiq heç bir haqq tanrı yoxdur. Buna görə də yalnız Mənə ibadət edin!" – deyə vəhy etməyək." (əl-Ənbiya: 25).***

﴿ وَمَا خَلَقۡتُ ٱلۡجِنَّ وَٱلۡإِنسَ إِلَّا لِيَعۡبُدُونِ ٥٦ ﴾ (الذاريات:٥٦)

***" Mən cinləri və insanları yalnız Mənə ibadət etmək üçün yaratdım!" (əz-Zəriyat: 56).***

Allahın uluhiyyətinə iman, Onun rübubiyyətinə, ad və sifətlrinə imanı özündə əks etdirir. Çünki Allah aləmlərin Rəbbi, Onun şəriki və bənzəri olmayan kamil sifətlərlə vəsf olunduğundan, ibadət də yalnız Ona edilməlidir. Burada Allahın uluhiyyətinə imanın öz gözəlliyi aşkarlanır. Çünki Allahın uluhiyyətinə iman Allaha imanın bütün gözəlliklərini cəm etmişdir. Belə gözəlliklərdən:

1. Ilahlığın heç bir şəriki olmayan Uca Allaha məxsus olduğunu təsdiqləməkdir. Çünki Ilahi sifətlər yalnız Ona məxsusdur və bu ilahlıq yalnız ona layiqdir. Məxluq ilahi sifətlərə sahib olmadığından, bu ilahlığı hər bir məxluqda *(inkar)* nəfy etmək lazımdır. Allahdan başqa heç bir məbudun bu ilahlıqda haqqı yoxdur.

Ibadətə layiq Ilah vahid (tək) olmalıdır. Çünki yer və göyün iki yaradanı və ya iki rəbbi olmadığı kimi, ilahların çoxluğu da mümkün deyildir. Allah taala buyurur:

﴿ لَوْ كَانَ فِيهِمَآ ءَالِهَةٌ إِلَّا ٱللَّهُ لَفَسَدَتَا ۚ فَسُبْحَـٰنَ ٱللَّهِ رَبِّ ٱلْعَرْشِ عَمَّا يَصِفُونَ ﴿٢٢﴾ ﴾ (الأنبياء:٢٢)

***"Əgər (yerdə və göydə) Allahdan başqa tanrılar olsa idi, onların ikisi də (müvazinətdən çıxıb) fəsada uğrayardı. Ərşin sahibi olan Allah (müşriklərin Ona) aid etdikləri sifətlərdən tamamilə uzaqdır!" (əl-Ənbiya: 22).***

İslamın ən əzəmətli qanunauyğunluqlarından biri, ilahlığın yalnız Uca Allaha məxsus olmasıdır. Bütün eyiblərdən və nöqsanlardan pak olan Allah kamildir, cəlalətlidir, camallıdır. O, hərtərəfli və bir sözlə təkdir. Allah taala buyurur:

﴿ قُلۡ هُوَ ٱللَّهُ أَحَدٌ ۝١ ٱللَّهُ ٱلصَّمَدُ ۝٢ لَمۡ يَلِدۡ وَلَمۡ يُولَدۡ ۝٣ وَلَمۡ يَكُن لَّهُۥ كُفُوًا أَحَدُۢ ۝٤ ﴾ (الإخلاص:١-٤)

***"(Ya Peyğəmbər! Allahın zatı və sifətləri haqqında səndən soruşan müşriklərə) de: "(Mənim Rəbbim olan) O Allah birdir (heç bir şəriki yoxdur); Allah (heç kəsə, heç nəyə) möhtac deyildir! (Hamı Ona möhtacdır; O, əzəlidir, əbədidir!) O, nə doğmuş, nə də doğulmuşdur! (Allah Özünə heç bir övlad götürməmişdir!) Onun heç bir tayı-bərabəri (bənzəri) də yoxdur!"" (əl-İxlas: 1-4).***

Allah taala buyurur:

﴿ وَقُلِ ٱلۡحَمۡدُ لِلَّهِ ٱلَّذِي لَمۡ يَتَّخِذۡ وَلَدٗا وَلَمۡ يَكُن لَّهُۥ شَرِيكٞ فِي ٱلۡمُلۡكِ وَلَمۡ يَكُن لَّهُۥ وَلِيّٞ مِّنَ ٱلذُّلِّۖ وَكَبِّرۡهُ تَكۡبِيرَۢا ۝١١١ ﴾ (الإسراء:١١١)

**"Və de: "Özünə heç bir övlad götürməyən, mülkündə (səltənətində) heç bir şəriki olmayan, zəif (aciz) olmadığı üçün (Ona kömək edəcək) heç bir dosta (hamiyə də) ehtiyacı olmayan Allaha həmd olsun!" Və Allahı (layiqincə) uca tut! (Allahı bütün eyib və nöqsanlardan uzaq bilib təqdis et, şəninə təriflər de!)" (əl-İsra: 111).**

İslamın ən əsas vəzifələrindən biri ibadətin yalnız Allaha xas edilməsinə və Allahdan başqa bütün məbudların batil olmasına dəvətdir. Allah taala buyurur:

﴿ وَمَآ أُمِرُوٓاْ إِلَّا لِيَعۡبُدُواْ ٱللَّهَ مُخۡلِصِينَ لَهُ ٱلدِّينَ حُنَفَآءَ وَيُقِيمُواْ ٱلصَّلَوٰةَ وَيُؤۡتُواْ ٱلزَّكَوٰةَۚ وَذَٰلِكَ دِينُ ٱلۡقَيِّمَةِ ۝٥ ﴾ (البيّنة:٥)

**"Halbuki onlara əmr edilmişdir ki, Allaha – dini yalnız Ona məxsus edərək, batildən haqqa (İslama) dönərək – ibadət etsinlər,**

**namaz qılıb zəkat versinlər. Doğru-düzgün din budur!" (əl-Bəyyinə: 5).**

Bir hədisdə isə Peyğəmbər ﷺ belə buyurur:

«أمرت أن أقاتل النّاس حتّى يشهدوا أن لا إله إلاّ الله وأنّ محمّداً رسول الله، ويقيموا الصّلاة، ويؤتوا الزّكاة. فإذا فعلوا ذلك عصموا منّي دماءهم وأموالهم إلاّ بحقّ الإسلام وحسابهم على الله». رواه البخاري في صحيحه ومسلم.

***"İnsanlar lə ilahə illəllah Məhəmmədən rəsuləllah kəlməsinə şəhadət verməyib, namaz qılmayıb, zəkat verməyincəyə qədər onlara qarşı döyüşmək mənə əmr olundu. Əgər onlar bunu edərlərsə, yalnız İslamın haqqı müstəsna olmaqla, canlarını və mallarını qorumuş olarlar. Onların haqq-hesabları isə Allah dərgahındadır"*[1].**

2. Allahın haqqı ilə məxluqun haqqını fərqləndirmək. Hər kəsin özünə layiq haqqını vermək. Bu, həyatı gerçəkləşdirən həqiqi ədalətdir. Bəndə yalnız bununla cəhənnəm əzabından qurtula bilər.

Allahın haqqı - yalnız Ona ibadət etmək və Onu vahid tutmaqdır. Bəndənin haqqı isə Rəbbinə və Xaliqinə itaətkar olması və Allahdan başqa bütün məbudların batil olmasını bilməsi və onlardan uzaq olmasıdır. Allah taala buyurur:

﴿ يَـٰٓأَيُّهَا ٱلنَّاسُ ٱعْبُدُوا۟ رَبَّكُمُ ٱلَّذِى خَلَقَكُمْ وَٱلَّذِينَ مِن قَبْلِكُمْ لَعَلَّكُمْ تَتَّقُونَ ﴿٢١﴾ ﴾ (البقرة: ٢١)

**"Ey insanlar! Sizi və sizdən əvvəlkiləri yaratmış Rəbbinizə ibadət edin ki, müttəqi olasınız! (Allahdan qorxub pis əməllərdən**

[1] Buxari: 1\ 75\ № 25. Müslim: 1\53\ № 22.

**çəkinəsiniz!)" (əl-Bəqərə: 21).** Muaz Ibn Cəbəl ﵁ deyir ki, Peyğəmbər ﷺ buyurub:

قال رسول الله ﷺ: «يا معاذ، أتدري ما حقّ الله على عباده وما حقّ العباد على الله؟ قلت: الله ورسوله أعلم. قال: فإنّ حقّ الله على العباد أن يعبدوه ولا يشركوا به شيئاً، وحقّ العباد على الله أن لا يعذّب من لا يشرك به شيئاً» رواه البخاري في صحيحه ومسلم.

***"Ey Muaz! Bilirsənmi Allahın bəndələrində, bəndələrin də Allahda olan haqqı nədir? Mən dedim: Allah və Rəsulu daha yaxşı bilər! Peyğəmbər ﷺ buyurdu: Allahın bəndələrində haqqı, bəndələrin Ona ibadət etmələri və bu ibadətdə heç bir şeyi Ona şərik qoşmamalarıdır. Bəndələrin Allahda olan haqları isə Ona heç bir şeyi şərik qoşmayan adama əzab verməməkdir"[1].***

3. Bəndənin yalnız Allahdan istəməsi: Çünki bəndə özünə fayda verəcək şeyləri istəməkdə və zərər verəcək hər bir şeyi dəf etməkdə köməyə möhtacdır.

Bəndə yalnız Allahdan istəməlidir. Çünki bütün var-dövlət, mal-mülk və qüdrət Onun əlindədir. Xeyri cəlb etmək və şəri dəf etməyə yalniz O, qadirdir. Hər şey Onun istəyi və yaratması ilə olur. Allahdan başqa istənilən hər bir məbud batildir. Çünki istənilən məbud özü məxluqdur və o heç bir şeyə sahib deyildir. Belə olduğu halda o necə başqasına zərər və ya fayda verə bilər. Ona görə də bəndənin Allahdan başqasına üz tutması və istəməsi, bəndəyə yalnız zərər verər və onun arzuları puç olar. Bu haqda Allah taala buyurur:

[1] Buxari: 6\58\ № 6856. Müslim: 1\58\ № 30.

﴿ ذَٰلِكُمُ ٱللَّهُ رَبُّكُمْ لَهُ ٱلْمُلْكُ ۚ وَٱلَّذِينَ تَدْعُونَ مِن دُونِهِۦ مَا يَمْلِكُونَ مِن قِطْمِيرٍ ﴿١٣﴾ إِن تَدْعُوهُمْ لَا يَسْمَعُوا۟ دُعَآءَكُمْ وَلَوْ سَمِعُوا۟ مَا ٱسْتَجَابُوا۟ لَكُمْ ۖ وَيَوْمَ ٱلْقِيَٰمَةِ يَكْفُرُونَ بِشِرْكِكُمْ ۚ وَلَا يُنَبِّئُكَ مِثْلُ خَبِيرٍ ﴿١٤﴾ ﴾ (فاطر:١٣-١٤)

**"Bu, sizin Rəbbiniz olan Allahdır, hökm Onundur. Sizin Ondan qeyri ibadət etdikləriniz bir çəyirdək qabığına belə sahib deyillər. Əgər siz onları çağırsanız (dua etsəniz), onlar sizin çağırışınızı eşitməzlər; eşitsələr də cavab verə bilməzlər. Özləri də qiyamət günü sizin (Onları Allaha) şərik qoşduğunuzu (onlara büt kimi ibadət etdiyinizi) danacaqlar. (Ya Peyğəmbər!) Heç kəs sənə hər şeydən xəbərdar olan (Allah) kimi xəbər verə bilməz!" (Fatir:13-14).**

Digər bir ayədə isə Allah taala buyurur:

﴿ يَدْعُوا۟ مِن دُونِ ٱللَّهِ مَا لَا يَضُرُّهُۥ وَمَا لَا يَنفَعُهُۥ ۚ ذَٰلِكَ هُوَ ٱلضَّلَٰلُ ٱلْبَعِيدُ ﴿١٢﴾ يَدْعُوا۟ لَمَن ضَرُّهُۥٓ أَقْرَبُ مِن نَّفْعِهِۦ ۚ لَبِئْسَ ٱلْمَوْلَىٰ وَلَبِئْسَ ٱلْعَشِيرُ ﴿١٣﴾ ﴾ (الحجّ:١٢-١٣)

**"O, Allahı buraxıb özünə nə zərər, nə də xeyir verən bütlərə tapınar. Haqq yoldan azıb uzaq düşmək də budur! Özü də zərəri xeyrindən daha çox (Cəhənnəmə daha yaxın) olana ibadət edər. O (büt) nə pisköməkçi, necə də pis yoldaşdır!" (əl-Həcc: 12-13).**

İslam dini bəndənin istəyinin və kömək diləməsinin yalnız gerçək ilaha, göylərin və yerin sahibi Allaha yönəltməsində təkid edir və israrlıdır. Çünki bütün işlərin açarı Onun əlindədir. Bunun

əksi olaraq, İslam dini Allahdan başqa batil ilahlara yönəlmiş kömək və istəklərin hər birinin batil olduğunu buyurur. Etdiyi bu əməl həmən adamın başına bir bəla olacağından da xəbər verir.

4. Bəndəni özünə bənzər birisinə ibadətdən xilas etmək və yalnız Allaha ibadət etməyə yönəltmək:

Insan həm zahirdə həm də batində xalis Allah bəndəsi olmalıdır. Belə olmazsa, hansısa bir məxluqun qulu olacaqdır. Onun ibadət etdiyi ilah: özünün istəyi, şəhvəti, malı, hakimiyyəti, var-dövləti, başçısı, qəbiləsi, həyat yoldaşı, uşağı, bütü və ya özü kimi bir məxluq olacaqdır. Belə olduqda onun bütün işləri bu müxtəlif məbudlar arasında bölünmüş vəziyyətə düşər. O, bu məbudların heç birində rahatlıq tapa bilməz. Bu ibadətinin məqsədini də dərk etməz. Bu haqda Allah taala buyurur:

﴿ وَمَن يُشْرِكْ بِٱللَّهِ فَكَأَنَّمَا خَرَّ مِنَ ٱلسَّمَآءِ فَتَخْطَفُهُ ٱلطَّيْرُ أَوْ تَهْوِى بِهِ ٱلرِّيحُ فِى مَكَانٍ سَحِيقٍ ﴿٣١﴾ ﴾ (الحج:٣١)

**"Allaha şərik qoşan kimsə göydən düşən, quşların onu sürətlə alıb apardığı, yaxud küləyin sovurub uzaqlara atdığı bir şeyə (məxluqa) bənzər." (əl-Həcc:31).**

Allah taala, Onu ibadətdə təkləşdirən mömin bəndə, həmçinin kafir və müşrik qul haqda da bir məsəl çəkmişdir. Bütün naqisliklərdən və eyiblərdən pak olan Allah buyurur:

﴿ ضَرَبَ ٱللَّهُ مَثَلًا رَّجُلًا فِيهِ شُرَكَآءُ مُتَشَـٰكِسُونَ وَرَجُلًا سَلَمًا لِّرَجُلٍ هَلْ يَسْتَوِيَانِ مَثَلًا ۚ ٱلْحَمْدُ لِلَّهِ ۚ بَلْ أَكْثَرُهُمْ لَا يَعْلَمُونَ ﴿٢٩﴾ ﴾ (الزمر:٢٩)

**"Allah (müşriklərlə müvahhid möminlər barəsində) bir məsəl çəkir: “Bir adamın (kölənin) bir-biri ilə çəkişən (pis xasiyyətli) bir neçə şərikli ağası var (hərəsi onu haqqı çatan qədər**

**işlədir). Başqa bir adamın da yalnız bir ağası var (təkcə ona xidmət edir). Onların hər ikisi vəziyyətcə eyni ola bilərmi?! Həmd (şükür və tərif) ancaq Allaha məxsusdur, lakin onların (müşriklərin) əksəriyyəti (bu həqiqəti) bilməz!" (əz-Zümər: 29).**

Allaha şərik qoşan adamın halına baxdıqda görürsən ki, onun müşrik dostlarının hərəsinin öz istəyi və arzusu vardır. Onlar özlərinə heç yerdə rahatlıq tapmır və qəlbi bir yerdə rahatlanmır. Mömin bəndə isə öz Rəbbini, Xaliqini, haqq Məbudunu tanıyır və dinini və ibadətini yalnız Ona məxsus edir. Bu mömin bəndə tam rahatlıq və arxayınlıq içindədir.

5. Nəfsi islah etmək, onun ehtiyacını ödəmək, onu kamil ləzzətə, nemətə və sevincə qovuşdurmaq:

Bunun açıqlaması: insanın ruhu və qəlbinin sağlamlaşdırılması yalnız heç bir şəriki olmayan Allaha bağlıdır. İnsan yalnız Onu yada salmaqla bu dünyada rahatlanar, Ona ibadət etməkdən həzz alar. Insan hər-hansı başqa bir şeydən ləzzət alarsa da bu daimi olmaz. Bu sevinc və ləzzət mütləq kəsiləcəkdir. Hətta ola bilsin ki, onun sevindiyi və ləzzət aldığı şey ona zərər yaxud əziyyət versin.

Heç bir şəriki olmayan Allaha iman və ibadət insanın mənəvi qidası, qüvvəsi, sağlamlığı və dayağıdır. Bu onun xoşbəxtliyinin və axirətdə daimi nemətə qovuşmasının əsasıdır. Allah taala buyurur:

﴿ مَنْ عَمِلَ صَٰلِحًا مِّن ذَكَرٍ أَوْ أُنثَىٰ وَهُوَ مُؤْمِنٌ فَلَنُحْيِيَنَّهُۥ حَيَوٰةً طَيِّبَةً ۖ وَلَنَجْزِيَنَّهُمْ أَجْرَهُم بِأَحْسَنِ مَا كَانُوا۟ يَعْمَلُونَ ﴿٩٧﴾ ﴾ (النحل:٩٧)

**"Mömin olub yaxşı işlər görən (Allaha itaət edən) kişi və qadına (dünyada və axirətdə) xoş həyat nəsib edəcək və etdikləri yaxşı əməllərə görə mükafatlarını verəcəyik. (Və ya gördükləri yaxşı işlərin əvəzində onlara daha yaxşı mükafatlar verəcəyik!)" (ən-Nəhl: 97).**

﴿ إِنَّ ٱلَّذِينَ ءَامَنُواْ وَعَمِلُواْ ٱلصَّٰلِحَٰتِ أُوْلَٰٓئِكَ هُمۡ خَيۡرُ ٱلۡبَرِيَّةِ ٧ جَزَآؤُهُمۡ عِندَ رَبِّهِمۡ جَنَّٰتُ عَدۡنٖ تَجۡرِي مِن تَحۡتِهَا ٱلۡأَنۡهَٰرُ خَٰلِدِينَ فِيهَآ أَبَدٗاۖ رَّضِيَ ٱللَّهُ عَنۡهُمۡ وَرَضُواْ عَنۡهُۚ ذَٰلِكَ لِمَنۡ خَشِيَ رَبَّهُۥ ٨ ﴾ (البينة:٧-٨)

**"İman gətirib yaxşı əməllər edənlər isə yaradılmışların ən yaxşılarıdır. Onların öz Rəbbi yanındakı mükafatı (ağacları) altından çaylar axan Ədn cənnətləridir. Onlar orada əbədi qalacaqlar. Allah onlardan razıdır, onlar da Allahdan. Bu (nemətlər) Rəbbindən qorxanlar üçündür!" (əl-Bəyyinə: 7-8).**

6. Heç bir şəriki olmayan Allaha ibadət etmək insanın fitrətinə uyğundur. Allah taala buyurur:

﴿ فَأَقِمۡ وَجۡهَكَ لِلدِّينِ حَنِيفٗاۚ فِطۡرَتَ ٱللَّهِ ٱلَّتِي فَطَرَ ٱلنَّاسَ عَلَيۡهَاۚ لَا تَبۡدِيلَ لِخَلۡقِ ٱللَّهِۚ ذَٰلِكَ ٱلدِّينُ ٱلۡقَيِّمُ وَلَٰكِنَّ أَكۡثَرَ ٱلنَّاسِ لَا يَعۡلَمُونَ ٣٠ ﴾ (الرّوم:٣٠)

**"(Ya Rəsulum! Ümmətinlə birlikdə) batildən haqqa tapınaraq (pak bir müvahhid, xalis təkallahlı kimi) üzünü Allahın fitri olaraq insanlara verdiyi dinə (İslama) tərəf tut. Allahın dinini (Onun yaratdığı tövhid dini olan İslamı) heç vəchlə dəyişdirmək olmaz. Doğru din budur, lakin insanların əksəriyyəti (haqq dininin İslam olduğunu) bilməz. (Allah bütün insanları xilqətcə müsəlman – təkallahlı yaratmışdır, lakin ata-anaları onları başqa dinlərə sövq etmiş, yaxud onlar yaşa dolduqda öz nadanlıqları üzündən batil dinlərə - bütpərəstliyə uymuşlar)." (ər-Rum: 30).**

İnsanın nəfsi yalnız heç bir şəriki olmayan Allaha ibadət etməklə rahat olur. Çünki bu, onun fitrətinə uyğundur. İnsan hər zaman onun fitrətinə uyğun olan işlərdə rahatlıq tapır. Həmçinin yalnız Allaha ibadət etmək insanın fitrətinə uyğun olduğundan bununla nəfsi rahatlıq tapır və bu işdə davamlı olur, başqasını onunla dəyişmir. Elə bu səbəbdən də müsəlmanlar tarix boyu öz dinlərini dəyişməmiş və bu gündə də öz dinlərini qoruyub saxlayırlar. Çünki bu din onların fitrətlərinə uyğundur. Müşriklər isə şübhə və tərəddüd içərisindədirlər. Çünki onlar öz fitrətlərinə müxalif olana ibadət edirlər. Onların iki çıxış yolu var: Ya onlar tək Allaha ibadət etməli və bununla rahat olmalıdırlar. Yaxud da Rəblərini görənə qədər küfr və zəlalət üzərində, tərəddüd və heyrət içərisində qalıb haqq-hesablarını gözləməlidirlər.

**Ikinci əsas: Mələklərə iman:**

İslam dini mələklərə imanı vacib etmişdir. Onlar, Allahın yaratdığı qeyb aləminə məxsus məxluqatdandırlar. Bu haqda Allah taala bizə Öz kitabında xəbər vermiş, onları vəsf etmiş, adlarını sadalamış və dediklərinə uyğun olaraq onların mövcudluğuna iman gətirməyi vacib etmişdir. Həmçinin mələklərə imanı imanın ikinci əsası etmişdir. Bu əsasa iman gətirməyənin imanı kamil olmaz.

Söhbət İslamın gözəlliklərindən getdiyi üçün bu əsasa iman gətirməkdə olan İslamın gözəlliklərindən bəzilərini qeyd etmək istəyirəm:

**1.** Allah taala və Onun Peyğəmbərinin ﷺ dediyi tərzdə mələklərə iman gətirdikdə həqiqətən də Allahın böyük yaradan olması dərk olunur. Çünki mələklərin bəziləri çox nəhəng və qorxulu sifətdə yaradılmışdır. Peyğəmbər ﷺ buyurur:

قال رسول الله ﷺ: «أُذن لي أن أحدّث عن ملك من ملائكة الله من حملة العرش، إن ما بين شحمة أذنه إلى عاتقه مسيرة سبعمائة عام». رواه أبو داود في سننه، وإسناده صحيح.

***"Məni dinlə, sənə ərşi daşıyan, Allahın mələklərindən biri haqda xəbər verəcəyəm. Onun qulağının kənarı (sırğalığı) ilə çiyni arasındakı məsafə yeddi yüz illik yol məsafəsinə bərabərdir"[1].***

Həmçinin digər hədisdə deyilir:

«أن رسول الله ﷺ رأى جبريل -عليه السّلام- في صورته التي خلق عليها له ستمائة جناح قد سدّ الأفق». رواه البخاري في صحيحه.

***Peyğəmbər ﷺ Cəbraili (a.s) həqiqi yaradılmış şəklində gördü. Onun altı yüz qanadı var idi. Onun qanadları üfüqü tam örtmüşdü"[2].***

Bütün bunlar Allahın necə də böyük və əzəmətli Xaliq olduğuna dəlildir.

2. Mələklərə, Allahın buyurduğuna uyğun olaraq iman gətirmək, onları sevməklə nəticələnir. Çünki onlar Allah ilə bəndələri arasında xəbər vasitəsidirlər. Onlar Allahın vəhyini peyğəmbərlərinə çatdırırlar. Həmçinin Allahın bəndələri üçün verdiyi əmrləri: yağış yağdırmağı, külək əsdirməyi, ana bətnində uşağı mərhələlərdən keçirtməyi, bəndələrin əməllərini yazmağı, ölüm ayağında rühlarını çıxarmağı və s-ni. həyata keçirirlər.

3. Mələklərə, Quran və Sünnədə deyildiyi kimi iman gətirmək, onların həqiqətini: yaradılmış və Allaha möhtac qul olduqlarını öyrədir. Onların ibadət olunmaqda heç bir payları yoxdur. Bununla

---

[1] Əbu Davud: 5\96\ № 4727. Hədis səhihdir.

[2] Buxari: 6\ 313\ № 3232, 3234.

da müsəlman, çoxlarının azdığı bir işdən: mələklər vasitəsi ilə Allaha şərik qoşmaq təhlükəsindən, salamat olur.

4. Mələklərə imanda müsəlman üçün təsəlli vardır. Çünki o, şeytanların Allaha qarşı etdikləri küfr, şirk və Onun mömin bəndələrinə qarşı nifrət və düşmənçiliyinin davam etdiyi bir təqdirdə, mələklərin insanın mühüm işlərində: Allaha ibadətdə və Onun razılığını qazanmaqda, onunla bir olduğunu hiss edir. Bununla da şeytanların vəhşətindən qurtulub özünə rahatlıq tapır.

Bu iki məxluqat yəni, mələklər və şeytanlar, gözə görünməyən məxluqdurlar. Biz onları görməsək də, onlar bizi hər tərəfdən əhatə etmiş və bizim etdiklərimizi görürlər.

**Üçüncü əsas: Kitablara iman:**

Bu iman: Allahın, bəzi peyğəmbərlərinə insanları hidayətə qovuşdurmaq üçün kitablar nazil etdiyinə iman gətirməkdir. Belə kitablardan: Tövrat, İncil, Zəbur və sonuncusu isə Qurandır.

Kitablara imanın öz gösəllikləri vardır, bunlardan:

1. Bütün kitablara iman gətirmək müsəlmanı digər səmavi dinlər ilə bağlayır. Bu kitablar Allah dərgahından gəlmiş haqdır. Bütün keçmiş və gələcək möminlər yalnız bir hidayət yolunda, Allahın doğru yolundadırlar.

2. Səmavi kitablara iman gətirməklə, Allahın bəndələrinə göndərdiyi risalətin bir olduğu anlaşılır. Allah bütün bəndələrindən eyni şeyləri tələb etmiş, keçmiş və gələcəkdəkilər arasında fərq qoymamışdır. Allah taala buyurur:

﴿ إِنَّ هَٰذِهِۦٓ أُمَّتُكُمۡ أُمَّةً وَٰحِدَةً وَأَنَا۠ رَبُّكُمۡ فَٱعۡبُدُونِ ٩٢ ﴾

(الأنبياء:٩٢)

**"(Ey insanlar!) Həqiqətən, bu *(tövhid dini olan İslam)* tək bir din olaraq sizin dininizdir. Mən də sizin Rəbbinizəm. Buna görə də yalnız Mənə ibadət edin!" (əl-Ənbiya: 92).**

3. Allahın kitablar nazil etməsi, Onun, bəndələrinə olan rəhmətindən və şəfqətindəndir. Allah onlara səmadan kitab nazil etmişdir ki, onu oxuyub həm dinlərini, həm də dünyalarını islah etsinlər.
4. Qurani Kərimə, onun Allah kəlamı olduğuna iman gətirmək bu kitabın müqəddəsliyini bildirir. Çünki o, Allahın sifətlərindən biri və kəlamından kəlimələrdir. Elə buna görə də o, müqəddəs və pak bir kitab sayılır. İnsan orada olan əmrləri yerinə yetirməli və göstərilən qadağalardan çəkinməlidir.
5. Qurani Kərim Allah taala tərəfindən qorunan bir kitabdır. Heç kəs ona bir şey artıra və ya ondan heç bir şeyi silə bilməz. Bu kitabın qorunması, mömin nəfslərə tam arxayınlıq və rahatlıq verir. Onun hər hansı hərfində şəkk-şübhə qalmır.
6. Qurani Kərim səmavi kitabların xətmi və sonuncusudur. Bu Kitab Peyğəmbərimiz Məhəmmədə ﷺ verilmiş ən böyük möcüzədir. Bu Kitab qiyamət gününə qədər insanlar üçün bir açıq-aşkar dəlil olaraq qalacaqdır.
7. Qurani Kərim və Peyğəmbərin ﷺ Sünnəsi müsəlmanların hər bir işlərində qayıdış yeridir. Onlar bu iki əsasdan tutduqları təqdirdə heç vaxt haqq yoldan azmaz və zəlalətə düşməzlər.

**Dördüncü əsas: Peyğəmbərlərə iman:**

İmanın əsaslarından biri də, bütün peyğəmbər və rəsullara iman gətirməkdir. Allah insanlar arasından peyğəmbər göndərmişdir ki, insanları Allahın yoluna, haqq dinə səsləsinlər. Onlar bəşəriyyətin ən xeyirli, kamil, söz və əməllərinə görə daha doğru insanlarıdırlar. Onlar hər bir xeyrin və nicatın göstəricisidirlər. Peyğəmbərlərə, Allahın buyurduğu tərzdə, iman gətirməyin bir çox gözəllikləri vardır:

1. Allahın, insanları haqq yola dəvət etmələri üçün peyğəmbərlər göndərməsi, Onun bəndələrinə olan hədsiz rəhmət və şəfqətini, həmçinin onları boş-boşuna yaratmadığını bildirir. Bununla onlara

dünyada yaxşı həyat tərzi və axirətdə əbədi səadətə nail olmaq üçün peyğəmbərlər göndərmişdir.

2. Allah taalanın bu peyğəmbərləri ən kamil, pak və şərəfli insanlardan seçməsi, Öz yaratdıqlarına, xüsusən də Adəm övladına olan rəhmət və dərin hörmətdəndir. Bu peyğəmbərlər insanları paklığa səsləyir, pisliklərdən çəkindirirdilər. Lakin bu elçilərin ən pak və şərəfli insanlar olmasına baxmayaraq, bəşər övladının daşıya bilmədiyi, ən ağır və çətin yük onların boynuna düşürdü. Onlar bütün bunların qarşısında yalnız Allahın əmri ilə dayanırdılar. Bütün bunlar Allahın Öz bəndələrinə olan rəhmət və şəfqətindən xəbər verir.

3. Bütün peyğəmbərlərə iman gətirmək, Allahın insanlar üçün istədiyi hidayət və əmrlərin Adəm peyğəmbərin vaxtından ta Məhəmməd Peyğəmbərin ﷺ vaxtına qədər eyni olduğunu bildirir. Bu yol, dorğu və düz yoldur.

4. Bütün peyğəmbərlərə iman gətirmək insanın qarşısında çox geniş örnək və ibrət qapısı açır. İnsan, peyğəmbərlərin başına gələn müsibətlərdən və imtahanlardan ibrət və dərs alır. Bu da, müsəlman üçün geniş təcrübə və ümid deməkdir.

5. Peyğəmbərlər bir dinə, İslam dininə dəvət etmək üçün göndərilmişlər. İlk göndərilmiş peyğəmbərin dedikləri ilə sonuncunun dedikləri eynidir. Onlar bəşəriyyəti eyni fikir və əqidəyə səsləyirlər. Əsrlər boyu müxtəlif zamanlarda peyğəmbərlərin eyni dəvət aparmaları və eyni əqidəyə çağırmaları müsəlmanın qəlbinə təskinlik gətirir və bu dinin haqq olmasını bilir. Zəlalətdə olan firqələr, müşriklər, Allahı inkar edənlər və s. onlara oxşayanlar tam əksinə, bir neçə ilaha ibadət edir, zəlalətin müxtəlif yolları ilə gedirlər. Bu bir dəlildir ki, onlar hidayət yoluna etimad etmir, doğru yolu tanımırlar. Onlar, şeytanın və ya nəfslərinin öyrətdiyi müxtəlif istək və arzulara əsaslanırlar.

6. Bütün peyğəmbərlərə iman gətirməklə Məhəmməd Peyğəmbərin ﷺ onların sonuncusu olduğuna şəhadət veririk. Çünki ondan əvvəlki peyğəmbərlər də onun sonuncu peyğəmbər olacağına şəhadət vermişdilər. Düzdür yəhudilər və xaçpərəstlər onun adını öz kitablarından siliblər. Lakin buna baxmayaraq yenə də onun peyğəmbərliyini təsdiqləyən əsaslar qalmışdır. Həmçinin ondan əvvəlki peyğəmbərlərin risalətinin məzmunu onun risalətinin məzmununu təsdiqləyir. Bu, hamısının Allah taala tərəfindən olduğuna açıq-aydın dəlildir. Bütün peyğəmbərlərin risalətinin eyni olması, əvvəlki peyğəmbərin özündən sonrakını təsdiqləməsi, sonuncu peyğəmbərin də haqq olması deməkdir.
7. Risalətin peyğəmbərimiz Məhəmmədlə ﷺ bitməsinin öz gözəlliyi və hikməti vardır. Beləliklə, hər hansı bir dəccalın peyğəmbərlik iddiasının qarşısını almaq mümkündür. Belə olduqda onlar insanların özlərini, dinlərini ələ sala bilməz, onların mallarını yeyə bilməzlər. Kim Məhəmməd Peyğəmbərdən ﷺ sonra peyğəmbərlik iddia edərsə, artıq onun doğru və yalançı olmasını soruşmağa lüzum yoxdur. O, yalançıdır və bu sözlə o kafir olur. Bu, insanları haqq yoldan azdırmaq istəyən hər bir yalançının iddiasını puç edir.

**Beşinci əsas: Axirət gününə iman:**

Axirət günü: İnsanların haqq-hesab üçün toplanacaqları qiyamət günüdür. Bu günün "Axirət" adlanmasının səbəbi, onun sonuncu gün olmasıdır. Bu gündə Cənnət əhli cənnətdə, Cəhənnəm əhli isə cəhənnəmdə məskunlaşdırılacaqlar.

Allah taala buyurur:

﴿ ٱللَّهُ لَآ إِلَـٰهَ إِلَّا هُوَ ۚ لَيَجۡمَعَنَّكُمۡ إِلَىٰ يَوۡمِ ٱلۡقِيَـٰمَةِ لَا رَيۡبَ فِيهِ ﴾

(النساء:٨٧)

**"Allahdan başqa ibadətə layiq heç bir haqq tanrı yoxdur. Olacağına şübhə edilməyən qiyamət günü hamınızı (bir yerə),**

**əlbəttə, O toplayacaqdır. Allahdan daha doğru danışan kim ola bilər?!" (ən-Nisa: 87).**

Qiyamət günü insanlar qəbirlərindən, mələk İsrafil ikinci dəfə sura üfürdükdən sonra qalxacaqlar. Onlar qəbirlərindən ayaqyalın, lüt və sünnət olunmamış halda çıxacaqlar. Allah taala buyurur:

﴿ يَوْمَ نَطْوِى ٱلسَّمَآءَ كَطَىِّ ٱلسِّجِلِّ لِلْكُتُبِ ۚ كَمَا بَدَأْنَآ أَوَّلَ خَلْقٍ نُّعِيدُهُۥ ۚ وَعْدًا عَلَيْنَآ ۚ إِنَّا كُنَّا فَٰعِلِينَ ﴿١٠٤﴾ ﴾ (الأنبياء:١٠٤)

**"Göyü kitab səhifəsi kimi büküb qatlayacağımız günü (qiyamət gününü) yadınıza salın. (O gün insanları) ilk dəfə (yoxdan) yaratdığımız kimi qaytarıb (dirildib) əvvəlki halına salarıq. Biz yerinə yetirməli olduğumuz vədi mütləq yerinə yetirəcəyik. (Biz qiyamət günü sizi dirildib lüt-üryan, anadangəlmə vəziyyətdə məhşərə gətirməyi vəd etmişdik. Biz onu mütləq edəcəyik)." (əl-Ənbiya: 104).**

Digər ayədə isə Allah taala buyurur:

﴿ ثُمَّ إِنَّكُم بَعْدَ ذَٰلِكَ لَمَيِّتُونَ ﴿١٥﴾ ثُمَّ إِنَّكُمْ يَوْمَ ٱلْقِيَٰمَةِ تُبْعَثُونَ ﴿١٦﴾ ﴾ (المؤمنون:١٥-١٦)

**"(Belə bir yaradılışdan) sonra siz mütləq öləcəksiniz! Sonra siz qiyamət günü yenidən dirildiləcəksiniz!" (əl-Muminun: 15 - 16).**

Peyğəmbər ﷺ hədislərin birində buyurur:

وقال النبي ﷺ: «يحشر الناس يوم القيامة حفاة عراة غرلا» رواه البخاري في صحيحه ومسلم.

*"Qiyamət günü insanlar ayaqyalın, lüt və sünnətsiz məhşərə toplanacaqlar"*[1].

---

[1] Buxari: 11\ 377-378\ № 5627. Müslim: № 2859.

O gün, bəndə ilə etdiyi əməllərinə görə haqq-hesab çəkiləcək, mükafatlandırılacaq yaxud cəzalandırılacaqdır. Quran, Sünnə və müsəlmanların icması bu məsələyə dəlildir. Allah taala buyurur:

﴿ إِنَّ إِلَيْنَآ إِيَابَهُمْ ﴿٢٥﴾ ثُمَّ إِنَّ عَلَيْنَا حِسَابَهُم ﴿٢٦﴾ ﴾ (الغاشية:٢٦)

**"Şübhəsiz ki, onların axır dönüşü Bizədir! Onlarla haqq-hesab çəkmək də Bizə aiddir!" (əl-Ğaşiyə: 25-26).**

Allah taala buyurur:

﴿ مَن جَآءَ بِٱلْحَسَنَةِ فَلَهُۥ عَشْرُ أَمْثَالِهَا ۖ وَمَن جَآءَ بِٱلسَّيِّئَةِ فَلَا يُجْزَىٰٓ إِلَّا مِثْلَهَا وَهُمْ لَا يُظْلَمُونَ ﴿١٦٠﴾ ﴾ (الأنعام:١٦٠)

**"Kim yaxşı bir iş görərsə, ona həmin işin on qat əvəzi (savabı) verilər. Kim pis bir iş görərsə, ona həmin işin misli qədər cəza verilər. Onlara haqsızlıq edilməz." (əl-Ənam: 160).**

Allah taala buyurur:

﴿ وَنَضَعُ ٱلْمَوَٰزِينَ ٱلْقِسْطَ لِيَوْمِ ٱلْقِيَـٰمَةِ فَلَا تُظْلَمُ نَفْسٌ شَيْـًٔا ۖ وَإِن كَانَ مِثْقَالَ حَبَّةٍ مِّنْ خَرْدَلٍ أَتَيْنَا بِهَا ۗ وَكَفَىٰ بِنَا حَـٰسِبِينَ ﴿٤٧﴾ ﴾

(الأنبياء:٤٧)

**"Biz qiyamət günü üçün ədalət tərəzisi quraraq. Heç kəsə əsla haqsızlıq edilməz. Bir xardal dənəsi ağırlığında olsa belə onu (hər hansı bir əməli tərəziyə) gətirərik. Haqq-hesab çəkməyə Biz kifayətik." (əl-Ənbiya: 47).**

İnsanlar məhşərdə haqq-hesablarını əlli min ilə bərabər bir gündə gözləyəcəklər. O gün, günəş məxluqatdan bir mil məsafə uzaqlığında olacaqdır. Hər kəs öz əməlinə uyğun olaraq tərləyəcəkdir. Bəzilərinin təri onu boğacaq, bəzilərinin təri belinə, dizlərinə, qədəmlərinə qədər olacaqdır. Bəziləri Rəhmanın ərşinin

kölgəsi altında nemət əldə edər və Peyğəmbərin ﷺ hovuzundan sərin, dadlı və saf su içərlər. Allahdan Onun lütfünü istəyirik!

O gün, hər kəsə əməlləri yazılmış kitabı *(əməl dəftəri)* özünə veriləcəkdir. Allah taala buyurur:

﴿ وَكُلَّ إِنسَٰنٍ أَلْزَمْنَٰهُ طَٰٓئِرَهُۥ فِى عُنُقِهِۦ ۖ وَنُخْرِجُ لَهُۥ يَوْمَ ٱلْقِيَٰمَةِ كِتَٰبًا يَلْقَىٰهُ مَنشُورًا ﴿١٣﴾ ٱقْرَأْ كِتَٰبَكَ كَفَىٰ بِنَفْسِكَ ٱلْيَوْمَ عَلَيْكَ حَسِيبًا ﴿١٤﴾ ﴾ (الإسراء:١٣-١٤)

**"Biz hər bir insanın əməlini öz boynundan asar və qiyamət günü (bütün əməllərini) açıq kitab kimi qarşısına qoyarıq. (Və ona belə deyərik: ) "Oxu, kitabını (əməl dəftərini). Bu gün sən haqq-hesab çəkməyə özün-özünə (özün öz əməllərinin şahidi olmağa) kifayətsən"" (əl-İsra: 13, 14).**

O gün hər kəsə yalnız etdiyi əməlləri kömək edəcəkdir. Heç kəsin atası, anası, qardaşı və başqaları ona kömək etməyəcəkdir. Hətta o, tanıdığı adamlardan, ondan kömək istəyəcəklər deyə, uzaq qaçacaqdır. Allah taala buyurur:

﴿ يَوْمَ يَفِرُّ ٱلْمَرْءُ مِنْ أَخِيهِ ﴿٣٤﴾ وَأُمِّهِۦ وَأَبِيهِ ﴿٣٥﴾ وَصَٰحِبَتِهِۦ وَبَنِيهِ ﴿٣٦﴾ لِكُلِّ ٱمْرِئٍ مِّنْهُمْ يَوْمَئِذٍ شَأْنٌ يُغْنِيهِ ﴾ (عبس:٣٤-٣٧)

**"O gün insan qaçacaq öz qardaşından; anasından, atasından; zövcəsindən və oğullarından! O gün onlardan hər birinin istənilən qədər işi olacaqdır! (Hər kəs öz hayında olacaq, heç kəs heç kəsin halından xəbər tutmayacaqdır)." (Əbəsə: 34-37).**

Allah taala buyurur:

﴿ يُبَصَّرُونَهُمْ ۚ يَوَدُّ ٱلْمُجْرِمُ لَوْ يَفْتَدِى مِنْ عَذَابِ يَوْمِئِذٍ بِبَنِيهِ ﴿١١﴾ ﴾

(المعارج:١١)

**"Onlar bir-birinə göstəriləcəklər (lakin bir-birini tanısalar da, özlərini tanımazlığa vurub bir-birindən qaçacaqlar). O günün əzabından qurtarmaq üçün günahkar istəyərdi ki, öz oğullarını fəda etsin (fidyə versin)" (əl-Məaric: 11).**

Sirat körpüsü cəhənnəmin üzərindən qoyulacaqdır. Möminlər bu körpünü keçib cənnətə girəcəklər. Kafirlər isə orada yıxılıb cəhənnəmə düşəcəklər. Körpünü ilk keçənlər Məhəmməd Peyğəmbərin ﷺ ümməti olacaqdır.

O günün nəticəsi cənnət və ya cəhənnəm olacaqdır. Bu iki məkan məxluqatın qayıdacaqları yerdir. Cənnət, Allahın müttəqi və mömin bəndələri üçün hazırladığı naz-nemətlərin məskənidir. Bu insanlar, Allahın onlara vacib etdiyinə iman gətirmiş, sidq ürəklə və ixlasla Allahın və Peyğəmbərinin ﷺ itaətində duranlardır. Orada gözlərin görmədiyi, qulaqların eşitmədiyi, insanın ağlına gələ bilməyəcək qeyri adi nemətlər vardır. Allah taala buyurur:

﴿ إِنَّ ٱلَّذِينَ ءَامَنُوا۟ وَعَمِلُوا۟ ٱلصَّٰلِحَٰتِ أُو۟لَٰٓئِكَ هُمْ خَيْرُ ٱلْبَرِيَّةِ ﴿٧﴾

جَزَآؤُهُمْ عِندَ رَبِّهِمْ جَنَّٰتُ عَدْنٍ تَجْرِى مِن تَحْتِهَا ٱلْأَنْهَٰرُ خَٰلِدِينَ فِيهَآ

أَبَدًا ۖ رَّضِىَ ٱللَّهُ عَنْهُمْ وَرَضُوا۟ عَنْهُ ۚ ذَٰلِكَ لِمَنْ خَشِىَ رَبَّهُۥ ﴿٨﴾ ﴾(البينة:٧-٨)

**"İman gətirib yaxşı əməllər edənlər isə yaradılmışların ən yaxşılarıdır. Onlardan öz Rəbbi yanındakı mükafatı (ağacları) altından çaylar axan Ədn cənnətləridir. Onlar orada əbədi qalacaqlar. Allah onlardan razıdır, onlar da Allahdan. Bu (nemətlər) Rəbbindən qorxanlar üçündür!" (əl-Bəyyinə: 7-8).**

Allah taala buyurur:

﴿ فَلَا تَعۡلَمُ نَفۡسٞ مَّآ أُخۡفِيَ لَهُم مِّن قُرَّةِ أَعۡيُنٖ جَزَآءَۢ بِمَا كَانُواْ يَعۡمَلُونَ ١٧ ﴾ (السجدة:١٧)

**"Etdikləri əməllərin mükafatı olaraq (Allah dərgahında) onlar (möminlər) üçün göz oxşayan (onları sevindirəcək) nə cür nemətlər gizlənib saxlandığını heç kəs bilməz!" (əs-Səcdə: 17).**

Cəhənnəm isə Allahın, Ona və rəsuluna asilik edən zalım və kafirlər üçün hazırladığı cəza məkanıdır. Orada insanın təsəvvür etmədiyi müxtəlif əzab və cəza növləri vardır. Allah taala buyurur:

﴿ وَٱتَّقُواْ ٱلنَّارَ ٱلَّتِيٓ أُعِدَّتۡ لِلۡكَٰفِرِينَ ١٣١ ﴾ (آل عمران:١٣١)

**"Kafirlər üçün hazırlanmış oddan *(Cəhənnəmdən)* həzər edin!" (Ali İmran: 131).**

Allah taala buyurur:

﴿ إِنَّآ أَعۡتَدۡنَا لِلظَّٰلِمِينَ نَارًا أَحَاطَ بِهِمۡ سُرَادِقُهَاۚ وَإِن يَسۡتَغِيثُواْ يُغَاثُواْ بِمَآءٖ كَٱلۡمُهۡلِ يَشۡوِي ٱلۡوُجُوهَۚ بِئۡسَ ٱلشَّرَابُ وَسَآءَتۡ مُرۡتَفَقًا ٢٩ ﴾ (الكهف:٢٩)

**"Biz zalımlar üçün elə bir atəş hazırlamışıq ki, onun pərdələri (dumanları) onları bürüyəcəkdir. (Cəhənnəmin qalın divarları zalımları əhatə edəcəkdir). Onlar imdad istədikdə onlara qətran (yaxud yaradan axan irin-qan) kimi üzlərini büryan edən bir su ilə kömək ediləcəkdir. O, nə pis içki, o (Cəhənnəm) necə də pis məskəndir!" (əl-Kəhf: 29).**

Axirət günü haqda qısa məlumatdan sonra bu günə imanın bəzi gözəlliklərindən danışmaq olar:

1. Bu günün haqq-hesab günü olmasına iman gətirmək Allahın kamil adilliyi və rəhmətinə açıq aydın dəlildir. O gün zalımlar

etdikləri zülmün, xeyirxahlar isə etdikləri yaxşılıqların əvəzini görəcəklər.

2. Axirət gününə iman gətirmək insanı öz nəfsinin istəklərinə, şəhvətinə, düşmənçiliyinə və təkəbbürlüyünə qapanmağa mane olur. Kim belə iş görmək istədikdə, qarşısında haqq-hesab gününün olacağını dərk etsə, onda bu idrak onu pis əməllərdən çəkindirməyə kömək olar.

3. Axirət gününə iman gətirmək yaxşı işlərin görülməsinə əsas səbəbdir. İnsan bir yaxşılıq edəndə bilir ki, bu yaxşılıq onun əməl dəftərində yazılmışdır. Bu əməllər Qiyamət günü onun qarşısına çıxacaq və əvəzini artıqlaması ilə görəcəkdir. Bunu bilən insan, Allah yanında dərəcəsini artırmaq üçün, yaxşı işləri görməkdə daima həvəs göstərir.

4. Qiyamət gününə iman, bəla və müsibətlərdə səbirli olmağın ən önəmli amillərindəndir. Çünki insanın bu dünya həyatı məşəqqət və bədbəxtliklərlə doludur. Lakin insanlar Allahın səbirli bəndələri üçün hazırladığı savab və mükafatı fikirləşəndə onları, qarşılaşdığı çətinlik və bəlalardan, itirdiyi sağlamlıq, mal-dövlət, şan-şöhrət, övlad və s-dən üstün görür.

5. Axirət gününə iman, dünyaya arxayınlığın və onunla qürurlanmağın qarşısını alır. Çünki Qiyamət gününə iman gətirən insan, dünyanın fani və az faydalı olduğunu dərk edir. Dünyaya yalnız onunla qürurlanan arxayın olar.

6. İnsanın Axirət gününə və az bir müddətdən sonra bu dünyadan köçüb əbədi bir həyata qovuşacağına iman gətirməsi onun hər bir işdə ədalətli mövqe tutmasına əsas verir. Dünyadan, onu sevindirəcək bir şey qazandıqda bu sevinci onu lovğalandırmaz, əksinə o qazandığı işdən ehtiyaclarını ödəyər, Allahın ona verdiyi nemətə sevinər və onunla Allaha itaətini artırar. Əgər ona dünyada hər hansı bir bəla və ya çətinlik baş verərsə həmin insan üzülməz və Allahdan ümidini kəsməz. Əksinə səbr edib savabını Allahdan

istəyər. Çünki o bilir ki, hər bir bəladan sonra rahatlıq vardır. Bu dünya həyatı fanidir, dünyada olarkən Allaha itaət edənlər üçün həqiqi səadət və xoşbəxtlik axirətdədir.

7. Axirət gününə iman, saleh əməllərdə və ibadətlərdə yarışmağa səbəbdir. Çünki axirətdə cəza əməlin cinsindən və kəmiyyətindən asılıdır. Bu da insanı, yaxşı işlər görməyə sövq edir və pis işlərdən çəkindirir.

8. Axirət gününə iman, cəmiyyətdə bütün insanlarla gözəl əxlaqla davranmağı qoruyur. Çünki bütün bunların axirətdə öz mükafatı vardır. Elə bu baxımdan, Allaha və Axirət gününə iman gətirənin əxlaqı gözəl və yaşayışı rahat olar. Xeyri çoxalar, zərəri isə azalar.

Bu, Axirət gününə imanın bəzi gözəllikləri idi. Yəqin ki, deyilənlər kifayətdir. Sadalanmayan gözəlliklər sayca çox, təsircə mühümdür.

**Altıncı əsas: Qəza və Qədərə iman:**

Qədər – Allahın, bütün kainatın taleyini, əzəli elmi, hikməti ilə yazmasıdır. Qəza isə Allahın yazdığı bu hökmün Qədərdə olduğu kimi baş verməsidir.

Qədərə iman dörd məsələni əhatə edir:

**Birinci:** Allahın hər şeyi, həm Öz əməllərini həm də bəndələrinin əməllərini əzəldən, mücməl və müfəssəl şəkildə hər zaman bilməsinə iman gətirmək:

**Ikinci:** Allahın qəza və qədəri Lövhi Məhfuzda yazmasına iman gətirmək: Bu iki məsələ haqda Allah taala buyurur:

﴿ أَلَمْ تَعْلَمْ أَنَّ ٱللَّهَ يَعْلَمُ مَا فِى ٱلسَّمَآءِ وَٱلْأَرْضِ ۗ إِنَّ ذَٰلِكَ فِى كِتَـٰبٍ ۚ إِنَّ ذَٰلِكَ عَلَى ٱللَّهِ يَسِيرٌ ۝٧٠ ﴾ (الحج:٧٠)

"*(Ya Rəsulum!)* **Məgər bilmirsənmi ki, Allah göydə və yerdə nə varsa** *(hamısını)* **bilir? Həqiqətən, bu,** *(lövhi-məhfuz deyilən)* **bir**

**kitabdadır. Şübhəsiz ki, bu *(bütün bunları bilmək)* Allah üçün asandır!" (əl-Həcc: 70).**

Müslimin səhih kitabında Abdullah Ibn Amr Ibn əl-Asdan ﷺ belə rəvayət edilir:

«كتب الله مقادير الخلائق قبل أن يخلق السماوات والأرض بخمسين ألف سنة»

رواه مسلم.

***"Allah göyləri və yeri yaratmadan əlli min il öncə məxluqatın qədərini yazmışdır"[1].***

**Üçüncü:** Allahın və ya Onun bəndələrinin hərəkətlərinin yalnız Allahın istəyi ilə olduğuna iman gətirmək: Allah taala Öz hərəkətləri, əməlləri haqda buyurur:

﴿ وَرَبُّكَ يَخْلُقُ مَا يَشَآءُ وَيَخْتَارُ ﴾ (القصص:٦٨)

**"Rəbbin istədiyini yaradar və istədiyini də seçər." (əl-Qəsəs: 68).**

Bəndələrinin hərəkətləri haqqında isə buyurur:

﴿ وَلَوْ شَآءَ ٱللَّهُ لَسَلَّطَهُمْ عَلَيْكُمْ فَلَقَـٰتَلُوكُمْ ﴾(النساء:٩٠)

**"Əgər Allah istəsəydi, onları sizin üstünüzə qaldırardı və onlar da sizinlə vuruşardılar..." (ən-Nisa: 90).**

Həmçinin digər ayədə buyurur:

﴿ وَلَوْ شَآءَ ٱللَّهُ مَا فَعَلُوهُ ۖ فَذَرْهُمْ وَمَا يَفْتَرُونَ ﴿١٣٧﴾ ﴾ (الأنعام:١٣٧)

**"Əgər Allah istəsəydi, bunu etməzdilər. *(Ya Rəsulum!)* Onları da, uydurduqları yalanları da başlı-başına burax!" (əl-Ənam: 137).**

---

[1] Müslim: 4\ № 2653

Dördüncü: Bütün baş verənlərə öz vəsfi, hərəkəti və mahiyyətinə görə Allahın yaratdıqları olduğuna iman gətirmək. Allah taala buyurur:

﴿ ٱللَّهُ خَـٰلِقُ كُلِّ شَىْءٍ ۖ وَهُوَ عَلَىٰ كُلِّ شَىْءٍ وَكِيلٌ ﴾ (الزمر:٦٢)

**"Allah hər şeyin xaliqidir. O, hər şeyə vəkildir!" (əz-Zümər: 62).**

Digər ayədə Allah taala buyurur:

﴿ وَخَلَقَ كُلَّ شَىْءٍ فَقَدَّرَهُۥ تَقْدِيرًا ﴾ (الفرقان:٢)

**"O, hər şeyi yaratmış və onu *(onun nə cür olacağını)* təqdir *(əzəldən müəyyən)* etmişdir." (əl-Furqan: 2).**

Qədərə deyilən formada iman gətirmək bəndənin öz ixtiyarı ilə etdiyi əməllərində istəyi və gücünün olmasına zidd deyildir. Çünki həm şəriət həm də reallıq bunu sübut edir.

Bunu isbat edən şəriət dəlillərindən. Məsələn, Allah taala əməlləri bəndələrə nisbət edərək buyurur:

﴿ وَمَن يُطِعِ ٱللَّهَ وَٱلرَّسُولَ ﴾ (النساء: ٦٩)

**"Allaha və Peyğəmbərə itaət edənlər ..." (ən-Nisa: 69).**

﴿ وَمَن يَعْمَلْ سُوٓءًا أَوْ يَظْلِمْ نَفْسَهُۥ ثُمَّ يَسْتَغْفِرِ ٱللَّهَ يَجِدِ ٱللَّهَ غَفُورًا رَّحِيمًا ﴾ (النساء:١١٠)

**"Hər kəs pis iş gördükdən və ya özünə zülm etdikdən sonra Allahdan bağışlanmağını dilərsə, Allahın bağışlayan, mərhəmətli olduğunu görər." (ən-Nisa: 110).** Və s. belə dəlillər çoxdur.

Reallıqdan olan dəlillər isə bunlardır: Hər bir insan özünün istəyi, gücü olduğunu bilir və onlarla bir işi görür və ya tərk edir. O, öz istəyi ilə olanları: gəzmək və s. həmçinin öz istəyi ilə olmayanları:

əsmə, titrəmə və s. – də bilir. Lakin bəndənin istəyi və hərəkəti Allah taalanın istəyi və qüdrəti ilə həyata keçirilir. Çünki Allah taala buyurur:

﴿ لِمَن شَآءَ مِنكُمۡ أَن يَسۡتَقِيمَ ٢٨ وَمَا تَشَآءُونَ إِلَّآ أَن يَشَآءَ ٱللَّهُ رَبُّ ٱلۡعَٰلَمِينَ ٢٩ ﴾(التكوير:٢٨-٢٩)

**"Eləcə də sizdən doğru-düz *(yolda)* olmaq istəyənlər üçün. *(Onu da bilin ki)* aləmlərin Rəbbi olan Allah istəməsə, siz *(bunu)* istəyə bilməzsiniz!" (ət-Təkvir: 28-29).**

Bütün kainat Allah taalanın mülkü olduğu üçün Onun mülkündə Onun istəyi və xəbəri olmadan heç nə ola bilməz.

Qəza və qədər haqda qısa məlumatdan sonra bu əsasa aid imanın gözəlliklərindən bəzilərini sadalamaq olar:

1. Qədər, insanın yalnız Allaha arxalandığı zaman səmərə verir. Çünki insana fayda və ya zərər verən Odur. Allahdan qeyrisi insana, Allahın onun qədərinə yazdığından başqa bir şeyi fayda və ya zərər olaraq verə bilməz. Ağıllı insan, ona həm dünya, həm də axirətdə fayda verən və zərərini dəf etmək iqtidarında olanı tərk edib, ona fayda və zərər verə bilməyənə ibadət etməz. Peyğəmbər ﷺ İbn Abbasa رضي الله عنه nəsihət edərkən buyurur:

«واعلم أن الأمة لو اجتمعوا على أن ينفعوك بشيء لم ينفعوك إلا بشيء قد كتبه الله لك، ولو اجتمعوا على أن يضروك لم يضروك إلا بشيء قد كتبه الله عليك، رفعت الأقلام وجفّت الصحف» رواه الترمذي في سننه وأحمد في مسنده، وهو حديث صحيح.

***"Bil ki, əgər bütün ümmət toplanıb sənə bir fayda vermək istəsələr, onlar Allahın sənin qədərinə yazdığından başqa bir fayda verə bilməzlər. Əksinə, əgər bütün insanlar toplanıb sənə zərər***

***vermək istəsələr, onlar Allahın sənin qədərinə yazdığından başqa bir zərər verə bilməzlər. Artıq qələm qaldırılmış və səhifələr qurumuşdur"[1].***

2. Qədərə iman, muradına yetişən müsəlmanın özünü öyməsinin qarşısını alır. Çünki o, Allah taalanın təqdiri və lütfü ilə muradına çatmışdır. İnsanın özünü öyməsi, ona həqiqi nemət verənə: Allaha, - şükür etməsini unutdurur.
3. Başına gələn təqdir edilmiş işlərə görə nəfsi rahatlıq və arxayınlıq əldə edən insan istədiyini itirdikdə və ya xoşlamadığı iş baş verdikdə təlaşa düşməz. Çünki o bunun, yer və göyün sahibi olan Allahın təqdiri ilə baş verdiyini və onun qaçılmaz olduğunu başa düşür. Bu haqda Allah taala belə buyurur:

﴿ مَآ أَصَابَ مِن مُّصِيبَةٍ فِى ٱلْأَرْضِ وَلَا فِىٓ أَنفُسِكُمْ إِلَّا فِى كِتَـٰبٍ مِّن قَبْلِ أَن نَّبْرَأَهَآ ۚ إِنَّ ذَٰلِكَ عَلَى ٱللَّهِ يَسِيرٌ ﴿٢٢﴾ لِّكَيْلَا تَأْسَوْا۟ عَلَىٰ مَا فَاتَكُمْ وَلَا تَفْرَحُوا۟ بِمَآ ءَاتَىٰكُمْ ۗ وَٱللَّهُ لَا يُحِبُّ كُلَّ مُخْتَالٍ فَخُورٍ ﴿٢٣﴾ ﴾ (الحديد:٢٢-٢٣)

**"Yer üzündə baş verən və sizin öz başınıza gələn elə bir müsibət yoxdur ki, Biz onu yaratmamışdan əvvəl o, bir kitabda *(lövhi-məhfuzda)* yazılmamış olsun. Bu, Allah üçün çox asandır! Bu sizin əlinizdən çıxana kədərlənməməyiniz və sizə də verilənə sevinib qürrələnməməyiniz üçündür. Allah özünü bəyənən, *(özü ilə)* fəxr edən heç bir kəsi sevməz!" (əl-Hədid: 22-23).**

Digər ayədə isə Allah taala buyurur:

﴿ مَآ أَصَابَ مِن مُّصِيبَةٍ إِلَّا بِإِذْنِ ٱللَّهِ ۗ وَمَن يُؤْمِنۢ بِٱللَّهِ يَهْدِ قَلْبَهُۥ ۚ وَٱللَّهُ بِكُلِّ شَىْءٍ عَلِيمٌ ﴿١١﴾ ﴾ (التغابن:١١)

---

[1] Tirmizi: 4 \ 576\ № 2516. Əhməd: 1\ 293. Hədis səhihdir.

**"Allahın izni olmadıqca** *(heç kəsə)* **heç bir müsibət üz verməz. Kim Allaha iman gətirsə,** *(Allah)* **onun qəlbini haqqa doğru yönəldər.** *(O, dünyada baş verən hər şeyin Allahın əzəli hökmü və izni ilə olduğunu bilər)***. Allah hər şeyi** *(keçmişi, indini və gələcəyi)* **biləndir!" (ət-Təğabun: 11).**

Alimlərdən biri deyir: Ayədə deyilən kimsə, başına müsibət gəldikdə onun Allah taala tərəfindən olduğunu bilib onunla razılaşan adamdır. İbn Abbas ﷺ ayədəki: "*(Allah)* onun qəlbini haqqa doğru yönəldər" – sözünün mənası haqda deyir:

(يهدي قلبه لليقين فيعلم أن ما أصابه لم يكن ليخطئه وما أخطأه لم يكن ليصيبه) رواه الطبري في تفسيره.

***"Onun qəlbini yəqinliyə yönəldər. Bununla o, başına gələnin mütləq ona yetişəcəyini, başına gəlməyəcək bir işin ona yetişməyəcəyini bilər"[1].***

Peyğəmbər ﷺ buyurur:

ويقول النبي ﷺ: «عجبا لأمر المؤمن إن أمره كله خير وليس ذلك لأحد إلا للمؤمن، إن أصابته سراء شكر فكان خيرا له، وإن أصابته ضراء صبر فكان خيرا له» رواه مسلم.

***"Möminin həyatı necə də qəribədir! Onun bütün işləri xeyirdir. Bu yalnız möminlərə məxsusdur. Sevinərkən Allah taalaya şükür edər və bu onun üçün xeyir olar. Başına zərərli bir iş gələrsə səbr edər və bu da onun üçün xeyirli olar"[2].***

Qədərə iman gətirməyən kimsə təkəbbürlü olar. Allahın ona verdiyi var-dövlətin, şan-şöhrətin və sairənin öz elmi və zəhməti ilə qazandığını iddia edər. Ona verilən nemətlərə hansınasa müsibət

---

[1] Təbərinin təfsir kitabı: 12\ 115-116.

[2] Müslim: 2\ 2295\ № 2999.

toxunduqda təlaşa düşər və həyatını vəl-vələ içərisində keçirər. Baş verən müsibətə görə səbirsizlik etdiyindən və peşmançılıq çəkdiyindən bu, özünə qəsd *(intihar)* etmək dərəcəsinə gəlib çata bilər. Bu gün biz bunun şahidiyik. Xüsusən də maddi durumları ən yüksək məqama yetişən ölkələrdə belə hallar daha çox müşahidə olunur.

Qədərə iman gətirmək, qüvvəsini və vaxtını sərf etməklə faydalı işlərə bağlanmağa kömək edir. İnsanın tənbəlliyini aradan qaldırır, həmçinin insanı təkəbbürlükdən uzaqlaşdırır. Quran, Sünnə və müsəlmanların həyatı göstərir ki, müsəlmanlar öz dinlərinə çox bağlandıqda qədərə bəslədikləri iman onları ciddi işlər görməyə həvəsləndirir, tənbəllik və acizlikdən uzaqlaşdırır. Şər işləri görərək, yaxud yaxşını tərk edərək qədəri bəhanə gətirmək müşriklərin adətlərindəndir. Allah taala müşriklərin bu əməlləri haqda buyurur:

﴿ سَيَقُولُ ٱلَّذِينَ أَشْرَكُواْ لَوْ شَآءَ ٱللَّهُ مَآ أَشْرَكْنَا وَلَآ ءَابَآؤُنَا وَلَا حَرَّمْنَا مِن شَيْءٍۚ كَذَٰلِكَ كَذَّبَ ٱلَّذِينَ مِن قَبْلِهِمْ ﴾.(الأنعام: ١٤٨)

**"Müşriklər belə deyəcəklər: "Əgər Allah istəsəydi, nə biz, nə də atalarımız müşrik olar və nə də biz bir şeyi haram edə bilərdik. Onlardan əvvəlkilər də *(öz peyğəmbərlərini)* belə təkzib etmişdilər..." (əl-Ənam: 148).**

Mömin isə özünə fayda verən işə həris olar və acizlik göstərməz. İstədiyinə nail olmaq üçün səbəblərdən istifadə etməklə Allah taalaya ümid bəsləyər. Amma qədəri bəhanə gətirməklə işi tərk etməz.

Gücünü sərf etdikdən sonra istədiyinə nail olmasa onda Allaha və Onun qədərinə ümid bağlayar. Allahın ona yazdığı istəyi ilə razılaşaraq belə deyər: Allahın qədəridir və Allah istədiyini etdi *(Qədərallahu və mə şaə fəələ)*.

Möminin bu hərəkəti Peyğəmbərin ﷺ buyurduğuna uyğundur:

قول النبي ﷺ: «المؤمن القوي خير وأحب الله من المؤمن الضعيف وفي كل خير، احرص على ما ينفعك، واستعن بالله، ولا تعجز، وإن أصابك شيء فلا تقل: لو أني فعلت كذا لكان كذا، ولكن قل: قدّر الله وما شاء فعل، فإن لو تفتح عمل الشيطان» رواه مسلم.

***"Allah yanında, güclü mömin zəif mömindən daha xeyirli və daha sevimlidir. Lakin hər ikisində də xeyir vardır. Sənə fayda verən işə həris ol. Allahdan kömək dilə və acizlik etmə. Başına bir iş gəldikdə: əgər belə etsəydim belə olardı - demə. "Allahın qədəridir və Allah istədiyini etdi" de. Çünki, "Əgər" demək şeytanın qapısını açır"[1].***

4. Mömin Allaha və Onun qəza-qədərinə iman gətirməklə qürur duyur. O, Allahdan başqa heç kəsin qarşısında əyilməz. Çünki ona fayda və ya zərər verə biləcək yalnız Allahdır. Bütün mülk onun əlindədir və Onun əmri olmadan heç nə baş verməz. Allah taala buyurur:

﴿ أَلَا لَهُ ٱلْخَلْقُ وَٱلْأَمْرُ ﴾ (الأعراف:٥٤)

**"Bilin ki, yaratmaq da, əmr etmək də Ona məxsusdur..." (əl-Əraf: 54).**

Yaradılanlar və əmrlər Onundur. Ondan başqa heç kəsin bunlarda bir payı yoxdur.

5. Müttəqiləri xoş aqibətin gözlədiyinə əmin olmaq. Allaha və Onun qədərinə iman gətirən möminin qəlbi buna tam inanır. O, qələbənin səbirlə olduğuna və çətinlikdən sonra rahatlığın mütləq gələcəyinə inanır. Həmişə çətinliyin olması qeyri mümkündür. Olan müsibətlər parça-parça olub dağılan

[1] Müslim: 4\ 2052\ № 2664.

buludlara, qaranlığı itən gecəyə bənzəyir. Haqq bir gün mütləq zühur edəcəkdir. Mömin bütün bunlara inanır. Ona görə də ümidsizlik qadağan edilmişdir. Allah taala buyurur:

﴿ وَلَا تَاْيْـَٔسُواْ مِن رَّوْحِ ٱللَّهِ ۖ إِنَّهُۥ لَا يَاْيْـَٔسُ مِن رَّوْحِ ٱللَّهِ إِلَّا ٱلْقَوْمُ ٱلْكَٰفِرُونَ ﴿٨٧﴾ ﴾ (يوسف:٨٧)

**"Allahın mərhəmətindən ümidinizi kəsməyin. Allahın mərhəmətindən yalnız kafirlər ümidini üzərlər!”" (Yusuf: 87).**

﴿ لَا تَدْرِى لَعَلَّ ٱللَّهَ يُحْدِثُ بَعْدَ ذَٰلِكَ أَمْرًا ﴿١﴾ ﴾ (الطلاق:١)

**"Nə bilirsən, ola bilsin ki, Allah bundan sonra bir iş icad etsin" (ət-Talaq: 1).**

﴿ كَتَبَ ٱللَّهُ لَأَغْلِبَنَّ أَنَا۠ وَرُسُلِىٓ ۚ إِنَّ ٱللَّهَ قَوِىٌّ عَزِيزٌ ﴿٢١﴾ ﴾ (المجادلة:٢١)

**"Allah *(lövhi-məhfuzda)*: “And olsun ki, Mən və peyğəmbərlərim qalib gələcəyik!” – deyə yazmışdır. Həqiqətən, Allah yenilməz qüvvət sahibi, qüdrət sahibidir!" (əl-Mucadələ: 21).**

6. Bəndə qədərə iman bəsləməklə, ona verilən ağılla xeyri şərdən ayırd etdiyini, xeyirli və ziyanlı işləri: doğrunu, yalanı, ədaləti, zülmü və s. - dərk edir. Həmçinin özünün istədiyi işi seçməkdə və onu icra etməkdə ixtiyar sahibi olduğunu da anlayır. Bununla yanaşı Allah taala bəndənin etdiyi əməllərinə görə onu məsuliyyətə cəlb etmiş, Öz mərhəmətindən peyğəmbərlərini göndərmiş, kitablarını nazil etmiş, ona xeyir və zərər verən hər bir şeyi açıqlamışdır. Sonra ona əmrlər buyurmuş və qadağalar qoymuşdur. Ondan kömək istəyənə kömək edəcəyini vəd etmişdir. Sonra insana istədiyini etmək üçün səbəblərdən götürməyi əmr etmişdir. Ona görə səbəbləri tərk edərək qədərə arxalanmaq olmaz.
7. Allah taala mömininin qədərinə yazdığı və insanın ixtiyarında olmayan müsibətlərlə razılaşmasını ona buyurmuşdur. Lakin Allah taalaya olan ibadəti tərk etmək və günah işlətməklə

razılaşmaq olmaz. Əksinə bəndə var gücü ilə ibadət etməli və günahlardan çəkinməlidir. Vacib ibadəti tərk etdikdə, yaxud günah işlətdikdə mütləq Allaha tövbə etməlidir. Tövbənin şərtlərindən biri isə etdiyi əmələ razı deyil, peşman olmaqdır.

8. Qəlblərdə olan xəstəliklərin: həsəd, paxıllıq, nifrət və s. – təmizlənməsi. Həqiqətən qədərə iman gətirən mömin, Allahın yeganə qüvvət sahibi və ruzi verən olduğunu bilir. Ona görə filankəsə ruzi verən, başqasını isə məhrum edən Odur. Əgər insan buna etiraz etsə, bilavasitə Allaha qəza və qədər məsələlərində etiraz etmiş olur.
9. Haqqı açıq-aşkar söyləmək və bu zaman cəsarətli olmaq. Heç bir kafir və ya müşrikdən qorxmamaq. Buna səbəb isə, Allaha və Onun qəza-qədərinə imanın qəlbə hakim edilməsi, Allaha tam arxayın olmaq, təvəkkül etmək və Onun yolunda başına gələn müsibətlərə səbr etməkdir. Çünki o, əcəlin və ruzinin Allahın əlində olmasına, bəndələrin isə Onun qarşısında acizliyinə inanır.
10. Qədərə iman insanı şücaətli olmağa təşviq edir. Çünki o, əcəlinin əvvəlcədən yazıldığına inanır. Ömür isə Allahın əlindədir və yalnız Onun yazdığı baş verəcəkdir. Beləliklə, insan hərtərəfli mühafizə edilir və Allahın onun qədərinə yazmadığı bir şey ona nə zərər, nə də xeyir verə bilməz. Belə olduqda, insan tam cəsarət və həvəslə Allah yoluna dəvət edir başlayır və ən yüksək işlərə asanlıqla nail olur. Çünki o, yalnız qədərdə olanların başına gələcəyinə inanır.

# Ikinci fəsil:
# İbadətlər: namaz, zəkat, oruc, həcc və Allah yolunda cihad baxımından İslamın gözəllikləri:

**İbadətlər və onların böyük təsiri:**

Əziz oxucu! ötən fəsildə İslamın əqidə baxımından olan gözəllikləri ilə tanış olduqdan sonra səni, İslamın ümumi məzmununa daxil olan ibadətlərlə tanış etmək istərdim. Bu fəsildə, İslam ibadətləri olan namaz, zəkat, oruc, həcc və cihad baxımından onun bir çox gözəlliklərini sənə təqdim edəcəyəm. Bu beş ibadət, imandan sonra İslam şəriətinin əsasını təşkil edir.

Allah taala bütün ibadətləri əzəmətli və hikmətli sirlər üzərində buyurmuşdur. İnsanlar bu sirlərin bəzilərini öyrənib bilir, digərlərini isə bilmirlər.

Allahın köməyi ilə deyilən ibadətlərin hər biri ilə qısa tanışlıqdan sonra, bir qədər onlarda olan İslam gözəlliklərini bir-bir nəzərdən keçirək.

## Birinci bölüm: Namaz qılmaq;

Namaz İslamın, şəhadət kəlməsindən sonra gələn ikinci əsasıdır. O, şəhadətdən sonra əqidənin sağlam və doğru olmasını, imanın qəlbə hakimliyini bildirən və onu təsdiq edən əməldir.

Şəriət terminalogiyasında namaz sözünün mənası: Təkbir ilə başlanıb salam ilə bitən xüsusi söz və hərəkətlərin toplusudur.

Namazın fərz *(vacib)* edilməsinin dəlilləri Quran, hədislər və alimlərin yekdil rəyləridir.

Bu haqda Quranda ayələr çoxdur. Məsələn, Allah taala buyurur:

﴿ فَأَقِيمُواْ ٱلصَّلَوٰةَ وَءَاتُواْ ٱلزَّكَوٰةَ وَٱعۡتَصِمُواْ بِٱللَّهِ هُوَ مَوۡلَىٰكُمۡۖ فَنِعۡمَ ٱلۡمَوۡلَىٰ وَنِعۡمَ ٱلنَّصِيرُ ٧٨ ﴾، (الحج: ٧٨)

**"Elə isə (vaxtlı-vaxtında) namaz qılın, zəkat verin və Allaha sığının. (Allah) sizin ixtiyar sahibinizdir. O nə yaxşı ixtiyar sahibi, necə də gözəl imdada yetəndir!" (əl-Həcc: 78).**

Hədislərdən dəlil: Peyğəmbər ﷺ buyurmuşdur:

«بني الإسلام على خمس: شهادة أن لا إله إلا اللّه وأنّ محمداً رسول اللّه، وإقام الصّلاة، وإيتاء الزّكاة، وصوم رمضان، والحج إلى بيت اللّه الحرام لمن استطاع إليه سبيلاً». رواه البخاري في صحيحه ومسلم.

*"İslam beş əsas üzərində qurulmuşdur: Allahdan başqa ibadətə layiq haqq məbud olmadığına və Məhəmmədin Allahın peyğəmbəri olmasına şəhadət vermək, namaz qılmaq, zəkat vermək, Ramazan ayında oruc tutmaq və imkan olduqda Beytülhərəmə (Kəbəyə) həcc etmək"[1].*

---

[1] Buxari: 1\ 49\ № 8. Müslim: 1\ 45\ № 16.

İslam alimləri namazın İslamın beş əsasından biri olaraq fərz olmasını yekdilliklə qeyd edirlər.

Namazın çox böyük faydaları və gözəllikləri vardır və onları sayıb qurtarmaq mümkün deyildir. Namazın ən əhəmiyyətli və ən gözəl faydalarından bunları göstərmək olar:

1. Namaz insanın qəlbini təmizləyir və nəfsinə rahatlıq verir, onu, günahlardan və asilikdən qoruyur. Allahın qəzəbinə səbəb olan hər bir əmələ qarşı nifrət oyadır. Bu haqda Allah taala buyurur:

﴿ ٱتْلُ مَآ أُوحِىَ إِلَيْكَ مِنَ ٱلْكِتَـٰبِ وَأَقِمِ ٱلصَّلَوٰةَ ۖ إِنَّ ٱلصَّلَوٰةَ تَنْهَىٰ عَنِ ٱلْفَحْشَآءِ وَٱلْمُنكَرِ ۗ وَلَذِكْرُ ٱللَّهِ أَكْبَرُ ۗ وَٱللَّهُ يَعْلَمُ مَا تَصْنَعُونَ ﴿٤٥﴾ ﴾ (العنكبوت:٤٥)

"*(Ya Rəsulum!)* **Quranda sənə vəhy olunanı oxu və** *(vaxtı-vaxtında)* **namaz qıl. Həqiqətən, namaz** *(insanı)* **çirkin və pis əməllərdən çəkindirər. Allahı zikr etmək** *(Allahın cəlalını və əzəmətini həmişə, hər yerdə yada salmaq)*, **şübhəsiz ki,** *(savab etibarilə bütün başqa ibadətlərdən)* **daha böyükdür. Allah nə etdiklərinizi** *(bütün yaxşı və pis əməllərinizi)* **bilir!" (əl-Ənkəbut: 45).**

2. Namaz, bəndə ilə Rəbbi arasında bağlılıq yaradır. Çünki bəndə hər zaman Rəbbinə möhtacdır. O, namaz vaxtı Allaha həmd səna *(əlhəmdulilləh)*, təkbir *(Allahu əkbər)*, təsbih *(Sübhənallah)* edir və ayələrini oxuyur. Onun qarşısında baş əyir, qiyamda, rükuda və səcdədə onu xatırlayır və Ona dua edib istədiyini diləyir, günahlarının bağışlanmasını istəyir. Beləliklə o, gün ərzində beş dəfə Rəbbi ilə bağlanır. Namazda onun nəfsi rahatlanır, Allaha daha yaxın olur və Allah yanında dərəcəsi artır. Bütün bunlara yalnız namaz qılmaqla nail olmaq mümkündür.

3. Namaz, Allaha tam itaətkarlığı *(ubudiyyəti)* dəqiq və açıq nümayiş etdirməkdir. Bəndənin qiyamı, rükusu, səcdəsi, Quran oxuması, zikr etməsi və Allaha həmd səna deməsi bəndənin nəfsində tam və doğru itaətkarlıq *(ubudiyyət)* yaradır. Namazın

ən əzəmətli gözəlliyi, bəndəni böyük şərəfə - Allaha, Onun sevdiyi tərzdə tam itaətə *(ubudiyyətə)* - nail etməsidir.

4. O, göz işığı və nəfs rahatlığı, İslamın rəmzi və imanın əlamətidir. Namaz, müsəlman ilə kafir arasında fərqdir. Bu haqda hədislərin birində belə buyurulur:

«العهد الذي بيننا وبينهم الصّلاة فمن تركها فقد كفر» . رواه النسائي في سننه والترمذي في سننه وابن ماجة، وقال الترمذي: هذا حديث حسن صحيح غريب.

***"Bizimlə onlar (kafirlər) arasında olan fərq, namazdır. Kim onu tərk etsə artıq küfr etmiş olar"[1].***

وكان رسول الله ﷺ إذا حزبه أمر قام إلى الصّلاة. رواه أبو داود في سننه، وإسناده حسن. صحيح الجامع للألباني.

***Peyğəmbər ﷺ bir işdən kədərləndikdə və ürəyi sıxıldıqda namaz qılardı[2].***

Həmçinin Bilala ؓ:

ويقول لبلال ؓ: «أقم الصّلاة أرحنا بها»، رواه أبو داود في سننه، وإسناده حسن. صحيح الجامع للألباني.

***"Namaz üçün iqamə ver və bizi onunla rahat et!"[3].***

Peyğəmbərin ﷺ böyük səbrə, gücə və iradəyə malik olmasına baxmayaraq rahatlığı yalnız namazda tapaır və hətta belə buyurardı:

---

[1] Nəsai: 1\ 250\ № 462. Tirmizi: 5\ 15\ № 2621. İbn Macə: 1\ 342\ № 1079. Tirmizi bu hədisin səhih, həsən və qərib olduğunu demişdir.

[2] Əbu Davud: 2\ 78\ № 1319. Hədisin isnadı həsəndir *(yəni, qəbul ediləndir).* Albaninin "Səhihul Cami" kitabı № 4703.

[3] Əbu Davud: 5\ 262\ № 4986. Isnadı həsəndir *(yəni, qəbul ediləndir).* Albaninin "Səhihul Cami" kitabı № 7892.

كان يقول ﷺ: «وجعل قرة عيني في الصّلاة» . رواه النسائي في سننه وقال ابن حجر في تلخيص الحبير: وإسناده حسن.

*"Mənim gözümün işığı namazdadır"*[1].

5. Namaz, Allahın bəndəyə bəxş etdiyi saysız-hesabsız nemətlərə görə, Ona şükür etməyin açıq-aşkar nişanəsidir. Ona görə də Peyğəmbər ﷺ dabanları çatlayana qədər namazda dayanardı. Ondan belə etməsinin səbəbini soruşduqda buyurmuşdur:

كان النبي ﷺ يقوم حتى تتفطر قدماه، فلما روجع في ذلك قال: «أفلا أكون عبدا شكورا» رواه البخاري في صحيحه ومسلم.

*"Bəs şükür edən bəndələrdən olmayım?"*[2]. Buna əsasən demək olar ki, kim namaz qılırsa Allaha şükür etdiyini göstərir. Namaz qılmayan bəndə isə ona bəxş edilən nemətlərə görə Allaha naşükürlük edir. Gecə-gündüz nemət verilən bəndə Allaha şükür etmək, Onun qarşısında baş əymək və verilən nemətləri etiraf etmək əvəzinə Ona küfr edirsə, o necə də pis və əxlaqsız bəndədir.

6. Namaz, öz sahibi üçün nurdur və o, bəndənin qəlbini işıqlandırır. Beləliklə, onun əlamətləri üzdə görünür və əzalara təsir edir. Peyğəmbər ﷺ buyurmuşdur:

قال رسول الله ﷺ «الطّهور شطر الإيمان، والحمد لله تملأ الميزان، وسبحان الله والحمد لله تملآن ما بين السماوات والأرض، والصّلاة نور، والصّدقة برهان، والصّبر

---

[1] Nəsai: 7\ 72\ № 3949. Ibn Həcər "ət-Təlxisul Həbir" kitabı (3\ 116)-da, hədisin isnadının həsən olduğunu demişdir.

[2] Buxari: 8\ 584\ № 4836. Müslim: 4\ 2171\ № 2819.

رواه مسلم.

*"Təmizlik imanın yarısıdır, əlhəmdulilləh (deməк) tərəzini doldurur, sübhənallah və əlhəmdulillah göylər və yerin arasını doldurur. Namaz nurdur, sədəqə dəlildir, səbir işıqdır, Quran isə sənin lehinə və ya əleyhinə olan dəlildir. Bütün insanlar evindən çıxır. Onların bəziləri öz nəfsini satın alır və azad olur, digərləri isə öz nəfsini həlak edir"[1].*

7. Namaz, günahların bağışlanmasına və dərəcələrin yüksəlməsinə səbəb olur. Allah taala buyurur:

﴿ وَأَقِمِ ٱلصَّلَوٰةَ طَرَفَيِ ٱلنَّهَارِ وَزُلَفًا مِّنَ ٱلَّيۡلِۚ إِنَّ ٱلۡحَسَنَٰتِ يُذۡهِبۡنَ ٱلسَّيِّـَٔاتِۚ ذَٰلِكَ ذِكۡرَىٰ لِلذَّٰكِرِينَ ١١٤ ﴾، (هود: ١١٤)

"*(Ya Rəsulum!)* **Namazı gündüzün iki başında** *(günortadan əvvəl və sonra, yəni səhər, günorta və gün batan çağı və ya günün iki başında, yəni səhər-axşam)* **və gecənin** *(gündüzə yaxın)* **bəzi saatlarında** *(axşam və gecə vaxtı)* **qıl. Həqiqətən,** *(beş vaxt namaz kimi)* **yaxşı əməllər pis işləri** *(kiçik günahları)* **yuyub aparar. Bu,** *(Allahın mükafatını və cəzasını)* **yada salanlara öyüd-nəsihətdir** *(xatırlatmadır)*." **(Hud: 114).**

Peyğəmbər ﷺ isə buyurmuşdur:

وقال الرسول الله ﷺ «الصلوات الخمس، والجمعة إلى الجمعة، كفارة لما بينهن، ما لم تغش الكبائر» . رواه مسلم.

---

[1] Müslim: 1\ 203\ № 223.

***"Beş vaxt namaz və bir cümə digər cüməyə qədər olan (kiçik) günahlara kəffarədir (bağışlanmadır). Böyük günahlar istisnadır"[1].***

8. Namaz, Allahın bəndələrinə olan böyük və geniş mərhəmətini bildirir. Çünki O, namazı gün ərzində beş vaxt vacib etmiş və onu günün vaxtlarına bölmüşdür. Namazların həmin vaxtlara bölünməsi özü bir gözəllikdir. Bəndə gün ərzində müxtəlif vaxtlarda Rəbbi ilə bağlaşır. Beləliklə, insan namaz vasitəsi ilə günün hər hissəsində özündən şəri dəf edir, günahlarının bağışlanmasına və dərəcəsinin yüksəlməsinə nail olur.
9. Bəndə namazla Allah yanında çox əzəmətli savablar qazanır. Əgər bir insan əlli il yaşasa və hər gün beş vaxt namaz qılsa onun qıldığı namazların sayı doxsan min *(90000)* namaz edər. Qiyamət günü bu qədər böyük sayda namaz ilə Allah hüzuruna gələn bəndə etdiyi hər savab əməlin on qatdan yeddi yüz qata qədər savabını alacaqdır. Belə insan qiyamət günü necə də sevincək və xoşbəxtdir. Elə bu baxımdan da müsəlman insan namazın ən böyük gözəllik, Allah taalanın mərhəməti olduğunu dərk edir və həmçinin onu bu namazlarla Öz mərhəməti və cənnətinə qovuşduracağına inanır.
10. Namaz, İslamın beş əsasını özündə cəm edir. Çünki, namazın sonunda təşəhhüd deyilir. Həmçinin namaz gündəlik zəkatdır. Namaz qılan adam vaxtının bir hissəsini namaz qılmağa sərf edir. Zəkat mal-dövləti təmizlədiyi kimi, namaz da vaxtı, insanın etdiyi günahları təmizləyir. Hədislərin birində Peyğəmbər ﷺ buyurur:

قال ﷺ «أرأيتم لو أن نهراً بباب أحدكم يغتسل فيه كل يوم خمساً، ما تقول ذلك يبقى من درنه؟» قالوا: «لا يبقى من درنه شيئاً، قال: فكذلك مثل الصّلوات الخمس يمحو الله به

---

[1] Müslim: 1\ 209\ № 233.

***"Əgər birinizin evi qarşısından çay axarsa və o həmin çayda gündə beş dəfə çimərsə, heç onda çirkdən əsər-əlamət qalarmı?! Orada olanlar dedilər: xeyr, onda çirkdən əsər-əlamət qalmaz. Peyğəmbər ﷺ buyurdu: "Beş vaxt namaz da belədir. Allah taala bu namazlarla insanın günahlarını bağışlayar"[1].***

Bu baxımdan, çox ayələrdə namazın zəkat ilə birlikdə qeyd edilməsinin hikməti bəlli olur. Namaz əmr edildikdən sonra zəkat əmr olunur. Belə ayələr çoxdur misal olaraq bu ayəni demək olar. Allah taala buyurur:

﴿ فَأَقِيمُواْ ٱلصَّلَوٰةَ وَءَاتُواْ ٱلزَّكَوٰةَ ﴾، (الحج: ٧٨)

**"Elə isə *(vaxtlı-vaxtında)* namaz qılın, zəkat verin..." (əl-Həcc: 78).**

Həmçinin namaz xüsusi söz və hərəkətlərdən ibarətdir ki, bu da insanın nəfsini əlavə söz və hərəkətlər etməkdən imtina etdirir. Eləcə də oruc insanı yemək və içməkdən imtina etdirir. Namaz qılan insan namazda üzünü Kəbəyə tərəf yönəldir. Bu haqda Allah taala buyurur:

﴿ قَدۡ نَرَىٰ تَقَلُّبَ وَجۡهِكَ فِي ٱلسَّمَآءِۖ فَلَنُوَلِّيَنَّكَ قِبۡلَةٗ تَرۡضَىٰهَاۚ فَوَلِّ وَجۡهَكَ شَطۡرَ ٱلۡمَسۡجِدِ ٱلۡحَرَامِۚ وَحَيۡثُ مَا كُنتُمۡ فَوَلُّواْ وُجُوهَكُمۡ شَطۡرَهُۥ ﴾، (البقرة: ١٤٤)

**"*(Ya Rəsulum!)* Biz sənin üzünün göyə tərəf çevrildiyini görürük, ona görə də səni razı olduğun qibləyə tərəf döndərəcəyik. İndi üzünü Məscidülhərama tərəf çevir! *(Ey müsəlmanlar!)* Harada olsanız *(namaz vaxtı)* üzünüzü oraya döndərin!..." (əl-Bəqərə: 144).**

[1] Buxari: 2\ 11\ № 528. Müslim: 1\ 462-463\ № 667.

Bəndənin namaz qılarkən üzünü Kəbəyə tərəf yönəltməsi, onu müqəddəs sayması və ona təzim etməsi İslamın əsaslarından biri olan həcc ilə əlaqələnir.

11. Namaz, nəfsi Allah taalaya itaətkar olmaq yönündə tərbiyələndirir. Namazın insan nəfsinə gətirdiyi Allah qorxusu, məhəbbət və sevgisi, bəndəyə ibadətin əxlaqi qaydalarını, rübubiyyətin vacib əməllərini öyrədir.
12. Namaz, müsəlmanlar arasında birlik və mehribançılıq əlamətidir. Müsəlmanların namaz vaxtı hamılıqla bir istiqamətə - Kəbəyə tərəf yönəldiklərini gördükdə insanı birlik və məhəbbət duyğuları çulğayır, bütün müsəlmanların Allahın qulları olduqlarını görür, o, müsəlmanların Rəbbi, qibləsi və dininin bir, varlı ilə kasıb, şərəfli ilə sıravi müsəlman arasında heç bir fərq olmadığının şahidi olur. Həmçinin namaz qılarkən düz qibləyə tərəf yönəlmək insana hər işdə ədalətli və hikmətli olmağı öyrədir. Bir müsəlmana digər qardaşının ağrı-acısına şərik olmağı tərbiyə edir. Həmçinin namaz qılan bəndə cəmiyyətin fəal üzvünə çevrilir. Namaz ona öz vaxtını tənzimləməyi və vədini zamanında yerinə yetirməyi öyrədir. Camaat namazlarında imamın arxasında dayanıb ona tabe olması bəndəyə digər işlərində də itaətkar olmasını aşılayır.

Ümumiyyətlə namazın gözəllikləri həddindən artıq çoxdur və onları sayıb qutarmaq mümkün deyil. Amma dediklərimiz ibrət götürənlər üçün kifayətdir.

## Ikinci bölüm: Zəkat vermək:

Zəkat, İslamın üçüncü əsasıdır.

Zəkatın şəriət terminalogiyasında mənası: Allahın razılığını qazanmaq, nəfsi, cəmiyyəti və mal-dövləti təmizləmək üçün, xüsusi mala müəyyən vaxtda təyin edilmiş vacib haqdır.

Bu tərif, zəkatın İslamda ən əhəmiyyətli hədəflərini əhatə edir. Zəkatın digər hədəfləri də mövcuddur. Onları saymaqla bitirmək mümkün deyildir. Həmin hədəflərin bəziləri insanla bağlıdır, digərləri isə ən yüksək əxlaq nümunələridir. İslam bunların hamısını nəzərə almış və zəkatı vacib etmişdir.

Zəkatın ən önəmli gözəlliklərindən aşağıdakıları demək olar.

1. Allah taala şəriətin çoxsaylı dəlillərində zəkatı namaz ilə bərabər xatırlatmışdır. Bu, onu göstərir ki, insanın nicat tapması bu iki əsasdan asılıdır. Namaz, Allahın qulunun öz vücuduna aid vacib buyurduğu haqq olduğu kimi, zəkat da Allahın insanın mal-dövlətinə və qazancına vacib buyurduğu haqdır. Insan özünün yaradılmasının şükürünü namaz ilə ödədiyi kimi, zəkatla da ona verilən mal-dövlətin şükürünü ödəyir.
2. Zəkat, paxıllığın, xəsisliyin və tamahkarlığın dərmanıdır. O, belə pis xəstəliklər üçün ən gözəl müalicə üsuludur. İslam şəriəti insanın yaradılışında mal-dövlətə olan sevgini və nəfslərdə olan paxıllığı nəzərə almışdır. Bu haqda Allah taala buyurur:

﴿ وَأُحْضِرَتِ ٱلْأَنفُسُ ٱلشُّحَّ ﴾، (النساء: ١٢٨)

**"Ancaq nəfslərdə xəsislik (qısqanclıq) həmişə mövcuddur...." (ən-Nisa: 128).**

Allah taala bunların hamısını ən gözəl üsulla, mənəvi yolla: təşviq və müjdə yolu ilə müalicə edir. Xəsis nəfsi ən sevimli və istəkli maldan xərcləməyə çağırır. Bu haqda Allah taala buyurur:

﴿ لَن تَنَالُواْ ٱلْبِرَّ حَتَّىٰ تُنفِقُواْ مِمَّا تُحِبُّونَ ﴾، (آل عمران: ٩٢)

**"Sevdiyiniz şeylərdən (haqq yolunda) sərf etməyincə savaba çatmazsınız. ..." (Ali İmran: 92).**

Rəbbinin bu çağırışlarını eşidən müsəlman bəndə Onun çağırışına cavab verir və ən istəkli şeylərdən Allah yolunda xərcləyir. Beləliklə də müsəlman dərin hissiyatdan doğan əliaçıqlığa və yaxşılığa adət edir.

3. Zəkat, ən gözəl əxlaq nümunəsidir. O insanı səxavətli edir və paxıllıq kimi pis sifətlərdən uzaqlaşdırır.
4. Zəkat, cəmiyyətdə yaşayan fərdlər arasında mənəvi bağlılıqlar yaradır. Zəkat verən müsəlman özünü cəmiyyətin tam üzvü hesab edir. O, cəmiyyət qarşısında üzərinə düşən vacib işləri yerinə yetirir və çətinliklərə üzləşir. Belə olduqda cəmiyyət mehriban bir ailəyə çevrilir. Bu isə Peyğəmbərin ﷺ buyurduğu kəlməni təsdiqləyir:

لقول الرسول ﷺ «مثل المؤمنين في توادهم وتراحمهم وتعاطفهم كمثل الجسد الواحد إذا اشتكى منه عضو تداعى له سائر الجسد بالسهر والحمى» . رواه البخاري في صحيحه ومسلم.

***"Möminlər öz aralarında şəfqət, mərhəmət və əlaqələrinə görə bir vücuda bənzəyirlər. Həmin vücudun hər hansı bir əzası ağrıdıqda digər əzalar da onun ağrısına qızdırma və yuxusuzluqla səs verərlər"[1].***

5. Zəkat, İslam qardaşlığından və müsəlman əxlaqından xəbər verən əməli ifadədir. Həmçinin zəkat kasıb insanı cəmiyyət arasında paxıllıq və həsəddən uzaq edir. Çünki onun haqqı varlı adamın malında mühafizə edilir. Ona görə də kasıb müsəlmanın

[1] Buxari: 10\ 438\ № 6011. Müslim: 4\ 1999\ № 2586.

varlı müsəlmanı sevdiyinin, onun üçün dua etdiyinin şahidi olursan. Peyğəmbər ﷺ buyurmuşdur:

يقول رسول الله ﷺ: «المؤمن للمؤمن كالبنيان يشد بعضه بعضاً». رواه البخاري في صحيحه ومسلم.

*"Mömin mömin üçün bir binanın divarı kimidir. Onlar bir-birlərini möhkəm saxlayarlar"[1].*

Həyatlarını maddəyə əsaslanan mənəviyyat üzərində qurmuş cəmiyyətlərin həyat tərzinə baxsan, onların yaşayışının paxıllıq, nifrət, oğurluq, soyğunçuluq, qətl və s. ilə dolu olduğunu görərsən.

***Zəkat verən müsəlman həyatı*** yaşayan cəmiyyətlərə nəzər salsan, orada məhəbbət, ülfət, şəfqət, xeyir, xoşbəxtlik və s. kimi gözəl məziyyətlərin şahidi olarsan. Bütün bunlar İslamın əzəmətli əsası olan zəkatı həyata keçirməklə mümkün olmuşdur.

6. Zəkat, əmin-amanlıq və rahatlıq mənbəyidir. Zəkat, İslam şəriətində Allahın lütfündən sonra, imkansızlar üçün ikinci ictimai zəmanətdir. Həmçinin o, cəmiyyəti parçalanmadan və dağılmadan qoruyur. O, ictimai bir sığortadır. Çünki zəkat, Allahın izni ilə kasıblığın, aclığın və xəstəliyin qarşısını alan bir vasitədir. Kasıb insan zəkatda olan payına arxayın olaraq öz həyatını davam etdirir və böyük ümidlərlə yaşayır.
7. Zəkat, insanı ciddiliyə və işgüzarlığa səsləyir. Mal-dövlət sahibkarlığının bir hissəsinin kasıblara, yoxsullara, miskinlərə, zəkatı yığıb paylayanlara, ürəkləri müsəlmanlığa isinişib bağlanmaqda olanlara, həmçinin borcu ödəməyə imkanı olmayan borclulara və başqalarına nəql edilməsi onları işgüzarlığa və cəmiyyətə qarşı mehriban olmağa çağırır.

[1] Buxari: 10\ 449-450\ № 6026. Müslim: 4\ 1999\ № 2585.

Beləliklə, onların cəmiyyətə dəyən xeyirləri artır və cəmiyyət təkmilləşər.

8. Zəkat, yoxsulluğa qarşı aparılan ən gözəl və ən səmərəli mübarizə üsuludur. Buna sübut olaraq İslam şəriətinin bu qanununun ciddi olaraq tətbiq edildiyi qızıl əsrlərə nəzər salmaq kifayətdir. Həmin zamanlar müsəlmanlar arasında zəkat veriləcək kasıb adam qalmamışdı. Zəkat çıxarmaq istəyən bir müsəlman zəkat malını əlində gəzdirir və onu verəcək kasıb insan tapmırdı. Bu açıq-aşkar dəlildir ki, əgər zəkat həqiqi surətdə tətbiq edilsə və onun təşkilatçılığı təmin edilsə, onda onun yoxsulluğa necə son qoyduğunun şahidi olarıq.

## Üçüncü bölüm: Oruc tutmaq:

Şəriət terminaloğiyasında orucun mənası: "Müəyyən vaxtda, müəyyən adam tərəfindən xüsusi şeylərdən niyyət edərək özəl şərtlərlə imtina etməkdir".

Oruc tutmaq şəriətin zəruri qanunlarından və İslamın əsaslarından biridir. Quran, hədislər və alimlərin yekdil rəylərində orucun vacib olmasına dair kifayət qədər dəlillər mövcuddur.

Allah taala Quranda buyurur:

﴿ يَٰٓأَيُّهَا ٱلَّذِينَ ءَامَنُواْ كُتِبَ عَلَيۡكُمُ ٱلصِّيَامُ كَمَا كُتِبَ عَلَى ٱلَّذِينَ مِن قَبۡلِكُمۡ لَعَلَّكُمۡ تَتَّقُونَ ١٨٣ ﴾، (البقرة: ١٨٣)

***"Ey iman gətirənlər! Oruc tutmaq sizdən əvvəlki ümmətlərə vacib edildiyi kimi, sizə də vacib edildi ki, (****bunun vasitəsilə****) siz pis əməllərdən çəkinəsiniz!" (əl-Bəqərə: 183).***

Hədislərdən dəlil: Peyğəmbər ﷺ buyurmuşdur:

قال رسول الله ﷺ: «بني الإسلام على خمس: شهادة أن لا إله إلا الله وأن محمداً رسول الله، وإقام الصلاة، وإيتاء الزكاة، وصوم رمضان، وحج بيت الله الحرام لمن استطاع إليه سبيلاً» . سبق تخريجه

***"İslam beş əsas üzərində qurulmuşdur: Allahdan başqa ibadətə layiq haqq məbud olmadığına və Məhəmmədin Allahın peyğəmbəri olmasına şəhadət vermək, namaz qılmaq, zəkat vermək, Ramazan ayında oruc tutmaq və imkan olduqda Beytülharama (Kəbəyə) həcc etmək"[1].***

[1] Buxari: 1\ 49\ № 8. Müslim: 1\ 45\ № 16.

İslam alimləri orucun İslamın beş əsasından biri olaraq vacibliyini yekdilliklə qeyd edərək deyirlər: "kim orucun vacib olmasını inkar edərsə, artıq küfr etmiş sayılır".

Orucun çox böyük faydaları və gözəllikləri vardır və onları sayıb qurtarmaq mümkün deyildir. Orucun ən əhəmiyyətli və ən gözəl faydalarından bunları göstərmək olar:

1. Oruc, təqvalı olmaq *(Allah rizasına, Onun buyurduğu qadağalardan, günahlardan çəkinmək və əmrləri yerinə yetirmək)* üçün bir vasitədir. Allah taala buyurur:

﴿ يَٰٓأَيُّهَا ٱلَّذِينَ ءَامَنُواْ كُتِبَ عَلَيۡكُمُ ٱلصِّيَامُ كَمَا كُتِبَ عَلَى ٱلَّذِينَ مِن قَبۡلِكُمۡ لَعَلَّكُمۡ تَتَّقُونَ ١٨٣ ﴾، (البقرة: ١٨٣)

**"Ey iman gətirənlər! Oruc tutmaq sizdən əvvəlki ümmətlərə vacib edildiyi kimi, sizə də vacib edildi ki, (bunun vasitəsilə) siz pis əməllərdən çəkinəsiniz! (təqvalı olasınız)" (əl-Bəqərə: 183).**

Alimlər deyirlər ki, ayədə deyilən: "***çəkinəsiniz***" - sözü vacib məna daşıyır. Yəni, əgər siz oruc tutsanız o zaman təqva sahibi olacaqsınız. Təqva isə bəndənin ən gözəl və ən əzəmətli qazancı sayılır.

2. Oruc, Allahın insana verdiyi nemətlərə şükür etməkdir. Bu zaman nəfs yemək, içmək və şəhvətdən imtina edir. İmtina edilən bu əməllər ən gözəl nemətlər sayılır. Onları bir müddət tərk edən adam onların qədir-qiymətini daha yaxşı bilir. Çünki nemətlərin qədrini onlar tükəndikdən sonra bilmək olur. Oruc isə insanı verilən nemətlərə şükür etməyə vadar edir. Nemətlərə şükür etmək ağıl və şəriət baxımından vacibdir. Allah taala oruc tutmaqla verilən nemətlərə şükür etməyə bu ayələrdə işarə etmişdir:

﴿ لَعَلَّكُمْ تَشْكُرُون ﴾

**"...Ona şükür edəsiniz" (əl-Bəqərə: 185).**

3. Oruc tutmağın daha bir gözəlliyi nəfsi sındırmaq və şəhvətini idarə etməkdir. Çünki nəfs tox olanda təmənnalı olur, ac olanda isə artıq şeylərdən gözünü çəkir. Ona görə Peyğəmbər ﷺ cavanlara müraciət edərək buyurmuşdur:

قال الرسول ﷺ وهو يخاطب الشباب: «من استطاع منكم الباءة فليتزوج، ومن لم يستطع فعليه بالصوم فإنه له وجاء» . رواه البخاري في صحيحه ومسلم.

*"Kimin evlənməyə imkanı varsa evlənsin. İmkanı olmayanlar oruc tutsunlar. Çünki oruc tutmaq onun dərmanıdır"*[1].

Belə ki, oruc tutmaq günahlardan çəkinmək üçün bir vasitədir.

4. Oruc, insanın iradəsini gücləndirir, ona səbirli olmağı öyrədir və zehninin təmizlənməsinə kömək edir. Müsəlmanın güclü iradəyə böyük ehtiyacı vardır. O, Ramazan ayında şiddətli aclıq və susuzluğa səbir etməklə öz güclü iradəsini göstərir. Oruc olduğu halda belə iradə nümayiş etdirən şəxs, iftar etdikdən sonra da həmin iradəsini qorumaq üçün iradəsinə zidd olan əməllərdən çəkinər və beləliklə, onu mühafizə edər. Güclü iradəyə sahib olan şəxs çox asanlıqla pisə pis, yaxşıya yaxşı deyə bilir. Cəmiyyətin hər acısına davam gətirir. Beləliklə cəmiyyətin fəal üzvlərindən biri olur.

5. Oruc, insana gözəl əxlaq bəxş etdirir. Oruc tutmaq elə bir məktəbdir ki, oructutanlar orada ən gözəl əxlaq nümunələrinə yiyələnirlər. Həmin nümunələr: təqva, yaxşılıq, əliaçıqlıq, birlik, şəfqət, məhəbbət, səbir və s. bu kimi gözəl xasiyyətlərdir.

   Oruc, oructutanlarda rəqabət hissi oyadır. Oruc tutmuş insan şəriətə zidd olan hərəkətlər etməmək üçün öz əməllərini ciddi

[1] Buxari: 6\ 106\ № 5065. Müslim: 2\ 1018\ № 1400.

nəzarət altında saxlayır. Oruc, insanı daxildən tənzim etdiyi üçün, o öz əməllərində şəriətə zidd olan hərəkətlərə yol vermir.

Heç ola bilərmi ki, oruc tutan Allah yanında sadiq, insanlar arasında isə yalançı olsun?

Heç ola bilərmi ki, orucunu xalis Allah üçün tutsun, sonra cəmiyyət arasında ikiüzlülük göstərsin, xəyanət etsin, aldatsın və ya hiyləgər olsun?

Ona görə oruc, ən gözəl əxlaq mənbəyi sayılır. Allah taala da Qurani Kərimdə bu mənaya işarə edərək buyurmuşdur:

﴿لعلكم تتقون﴾ (سورة البقرة:١٨٣) .

**"...(bunun vasitəsilə) siz pis əməllərdən çəkinəsiniz! *(təqvalı olasınız)*" (əl-Bəqərə: 183).**

Alimlərdən biri buyurur: "Orucun zahiri əzaları və daxili gücü onları məhv edəcək amillərdən qorumaqda çox böyük təsiri vardır. Oruc, ürək və digər əzaların sağlamlığını qoruyur. Ehtirasların ondan oğurladıqlarını geri qaytarır. Oruc, təqva üçün ən böyük dayaqdır".

6. Oruc, İslam ümmətinin: varlı ilə kasıbının, rəhbər ilə sıravisinin, böyük ilə kiçiyinin, kişi ilə qadınının, - birliyini nümayiş etdirən zahiri amillərdən biridir. Hamı oruc tutur, Allahdan günahlarının bağışlanmasını diləyir, eyni vaxtda hamı yemək içməkdən imtina edir və eyni vaxtda da iftar edirlər. Gün ərzində orucla əlaqədar bütün ibadətlərdə, o cümlədən aclıq və məhrumiyyətdə də hamı bərabər olur.

Oruc, oructutanlar arasında bir növ onların hədəflərini və istəklərini birləşdirir və onların arasında vəhdət yaradır. Bu həqiqi birlik böyük və sadiq birlikdən xəbər verir. O birlik, ölkəsindən, cinsindən və irqindən asılı olmayaraq bütün İslam ümmətinin birliyidir. Əgər bunun həqiqətini bilmək və görmək istəyirsənsə əl-Haram məscidində iftar zamanı yaranan

mənzərəyə tamaşa et. Bu zaman minlərlə insanın bir saniyə ərzində iftar etdiyini görərsən. Bundan daha aydın birlik nə ola bilər?!.

7. Orucun insan səhhətinə də çox xeyri vardır. Oruc, insanın bədən hüceyrələrini yeniləməklə onun həyatını təzələyir. Həmçinin zərərli hüceyrələr bədəndən ifraz edilir, mədə və həzm orqanları rahatlanır. Yemək və içməyin tərk etdiyi artıq turşular, qidalar və qalıqlar hamısı ifraz edilir. Tibb alimləri orucun çoxlu xeyirlərini sadalamaqdadırlar. Məsələn, onlar deyirlər: oruc insan bədəninə daxil olmuş artıq rütubəti qoruyur və mədəni, qarın nahiyəsinin törətdiyi zəhərlərin fəsadından təmizləyir, daxili orqanlarda piylənmənin qarşısını alır. Əks halda bunlar, ürək üçün çox təhlükəli olan xəstəliklərdir. Oruc insanı cıdıra çıxarılan at kimi fəal və gümrah edir.

## Dördüncü bölüm: Həccə getmək:

Həcc sözü şəriət termini kimi xüsusi əməllərin adı, yaxud Kəbəni və *(həccə aid olan)* müəyyən yerləri xüsusi tərzdə ziyarət etməkdir.

Həcc, İslamın beş əsasından biri və onun əzəmətli vacib əməllərindəndir. Həccin vacib olması haqda Quranda, hədislərdə və alimlərin buyurduqları kəlamlarda bir çox sübutlar mövcuddur. Yetkinlik yaşına çatmış hər kəsə ömürdə bir dəfə həcc etmək vacibdir.

Həccin vacibliyinə aid Qurandan olan sübut: Allah taala buyurur:

﴿ وَلِلَّهِ عَلَى ٱلنَّاسِ حِجُّ ٱلۡبَيۡتِ مَنِ ٱسۡتَطَاعَ إِلَيۡهِ سَبِيلٗاۚ وَمَن كَفَرَ فَإِنَّ ٱللَّهَ غَنِيٌّ عَنِ ٱلۡعَٰلَمِينَ ٩٧ ﴾، (آل عمران: ٩٧)

***"Onun yoluna (ərzaq, minik, və sağlamlıq baxımından) gücü çatan hər bir kəsin həccə gedib o evi ziyarət etməsi insanların Allah qarşısında borcudur. Kim bunu (bu borcu) inkar edərsə (özünə zülm etmiş olar). Əlbəttə, Allah aləmlərə (heç kəsə) möhtac deyildir!" (Ali İmran: 97).***

Ayə, həccin vacib olmasına açıq-aşkar sübutdur. Ayədə: "***Allah qarşısında borcudur...***" sözü, həccin vacib olmasına dəlildir. Alimlər deyirlər ki, həccin bu söz üslubu ilə vacib edilməsi, onun əhəmiyyətli vacibatlardan olmasını bildirir.

Həccin vacib olmasına aid hədislərdən dəlil:

Əbu Hüreyrə ﵁ deyir: Bir gün Peyğəmbər ﷺ bizə müraciət edərək buyurdu:

خطبنا رسول الله ﷺ فقال: «أيها الناس قد فرض الله عليكم الحج فحجوا فقال رجل: أكل عام يا رسول الله؟ فسكت حتى قالها ثلاثاً، فقال رسول الله ﷺ: لو قلت

رواه مسلم.

*"Ey İnsanlar! Allah sizə həcc etməyi vacib buyurmuşdur. Siz də həcc edin". Bu zaman bir kişi: Ey Allah Elçisi, hər ildə? – deyərək soruşduqda Peyğəmbər ﷺ bir ara susudu. Sonra o kişi həmin sualını üç dəfə təkrar etdikdə Peyğəmbər ﷺ buyurdu: "Əgər "hə" desəm, onda sizin üzərinizdə vacib olacaq və siz bunu bacarmayacaqsınız. Mənim sizə demədiklərim haqda məndən soruşmayın. Sizdən əvvəlkilər çox sual verdikləri və peyğəmbərlərinin dediklərini dinləmədikləri üçün həlak olmuşdular. Sizə bir işi əmr etdikdə onu bacardığınız qədər yerinə yetirin. Sizi bir işdən çəkindirdikdə isə ondan əl çəkin"[1].*

Peyğəmbər ﷺ buyurmuşdur:

قال: يا رسول الله ما الإسلام؟ قال: «الإسلام أن تعبد الله ولا تشرك به شيئاً، وتقيم الصلاة المكتوبة، وتؤتي الزكاة المفروضة، وتصوم رمضان، وتحج البيت إن استطعت إليه سبيلاً».

سبق تخريجه

*"İslam beş əsas üzərində qurulmuşdur: Allahdan başqa ibadətə layiq haqq məbud olmadığına və Məhəmmədin Allahın peyğəmbəri olmasına şəhadət vermək, namaz qılmaq, zəkat vermək,*

[1] Müslim: 2\ 975\ № 1337.

***Ramazan ayında oruc tutmaq və imkan olduqda Beytülhərəmə (Kəbəyə) həcc etmək"[1].***

Ümumiyyətlə İslam ümməti və alimləri, yetkinlik yaşına çatmış imkanlı müsəlmana ömründə bir dəfə həccin vacib olmasını yekdilliklə vurğulayırlar.

Həcc, Allahın çağırışına səs verərək, Onun yolunda köç etməkdir. O, hər il gözəl əlaqələr əsasında dünyanın ən şərəfli və müqəddəs məkanında təkrarlanan mərasimdir.

Digər ibadətlər kimi həccin də öz gözəllikləri vardır:

1. Allaha aid olan tövhidin, sözlə, əməllə və etiqadla edilən ibadətin xalis Allah üçün olmasını göstərmək. İslamın bu əzəmətli əsası digər şəriət qanunları kimi bu əzəmətli qayəni həyata keçirir. Ona görə bu ibadətin başlanğıcı Allahın təkliyini əks etdirən tövhid kəlməsi: ***"Ləbbeykə Allahummə ləbbeyk, ləbbeykə lə şərikə ləkə ləbbeyk, innəl həmdə vən nimətə ləkə vəl mulk, lə şərikə lək"[2]*** - ilə başlayır. Allah taala buyurur:

﴿ وَإِذْ بَوَّأْنَا لِإِبْرَاهِيمَ مَكَانَ ٱلْبَيْتِ أَن لَّا تُشْرِكْ بِي شَيْـًٔا وَطَهِّرْ بَيْتِيَ لِلطَّآئِفِينَ وَٱلْقَآئِمِينَ وَٱلرُّكَّعِ ٱلسُّجُودِ ﴾، (الحج: ٢٦)

***"(Ya Rəsulum!) Yadına sal ki, bir zaman İbrahimə Kəbənin yerini bildirib belə buyurmuşduq: "Mənə heç bir şeyi şərik qoşma, evimi təvaf edənlər, namaza duranlar, rüku edən və səcdəyə qapananlar (namaz qılanlar) üçün (bütlərdən) təmizlə!" (əl-Həcc: 26).***

2. Allahın adını uca tutmaq, Onun adını xatırlamaqla nəfsi, qəlbi və hissiyatları doldurmaq. Bu haqda Allah taala buyurur:

---

[1] Buxari: 1\ 49\ № 8. Müslim: 1\ 45\ № 16.

[2] Duanın tərcuməsi: "Allahım sənin çağırışına səs verirəm. Sənin çağırışına səs verirəm və sənin şərikin yoxdur. Həqiqətən həmd, nemət və mülk Sənə məxsusdur. Sənin şərikin yoxdur".

﴿ لِّيَشْهَدُوا۟ مَنَٰفِعَ لَهُمْ وَيَذْكُرُوا۟ ٱسْمَ ٱللَّهِ فِىٓ أَيَّامٍ مَّعْلُومَٰتٍ ﴾، (الحج: ٢٨)

***"Belə ki, öz mənfəətlərinin şahidi olsunlar və məlum günlərdə Allahın onlara ruzi verdiyi (dördayaqlı) heyvanların üstündə (onları qurban kəsərkən) Onun adını çəksinlər ..." (əl-Həcc: 28).*** Digər ayədə isə buyurulur:

﴿ فَإِذَآ أَفَضْتُم مِّنْ عَرَفَٰتٍ فَٱذْكُرُوا۟ ٱللَّهَ عِندَ ٱلْمَشْعَرِ ٱلْحَرَامِ ۖ وَٱذْكُرُوهُ كَمَا هَدَىٰكُمْ وَإِن كُنتُم مِّن قَبْلِهِۦ لَمِنَ ٱلضَّآلِّينَ ﴿١٩٨﴾ ﴾، (البقرة:١٩٨)

***"Ərəfatdan qayıdarkən Məşərülhəramda Allahı xatırlayın. Sizi doğru yola yönəltdiyi üçün Onu yada salın (Ona dua edin), çünki siz bundan əvvəl (doğru yolu) azanlardan idiniz!" (əl-Bəqərə: 198).***

﴿ وَٱذْكُرُوا۟ ٱللَّهَ فِىٓ أَيَّامٍ مَّعْدُودَٰتٍ ﴾، (البقرة: ٢٠٣)

***"(Ey hacılar!) Sayı bəlli olan günlərdə (Mina dağında) Allahı yada salın (təkbirlə zikr edin)..." (əl-Bəqərə: 203).***

﴿ فَإِذَا قَضَيْتُم مَّنَٰسِكَكُمْ فَٱذْكُرُوا۟ ٱللَّهَ ﴾ (البقرة:٢٠٠)

***"Həcc mərasimini tamamlayıb qurtardıqda Allahı yad edin! ..." (əl-Bəqərə: 200)***

Bu və digər ayələr göstərir ki, həccin vacib edilməsinin əsas məqsədi Allahı zikr etməkdir. Hədislər bu mənanı açıq-aşkar təkid edir. Aişədən ﵂ rəvayət olunan hədisdə deyilir:

ففي حديث عائشة رضي الله عنها: «إنما جعل الطواف بالبيت والسعي بين الصفا والمروة، ورمي الجمار لإقامة ذكر الله». رواه أبو داود في سننه والترمذي في سننه، وقال: هذا حديث حسن صحيح.

***"Kəbəni təvaf etmək, səfa və mərva arasında səy etmək, cəməratda daş atmaq və Allahı zikr etmək üçündür"*[1].**

3. Həcc, itaətdə davamlı olmağın, şəhvətə qalib gəlməyin və Allahın razılığını hər şeydən üstün tutmağın gerçəkləşməsi.

﴿ ٱلۡحَجُّ أَشۡهُرٞ مَّعۡلُومَٰتٞۚ فَمَن فَرَضَ فِيهِنَّ ٱلۡحَجَّ فَلَا رَفَثَ وَلَا فُسُوقَ وَلَا جِدَالَ فِي ٱلۡحَجِّۗ وَمَا تَفۡعَلُواْ مِنۡ خَيۡرٖ يَعۡلَمۡهُ ٱللَّهُۗ وَتَزَوَّدُواْ فَإِنَّ خَيۡرَ ٱلزَّادِ ٱلتَّقۡوَىٰۖ وَٱتَّقُونِ يَٰٓأُوْلِي ٱلۡأَلۡبَٰبِ ١٩٧ ﴾، (البقرة:١٩٧)

***"Həcc (mövsümü) məlum olan aylardır (şəvval, zülqədə ayları və zülhiccənin birinci on günü). (Həmin aylarda) həcc ziyarəti vacib olan (həcci özünə vacib bilən) şəxsə həcdə olarkən (qadınla) yaxınlıq, söyüş söyüb pis sözlər danışmaq, dava-dalaş etmək yaramaz. Allah gördüyünüz hər bir yaxşı işi bilir. (Həcc və ya axirət üçün) tədarük görün. Ən yaxşı tədarük (azuqə) isə təqvadır (pis əməllərdən çəkinməkdir). Ey ağıl sahibləri, Məndən qorxun!" (əl-Bəqərə: 197).***

Hədislərin birində belə buyurulur:

وفي الحديث: «من حجّ هذا البيت ولم يرفث ولم يفسق رجع كيوم ولدته أمه» . رواه البخاري في صحيحه ومسلم.

***"Kim həcdə olarkən (qadınla) yaxınlıq etmədən, söyüş söyüb pis sözlər danışmadan həcc (ziyarət) edərsə, anadan doğulduğu gündəki kimi olar"*[2].**

---

[1] Əbu Davud: 2\ 447\ № 1888. Tirmizi: 3\ 246\ № 902. Tirmizi hədisin həsənun səhih olduğunu demişdir.

[2] Buxari: 3\ 382\ № 1521. Müslim: 2\ 983\ № 1350.

4. Həcc, İslam vəhdətini və iman qardaşlığını özündə əks etdirir. Qardaşlıq və bərabərlik toxumu səpir. Bu haqda Allah taala buyurur:

﴿ وَلِلَّهِ عَلَى ٱلنَّاسِ حِجُّ ٱلۡبَيۡتِ مَنِ ٱسۡتَطَاعَ إِلَيۡهِ سَبِيلٗاۚ ﴾، (آل عمران: ٩٧)

***"Onun yoluna (ərzaq, minik, və sağlamlıq baxımından) gücü çatan hər bir kəsin həccə gedib o evi ziyarət etməsi insanların Allah qarşısında borcudur...." (Ali İmran: 97).***

Ayədə ***"insanlar"*** sözü birlikdən xəbər verir. Bu söz digər ayədə:

﴿ وَأَذِّن فِي ٱلنَّاسِ ﴾ (الحج:٢٧)

***"İnsanları həccə çağır" (əl-Həcc: 27)*** – şəklində də qeyd edilir. Bu ibadətdən öncə imanın olmasına baxmayaraq o özündə İslamın əsası olan tövhidi də əhatə edir. Tövhidin həyata keçirilməsi dinin yaşaması deməkdir. Ona görə də insanlara tövhidlə müraciət olunur. Allah taala bu mənanı bir neçə yerdə xatırlayaraq onun əhəmiyyətini nəzərə alır. Allah taala buyurur:

﴿ وَٱلۡمَسۡجِدِ ٱلۡحَرَامِ ٱلَّذِي جَعَلۡنَٰهُ لِلنَّاسِ سَوَآءً ٱلۡعَٰكِفُ فِيهِ وَٱلۡبَادِۚ وَمَن يُرِدۡ فِيهِ بِإِلۡحَادِۢ بِظُلۡمٖ نُّذِقۡهُ مِنۡ عَذَابٍ أَلِيمٖ ٢٥ ﴾، (الحج: ٢٥)

***"Kafir olub (insanları) Allah yolundan, həm yerlilər, həm də gəlmələr üçün (qiblə, məbəd) etdiyimiz Məscidülhəramdan döndərənlərə və orada zülmə, haqsızlığa meyl etmək istəyənlərə də şiddətli əzabdan daddıracağıq!" (əl-Həcc: 25).***

İslamın bu əsasına diqqət yetirdikdə onun, əvvəlindən sonuna qədər İslam vəhdətindən xəbər verdiyinin şahidi olursan. Bunun ən aşkar sübutu: paltarın, sözün, əməlin, vaxtın, yerin, tərəfin və qəsdin eyni olmasıdır.

5. Müsəlman bu ibadətdən səbri, xeyirxahlığı və şükürü öyrənir. Həcc, mal-dövlət və bədənlə edilən ibadətdir. Həccə gedən

adam müvəqqəti olaraq yola çıxmalı, ailəsindən və vətənindən uzaqlaşmalıdır. Həcc, nəfsi paxıllıq və xəsislikdən təmizləyir, insana davamlı, iradəli və gözəl əxlaqlı olmağı öyrədir.

6. Həcc mövsümü, ticarət əlaqələrinin və mənfəətlərinin əldə edilməsi üçün gözəl fürsətdir. Müsəlmanlar bu mövsümdə bir-birləri ilə ticarət edir və ticarət təcrübələrindən istifadə edirlər. Şübhəsiz ki, belə ticarət əlaqələri ilə müsəlman dövlətlərinin zəif nöqtələri aşkarlanır və digər dövlətlər tərəfindən qarşılıqlı əlaqələrlə təkmilləşir. Allah taala bizə bu mənfəətləri əldə etməyi əmr etmişdir. Ibn Abbas ﷺ Həcc surəsinin 28-ci ayəsinin: ***"Belə ki, öz mənfəətlərinin şahidi olsunlar..."*** - təfsirində bu mənaya işarə edərək belə buyurmuşdur: "Ayədə deyilən mənfəətlər həm dünya, həm də axirət mənfəətləridir. Axirət mənfəətləri Allah taalanın razılığını qazanmaq, dünya mənfəətləri isə əldə etdiyiniz qurbanlar və ticarətdir".

7. Həcc, hər il təkrarlanan görüşdür. Bu mövsümdə müsəlmanlar bir-birləri ilə görüşür, vəziyyətləri ilə tanış olurlar. Həmçinin onların sözləri bir olur, cahillər bilmədiklərini alimlərdən öyrənir, varlılar kasıblara qarşı mərhəmət göstərir, bəzi İslam dövlətlərinin ehtiyacları aşkarlanır və s. Ümumiyyətlə həccin faydaları çoxdur. Həcc edən adam özü onları dərk edir və onların şahidi olur.

## Beşinci bölüm: Cihad və onun gözəllikləri:

Ötən dörd bölüm İslamın əsaslarında olan namaz, zəkat, oruc, həcc kimi gözəlliklər haqqında bəhs edirdi. Bunlar, İslamın mövcudluğunu əks etdirən əsaslardır. İslam şəriətinin ilk məqsədi budur. Bu bölümdə isə sizə cihad haqda məlumat verəcəyik. Cihad, İslam şəriətini yox olmaqdan qoruyan əməldir. Yəni, şəriət təşəkkül tapdıqdan sonra məhv olmaması üçün onu mühafizə etməkdir. Mühafizənin başlıca tərkibi hissəsi şəriət əsasları üzərində qurulmuş bir dini məhv etmək və ona dəvətin qarşısını almaq istəyən maneələrin aradan qaldırılmasıdır.

Bir şeyi bilmək lazımdır ki, cihadın iki mənası vardır. Biri ümumi, digəri isə xüsusi mənadır.

Cihadın ümumi mənası: *nəfsinə və ya başqalarına qarşı* İslam dininə kömək etmək üçün gücünü və imkanını səfərbər etməkdən ibarətdir.

Alimlərdən biri cihadın ümumi mənasına tərif verərkən belə demişdir: "*Cihad, haqqı müdafiə etmək və pisliklərdən uzaq olmaq üçün imkanlarını səfərbər etməkdir*". Başqa tərifdə isə belə deyilir: "*Cihadın həqiqi mənası - Allahın sevdiyi iman və saleh əməllərə nail olmağa can atmaq, Allahın nifrət etdiyi küfr, fasiqlik və asiliklərdən uzaq olmaqdır*".

**İnsanın nəfsi ilə əlaqədar olan cihad** – Allahın şəriətini öyrənmək üçün qüvvəsini sərf etmək, ona əməl etmək, insanları İslam dininə dəvət etmək və bu yolda bütün əziyyətlərə səbirlə dözmək. Alimlər bu növ cihadı nəfsi cihad adlandırırlar. Onun da dörd dərəcəsi vardır.

İnsanın başqaları ilə apardığı cihad isə bir neçə növdür:

Birinci növ: Şəhvət və şübhələrdən uzaq olmaqla, şeytana qarşı aparılan cihad.

İkinci növ: Asilərə və bidətçilərə qarşı aparılan cihad. Onun da üç dərəcəsi vardır:

a. Şəriətə zidd olan əməllərini inkar etməklə, ***qəlbi*** ilə onlara qarşı cihad etmək.
b. Nəvazişkar və nəzakətli olmaq şərti ilə, elmi şəkildə onlara yaxşı işləri əmr etmək və pis işlərdən çəkindirməklə, ***dillə*** cihad etmək.
c. ***Əl*** ilə onlara qarşı cihad etmək. Əgər hakim kiməsə vəzifəli bir şəxsə səlahiyyət veribsə o, fiziki yolla pislikləri dəyişə bilər. Lakin bunun əsas şərtlərindən biri, pis əməlin bu yolla dəyişilməsi zamanı daha pis işlərə yol verilməməsidir.

Cihadın üçüncü növü: Kafirlərə qarşı ***mənəvi*** cihad etmək: onları sevməmək, dost tutmamaq, onlara nifrət etmək, gördükləri batil işləri inkar etmək. ***Dil*** ilə cihad etmək: İslama dəvət və təşviq etmək, onların batil əqidələrinə, ümumən İslama və müsəlmanlara qarşı söylədikləri böhtanlara cavab vermək. ***Mal-dövlət*** ilə cihad etmək: Malını İslamın müdafiəsinə və ona dəvətə sərf etmək. Hədislərin birində Peyğəmbər ﷺ buyurmuşdur:

وقد جاء في الحديث «جاهدوا المشركين بأموالكم وأنفسكم وألسنتكم» رواه أبو داود في سننه والنسائي في سننه، وإسناده صحيح، وانظر: صحيح الجامع، للألباني.

***"Müşriklərə qarşı malınız, canınız və diliniz ilə cihad edin"[1].***

Deyilənlər cihadın on iki dərəcəsidir. Həmin dərəcə və növlər cihad sözünün tərkibini əhatə edir. Cihadın əvvəldə deyilən bəzi növləri hər kəsə vacibdir *(fərzi ayndir)* məsələn, nəfsə və şeytana qarşı cihad. Digər növlər isə bəzi insanlara vacibdir *(fərzi kifayədir).* Məsələn, asilərə və bidətçilərə qarşı cihad etmək. Kafirlərə qarşı cihad etmək isə əvvəldə dediyimiz kimidir.

---

[1] Əbu Davud: 3\ 22\ № 2504. Nəsai: 6\ 313\ № 3096. Hədisin isnadı səhihdir. Albaninin Səhihul Cami kitabı: № 3090.

Cihadın xüsusi mənası isə, kafirlərə qarşı fiziki yolla cihad etmək, yəni döyüşməkdir. Alimlər bu növ cihadın tərifini belə verirlər: "Müsəlmanın kafirə qarşı: saziş bağlanılan kafirlər istisna olmaqla, onu İslama dəvət etdikdən sonra İslamı qəbul etməkdə inadkarlıq etdikdə, - Allahın adını yüksəltmək üçün döyüşməsidir"[1]

Cihadın sonuncu mənasının həyata keçirilməsi üçün xüsusi şərtlər mövcuddur. Həmin şərtlərin hamısı və ya onlardan biri olmadıqda cihad nəinki vacib sayılır, ona hətta icazə də verilmir. Şərtlərin bəziləri qarşı tərəf olan kafirlərə, digərləri isə müsəlman mücahidlərə aiddir.

Kafirlərə aid olan şərtlər üçdür:

1. Kafir zimmi *(yəni, müsəlmanların hakimiyyəti altında, onların arasında yaşayan kafir)* olmamalıdır.
2. Muahid *(müqavilə bağlanılan)* olmamalıdır. Çünki müahidlə müsəlmanlar arasında saziş və əmin-amanlıq vardır.
3. Müstəmən *(Müsəlman ölkəsinə daxil olmaq üçün əmin-amanlıq verilən kafir düşmən)* olmamalıdır.

*Müsəlman mücahidə* aid olan şərtlər isə beşdir:

1. Bu əməli xalis Allah üçün *(ixlasla)* etmək. Onun məqsədi Allahın adını yüksək tutmaq olmalıdır.
2. Döyüş başqa bayraqlar deyil, birlik *(tövhid)* bayrağı altında olmalıdır.
3. Müsəlmanların düşməni qorxudacaq qüvvələri olmalıdır. Bu haqda Allah taala buyurur:

﴿ وَأَعِدُّواْ لَهُم مَّا ٱسۡتَطَعۡتُم مِّن قُوَّةٍ ﴾ (الأنفال:٦٠)

***"Kafirlərə qarşı bacardığınız qədər qüvvə tədarük edin" (əl-Ənfal: 60).***

---

[1] Qeyd!!! **Cihad elan etmək səlahiyyəti tək-tək fərdlərə, qruplara və təşkilatlara xas deyil, müsəlman ölkəsinin xüsusi səlahiyyətlərə malik olan ali orqanının yurisdiksiyasına məxsus şəriət məsələsidir.**

4. Döyüşməyin *(döyüşməməyə nisbətən)* – mövcud fəsadı daha da amansızı ilə əvəz etməsi ehtimalının çox olması.
5. Dövlət başçısının cihad etmək üçün icazə verməsi. Cihadın elan edilməsi müsəlman rəhbərə məxsusdur və bütün camaat da ona itaət etməlidir. Peyğəmbər ﷺ hədisdə buyurur:

قال ﷺ : «إنما جعل الإمام جنّة يقاتل من ورائه ويتقى به فإن أمر بتقوى الله وعدل فإن له بذلك أجراً وإن أمر بغيره فإن عليه وزراً» رواه البخاري في صحيحه ومسلم.

***"Rəhbər, onun arxasından döyüşmək və müdafiə olunmaq üçün, sipər edilmişdir. Əgər o Allahdan qorxmağı əmr edər və ədalətli olarsa savab qazanar, əks halda isə günah qazanar"[1].***

Bu hədisdə iki fayda vardır:

**Birinci fayda:** İnsanların döyüşə girməsi üçün mütləq rəhbərləri olmalıdır. Heç bir təşkilatın, partiyanın və ya toplumun özbaşına cihad elan etməsi düzgün deyildir. Bunun faydası yoxdur, əksinə günümüzdə bunun zərəri açıq-aşkar görünür.

**İkinci fayda:** Cihad etmək üçün rəhbərin ədalətli olması şərt deyildir.

Alimlər ötən şərtlərin heç biri haqda fikir ayrılığında deyillər. Ən əhəmiyyətli odur ki, cihad şəriət rəhbərliyinin başçılığı altında edilsin.

Cihadın edilib-edilməməsi, yalnız elmdə yüksək məqamlara yetişmiş müdrik və mötəbər alimlərə həvalə edilir. Alimlər deyirlər: "**Cihad məsələlərini təyin etmək müdrik alimlərə məxsusdur**".

Şəriət qanunlarına əsasən edilən cihadın hədəfi Allahın dinini təbliğ etmək və bütün pis işlərə son qoymaqdır. Fiqh elmində olan qaydaların birində deyilir: "Mövcud pis işin daha da şiddətlisi ilə

---

[1] Buxari: 6\ 1116\ № 2957. Müslim: 3\ 1471\ № 1841.

əvəz ediləcəyi ehtimalı çox olduqda, həmin pis işi inkar etmək haram olur".

Bunu bilmək isə müdrik alimlərin vəzifəsidir. Müsəlmanlar, şəriət hökmünün qüvvədə olduğu müsəlman ölkədə, yəni, ədalətli olub olmamasından asılı olmayaraq, müsəlman rəhbərin başçılığı altında yaşayırlarsa, cihad məsələsi başqasının deyil, yalnız həmin rəhbərin ixtiyarındadır. Əks halda fitnə və özbaşınalıq törəyir.

Peyğəmbərin ﷺ cihadına diqqət yetirən adam onun cihadının dörd mərhələdən ibarət olmasını görər:

**Birinci mərhələ:** Döyüş etməmək. Bu ən uzun mərhələdir. Bu mərhələdə Peyğəmbərə ﷺ yalnız dini təbliğ etmək, kafirlərin ona qarşı törətdikləri əziyyətlərə səbirli olmaq, müşriklərdən üz çevirmək əmr olunurdu. Müsəlmanlar arasında qətlə yetirilənlərin və əzaba məhkum edilənlərin olmasına baxmayaraq, Peyğəmbərə ﷺ və ona itaət edən səhabələrə kafirlərə qarşı döyüşmək əmr olunmurdu.

**İkinci mərhələ:** Sadəcə olaraq döyüş etməyə icazə verilən mərhələ *(əmr olunan yox)*. Bu haqda Allah taala buyurur:

﴿ أُذِنَ لِلَّذِينَ يُقَـٰتَلُونَ بِأَنَّهُمْ ظُلِمُوا۟ ۚ وَإِنَّ ٱللَّهَ عَلَىٰ نَصْرِهِمْ لَقَدِيرٌ ﴿٣٩﴾ ﴾ (الحج:٣٩)

***"Zülmə məruz qaldıqlarına görə vuruşanlara (kafirlərə qarşı Allah yolunda döyüşməyə) izin verilmişdir. Allah onlara kömək etməyə, əlbəttə, qadirdir!" (əl-Həcc: 39).***

**Üçüncü mərhələ:** Yalnız müsəlmanlara qarşı savaşanlarla savaşmaq və başqalarına toxunmamaq. Bu haqda Allah taala buyurur:

﴿ وَقَـٰتِلُوا۟ فِى سَبِيلِ ٱللَّهِ ٱلَّذِينَ يُقَـٰتِلُونَكُمْ وَلَا تَعْتَدُوٓا۟ ﴾ (البقرة:١٩٠)

***"(Ey möminlər!) Sizinlə vuruşanlarla siz də Allah yolunda vuruşun, lakin həddən kənara çıxmayın...." (əl-Bəqərə: 190).***

**Dördüncü mərhələ:** Müsəlmanların dövlətləri qurulduqdan və müşriklərə qarşı gücləri təkmilləşdikdən sonra Allah taala

Peyğəmbərə ﷺ İslam dəvətinin qarşısını kəsmək istəyən bütün kafirlərə qarşı döyüşməyi əmr etdi. Bu haqda Allah taala buyurur:

﴿ تُقَٰتِلُونَهُمۡ أَوۡ يُسۡلِمُونَ ﴾ (الفتح:١٦)

***"Siz onlarla vuruşacaqsınız, ya da onlar dönüb müsəlman olacaqlar (döyüşə ehtiyac qalmayacaqdır)..." (əl-Fəth: 16).***

﴿ قَٰتِلُواْ ٱلَّذِينَ لَا يُؤۡمِنُونَ بِٱللَّهِ وَلَا بِٱلۡيَوۡمِ ٱلۡأٓخِرِ وَلَا يُحَرِّمُونَ مَا حَرَّمَ ٱللَّهُ وَرَسُولُهُۥ وَلَا يَدِينُونَ دِينَ ٱلۡحَقِّ مِنَ ٱلَّذِينَ أُوتُواْ ٱلۡكِتَٰبَ حَتَّىٰ يُعۡطُواْ ٱلۡجِزۡيَةَ عَن يَدٖ وَهُمۡ صَٰغِرُونَ ٢٩ ﴾ (التوبة:٢٩)

***"Kitab əhlindən Allaha və qiyamət gününə iman gətirməyən, Allahın və Peyğəmbərinin haram buyurduqlarını haram bilməyən və haqq dini (İslamı) qəbul etməyənlərlə zəlil vəziyyətə düşüb öz əlləri ilə cizyə verincəyə qədər vuruşun." (ət-Tövbə: 29).***

Fiqh alimləri deyirlər ki, cihadın bu dörd mərhələsinin hökmü ləğv *(nəsx)* edilməmişdir. Müxtəlif dövrlərdə müsəlmanların qüvvətli və ya zəif olmalarından asılı olaraq bu dörd mərhələdən istifadə edilir. Əgər müsəlmanların düşməni qorxudacaq gücləri varsa onlar əvvəldə qeyd edilən şərtlər çərçivəsində cihad edə bilərlər. Əgər müsəlmanların qüvvətli olmaları ancaq zənn edilir və dəqiq deyilsə, yaxud cihad edildiyi təqdirdə düşmənin müsəlman torpaqlarına daha da çox müdaxilə etməsi ehtimalı varsa, onda cihad etmək bəyənilmir. Ona görə də, müsəlmanları aqibəti pis olan təhlükəyə atmaq olmaz.

Hamımız, cihad adı altında özbaşına görülən əməllərin şahidiyik. Lakin əslində bu cihad deyil, İslama və müsəlmanlara qarşı aparılan pis nəticəli zərbədir. Hətta bu əməllər, kafirlərin müsəlman torpaqlarında öz niyyətlərinə nail olmağa kömək də etmişdir. Cihad məsələsinin yalnız rəhbərə məxsus olduğunu görmək üçün, Peyğəmbərin ﷺ Məkkə və Mədinə həyatı ən gözəl

örnək və ən gözəl nümunədir. Ona görə özbaşına hərəkətlərlə müsəlmanları təhlükəyə atmaq olmaz.

Ümumiyyətlə cihad xüsusi mənası *(kafirlərə qarşı döyüş)* baxımından, yalnız əvvəldə deyilən şərtlərin mövcudluğundan sonra mümkündür.

Cihadın İslam dinində gözəllikləri həddindən artıq çoxdur. Belə gözəlliklər və qayələrdən:

1. Allahın sözünü uca tutmaq, dini yalnız Allah üçün etmək və yer üzündə Onun şəriəti ilə hökm vermək. Bu haqda Allah taala buyurur:

﴿ وَقَٰتِلُوهُمۡ حَتَّىٰ لَا تَكُونَ فِتۡنَةٞ وَيَكُونَ ٱلدِّينُ كُلُّهُۥ لِلَّهِۚ فَإِنِ ٱنتَهَوۡاْ فَإِنَّ ٱللَّهَ بِمَا يَعۡمَلُونَ بَصِيرٞ ٣٩ ﴾، (الأنفال: ٣٩).

***"(Yer üzündə) fitnə (şirk) qalmayıb, bütün din (ibadət) yalnız Allaha məxsus olanadək onlarla vuruşun. Əgər (Allaha şərik qoşmağa) son qoysalar (bilsinlər ki), Allah onların nə etdiklərini görəndir (bunun əvəzində mükafatlarını verəcəkdir)" (əl-Ənfal: 39).***

﴿ وَقَٰتِلُوهُمۡ حَتَّىٰ لَا تَكُونَ فِتۡنَةٞ وَيَكُونَ ٱلدِّينُ لِلَّهِۖ فَإِنِ ٱنتَهَوۡاْ فَلَا عُدۡوَٰنَ إِلَّا عَلَى ٱلظَّٰلِمِينَ ١٩٣ ﴾، (البقرة: ١٩٣)

***"Fitnə (müşriklərin fitnəsi) aradan qalxana qədər və din (ibadət) ancaq Allaha məxsus edilənədək onlarla vuruşun; əgər onlar (bu cür hərəkətlərə) son qoyarlarsa (siz də onlarla vuruşmaqdan vaz keçin!), çünki düşmənçilik ancaq zülm edənlərə qarşı olur" (əl-Bəqərə: 193).***

***Əbu Musa ﵁ deyir: Bir kişi Peyğəmbərin ﷺ yanına gəlib dedi: Kimsə qənimət uğrunda, kimsə insanların dilində qalmaq və kimsə özünü sınamaq üçün döyüşür. Bunların hansı Allah yolunda döyüşən kimsədir? Peyğəmbər ﷺ buyurdu:***

قال ﷺ «من قاتل لتكون كلمة الله هي العليا فهو في سبيل الله» . البخاري في صحيحه ومسلم.

***"Kim Allah kəlməsinin ucaltmaq üçün döyüşürsə o Allah yolunda cihaddadır"[1].***

2. Müsəlmanlara qarşı edilən düşmənçiliyin qarşısını almaq və məzlumlara kömək etmək. Bu haqda Allah taala buyurur:

﴿ وَمَا لَكُمْ لَا تُقَـٰتِلُونَ فِى سَبِيلِ ٱللَّهِ وَٱلْمُسْتَضْعَفِينَ مِنَ ٱلرِّجَالِ وَٱلنِّسَآءِ وَٱلْوِلْدَٰنِ ٱلَّذِينَ يَقُولُونَ رَبَّنَآ أَخْرِجْنَا مِنْ هَـٰذِهِ ٱلْقَرْيَةِ ٱلظَّالِمِ أَهْلُهَا وَٱجْعَل لَّنَا مِن لَّدُنكَ وَلِيًّا وَٱجْعَل لَّنَا مِن لَّدُنكَ نَصِيرًا ﴿٧٥﴾ ﴾، (النساء: ٧٥)

***"(Ey müsəlmanlar!) Sizə nə olub ki, Allah yolunda (hicrət etməyib, yaxud əsir kimi Məkkədə qalıb): "Ey Rəbbimiz, bizi əhalisi zalım olan bu şəhərdən (Məkkədən) kənara çıxart, bizə öz tərəfindən mühafizəçi göndər, yardımçı yolla!" – deyə dua edən aciz kişilər, qadınlar və uşaqlar uğrunda vuruşmursunuz?" (ən-Nisa: 75).***

Ayənin mənası o deməkdir ki, nə üçün siz Allah yolunda döyüşmür, kafirlərin həbs etdikləri din və qan qardaşlarınıza kömək etmirsiniz.

İslam alimləri bu iki məsələni əsaslandıraraq deyirlər: "Əgər təyin edilmiş döyüş, Allah kəlməsini uca tutmaq və dini yalnız Allaha məxsus etmək uğrunda aparılan cihaddırsa, onda müsəlmanların yekdil rəyinə görə, belə döyüşdən imtina edən adama qarşı vuruşmaq lazımdır". Digər bir alim isə deyir: "Cihadı şəriət qanunu etmək bu dinin gözəlliklərindən biridir. Çünki cihadın əsas məqsədi Allahın dininə qarşı edilən düşmənçiliyi, onun təbliğinə məşat olan maneələri dəf etməkdir. Cihadın məqsədi insanları qarət etmək və ya öldürmək deyildir".

---

[1] Buxari: № 2810. Müslim: № 1904.

Kim bu əsasın dəlillərinə, Peyğəmbərin ﷺ və səhabələrin düşmənə qarşı davranışlarına baxarsa, cihadın düşmənçiliyi dəf edən zəruri hökmlərdən biri olmasını başa düşər.

Başqa bir alim isə belə deyir: "Allah taala cihadı insanları zülmətdən nura çıxartmaq, Onun adını uca tutmaq, müsəlmanları dinlərində fitnəyə düşməkdən, dinlərinə qarşı düşmənçilikdən və torpaqlarının işğal edilməsindən qorumaq üçün buyurmuşdur... və bunlara yalnız Allah yolunda edilən cihad ilə nail olmaq mümkündür və həqiqi cihad dünyanın sonuna qədər davam edəcəkdir. ".

Başqa bir alim isə deyir: "Cihad, qiyamət gününə qədər davam edəcəkdir. Cihad nəticə etibarı ilə gözəldir. Çünki cihadla, Allahın düşmənləri susdurulur və Onun dostlarına kömək olunur, İslam kəlməsi ucalır, qılınc parıltısını görən kafir ən pis əməldən, öz küfründən əl çəkir və ən gözəl əmələ, İslama qovuşur".

3. Cihad, dünya izzətini həyata keçirən əsas amillərdəndir. İslam ümməti cihad etdiyi dövrlərdə izzətli və şərəfli idi. Onu tərk etdikdən sonra isə zəlil olmuş və alçalmışdır. Güclülər zəiflərə zülm etmişdir. Bu deyilənlər, Peyğəmbərin ﷺ hədislərinin birində öz əksini tapmışdır:

قول رسول الله ﷺ «إذا تبايعتم بالعينة وأخذتم بالزرع واتبعتم أذناب البقر وتركتم الجهاد سلط الله عليكم ذلاً لا ينزعه حتى تراجعوا دينكم» رواه أبو داود في سننه، وصححه الألباني في صحيح الجامع.

*"Siz sələmçilik edib, əkin-biçinə diqqət yetirib, mal-qara arxasınca gedib, Allah yolunda cihadı tərk etsəniz dininizə qayıtmayınca Allah taala sizin üzərinizə zəlillik yağdırar"*[1].

---

[1] Əbu Davud: 3\ 740-741\ № 3462. Albani ***"Səhihul Cami"*** kitabında hədisin səhihliyini qeyd etmişdir № 423.

4. İslam şəriətinin təyin etdiyi şərtlər əsasında aparılan cihad, özündə Allahın köməyini ehtiva edir. Çünki Allah taala mücahidlərə kömək etməyi və onları sabitqədəm etməyi vəd edərək buyurmuşdur:

﴿ إِن تَنصُرُواْ ٱللَّهَ يَنصُرۡكُمۡ وَيُثَبِّتۡ أَقۡدَامَكُمۡ ۝٧ ﴾ (محمد:٧)

***"Əgər siz Allaha (Allahın dininə və Peyğəmbərinə) yardım göstərsəniz, O da sizə yardım göstərər və sizi sabitqədəm (cihadda möhkəm, qüvvətli) edər." (Məhəmməd: 14).***

5. Cihad, bütün ümməti nicat və qurtuluş üçün çalışmağa təşviq edir. Müsəlman gəncləri səfeh işlərdən uzaqlaşdırıb, ciddi və faydalı işlərə yönəldir.

6. Cihad, çalışqanlığın və qətiyyətli olmağın geniş məkanda yayılması üçün zəmindir. Çünki, cihadla birlikdə izzət olarsa, həyatın mənası tamamilə başqalaşar. Belə halda düşüncələr ən gözəl fikirləri nümayiş etdirir və istəklər ən böyük işlərə can atır.

7. Allah taala cihad vasitəsi ilə müsəlmanlardan şəhidlər götürür. Onlar dünyada Allaha itaət etdiklərinə, axirətdə isə Allahın rizasına nail olduqlarına görə xoşbəxtdirlər.

# Üçüncü fəsil:
# İslamın, ailə qanunları baxımından gözəllikləri:

İslam, insanların həm dünya və həm də axirət məsələlərini qoruyan bir dindir. Elə buna görə də insanın fitrətinə, bəşər xüsusiyyətinə və təbiətinə uyğun olan qanunlar müəyyənləşdirmişdir. İslamın ailə haqqında qanunları barədə dediklərimiz daha asanlıqla aşkar ediləcəkdir.

## Birinci: Evlənmək:

Ərəb dilində evlənməyin mənası bağlanmaq və birləşmək mənasındadır. Şəriət termini olaraq onun mənası: "Şəriətin qanunlarına uyğun olaraq ər ilə arvadın qanuni nikah bağlılığı" – deməkdir.

Şəriətin bir çox dəlilləri nikahlanmanın bir qanun olmasını isbat edir. Allah taala buyurur:

﴿ فَٱنكِحُواْ مَا طَابَ لَكُم مِّنَ ٱلنِّسَآءِ مَثۡنَىٰ وَثُلَٰثَ وَرُبَٰعَ ﴾ (النساء:٣)

***"Halal olan (bəyəndiyiniz) başqa qadınlardan iki, üç və dörd nəfərlə nikah bağlayın!..." (ən-Nisa: 3)***

﴿ وَأَنكِحُواْ ٱلۡأَيَٰمَىٰ مِنكُمۡ وَٱلصَّٰلِحِينَ مِنۡ عِبَادِكُمۡ وَإِمَآئِكُمۡ ﴾ (النور: ٣٢ )

***"(Ey möminlər!) Aranızda olan subay kişiləri və ərsiz qadınları, əməlisaleh (yaxud evlənməyə qabil) kölə və cariyələrinizi evləndirin...." (ən-Nur: 32)***

Peyğəmbər ﷺ buyurmuşdur:

وقول رسول الله ﷺ: «النكاح من سنتي، فمن لم يعمل بسنتي فليس مني، وتزوَّجوا فإني مكاثر بكم الأمم، ومن كان ذا طول فلينكح، ومن لم يجد فعليه بالصِّيام، فإن الصَّوم له وجاء» رواه ابن ماجه في سننه وصححه الألباني في صحيح الجامع.

***"Nikah mənim Sünnəmdəndir (yolumdandır). Kim mənim Sünnəmə (yoluma) əməl etməsə məndən deyildir. Evlənin! Mən qiyamət günü sizinlə digər ümmətlərdən çox olacağam. Kimin imkanı varsa evlənsin. İmkanı olmayan isə oruc tutsun. Həqiqətən oruc tutmaq onun dərmanıdır"[1].***

Evlənmək Allahın bəndələrinə bəxş etdiyi böyük nemətdir. O, bütün peyğəmbərlərin və elçilərin sünnəsidir. İslam dini evlənməyin əzəmətinə və şərəfinə çox böyük əhəmiyyət vermişdir. Quranın bir çox ayələrində və hədislərdə onun gözəl səmərəsi və faydasını təkidlə qeyd etmişdir. Evlənməyin fərdə, cəmiyyətə və millətə kütləvi şəkildə faydaları vardır və onlardan:

1. Evlilik insan nəfsinə rahatlıq verir. İnsanın öz cinsindən ər arvad edilməsi, onların arasında mehribançılıq və ülfət olması Allah taalanın insanlara bəxş etdiyi ən əzəmətli nemətlərdən biridir. Bu haqda Allah taala buyurur:

﴿ وَمِنْ ءَايَـٰتِهِۦٓ أَنْ خَلَقَ لَكُم مِّنْ أَنفُسِكُمْ أَزْوَٰجًا لِّتَسْكُنُوٓا۟ إِلَيْهَا وَجَعَلَ بَيْنَكُم مَّوَدَّةً وَرَحْمَةً ۚ إِنَّ فِى ذَٰلِكَ لَـَٔايَـٰتٍ لِّقَوْمٍ يَتَفَكَّرُونَ ﴿٢١﴾ ﴾ ( الروم: ٢١ )

***"Sizin üçün onlarla ünsiyyət edəsiniz deyə, öz cinsinizdən zövcələr xəlq etməsi, aranızda (dostluq) sevgi və mərhəmət yaratması da Onun qüdrət əlamətlərindəndir. Həqiqətən, bunda (bu yaradılışda) düşünən bir qövm üçün ibrətlər vardır!" (ər-Rum: 21).***

---

[1] İbn Macə: 1\ 592\ № 1846. Albani ***"Səhihul Cami"*** kitabında hədisin səhihliyini qeyd etmişdir № 6807.

2. Evlilik, namus qeyrəti qorumağın və fahişəlikdən uzaq olmağın ən gözəl yoludur. Beləliklə, evlənən insan öz ehtirasını söndürmək üçün səhv yol tutmaz. Abdullah İbn Məsud ﷺ Peyğəmbərin ﷺ belə buyurduğunu rəvayət edir:

قال رسول الله ﷺ: «يا معشر الشباب من استطاع منكم الباءة فليتزوج؛ فإنه أغض للبصر، وأحصن للفرج، ومن لم يستطع فعليه بالصوم؛ فإنه له وجاء» . رواه البخاري في صحيحه ومسلم.

***"Ey cavanlar toplusu! Evlənməyə imkanı olanlar evlənsin. Çünki evlilik (yad qadınlara) gözlə baxmağın qarşısını alır və cinsiyyət orqanlarını mühafizə edir. Evlənməyə imkanı olmayan oruc tutsun. Həqiqətən oruc tutmaq onun dərmanıdır"[1].***

Kişi şərəfli üsulla, evlənməklə öz ehtirasını təmin edir. Evlilik insanın abrını qoruyur və cinsiyyət orqanlarını natəmizlikdən mühafizə edir. Həmçinin o, hər bir sağlam insanın fitrətinə yazılmış ehtiras hisslərinin qarşılığını ödəyir.

İslam dini fitrəti və şəriəti ilə ehtiras hisslərini nə tam həbs etməmiş, nə də onu özbaşına tərk etməmişdir. Əksinə İslam şəriəti bu hissiyyatları iqrar edir və onu düzgün istiqamətləndirir. Həmin hissiyyatları halal və gözəl yolla, evlənməklə ödəməyi təkid edir. Elə bu baxımdan İslam şəriəti insanı heyvandan fərqləndirməklə onu alicənab edir.

3. Evlənmək nəsil törətmək üçün vasitədir. Övlad dünya həyatının gözəl nemətlərindəndir. Övladı sevmək və onları artırmaq insanın təbiətindədir. Həmçinin insan öz nəslinin yaşamasını və daimi qalmasını istəyir. Deyilənlərə nail olmaq üçün ən gözəl və təmiz vasitə evlənməkdir. Bu haqda Allah taala buyurur:

---

[1] Buxari: 9\ 106\ № 5065. Müslim: 2\ 1018\ № 1400.

﴿ ٱلۡمَالُ وَٱلۡبَنُونَ زِينَةُ ٱلۡحَيَوٰةِ ٱلدُّنۡيَا ﴾ ( الكهف: ٤٦)

***"(Bəzi adamların fəxr etdiyi) mal-dövlət, oğul-uşaq (oğullar) bu dünyanın bər-bəzəyidir..." (əl-Kəhf: 46).***

﴿ وَٱللَّهُ جَعَلَ لَكُم مِّنۡ أَنفُسِكُمۡ أَزۡوَٰجًا وَجَعَلَ لَكُم مِّنۡ أَزۡوَٰجِكُم بَنِينَ وَحَفَدَةً وَرَزَقَكُم مِّنَ ٱلطَّيِّبَٰتِ ﴾ (النحل: ٧٢)

***"Allah sizin üçün özünüzdən (Adəm və Həvvadan, yaxud öz cinsinizdən) zövcələr yaratdı, zövcələrinizdən də sizin üçün oğullar, nəvələr əmələ gətirdi, pak (halal) nemətlərindən sizə ruzi verdi...." (ən-Nəhl: 72).***

4. Evlənmək ailələr arasında bağlılığa və cəmiyyətdə mehribançılığa səbəb olur. Bir ailə digər ailə ilə kürəkənlik qohumluğu bağlayır və beləcə bütün ailələr qohum olur və nəticədə həmin cəmiyyət bir ailəyə çevrilir. Bu haqda Allah taala buyurur:

﴿ وَهُوَ ٱلَّذِي خَلَقَ مِنَ ٱلۡمَآءِ بَشَرًا فَجَعَلَهُۥ نَسَبًا وَصِهۡرًا ﴾ (الفرقان: ٥٤ )

***"İnsanları sudan (nütfədən) yaradan, onları (bir-biri ilə) əsl qohum (qan qohumu) və sonradan qohum edən Odur..." (əl-Furqan: 54).***

5. Qanuni evlənmək insanın nəsl-nəcabətini və cəmiyyətin əsası sayılın ailəni qoruyur. Həmçinin evlilik cəmiyyətdəki insanları bir-birlərinə dayaq edir. Bu haqda Allah taala buyurur:

﴿ يَٰٓأَيُّهَا ٱلنَّاسُ ٱتَّقُواْ رَبَّكُمُ ٱلَّذِي خَلَقَكُم مِّن نَّفۡسٖ وَٰحِدَةٖ وَخَلَقَ مِنۡهَا زَوۡجَهَا وَبَثَّ مِنۡهُمَا رِجَالٗا كَثِيرٗا وَنِسَآءٗۚ وَٱتَّقُواْ ٱللَّهَ ٱلَّذِي تَسَآءَلُونَ بِهِۦ وَٱلۡأَرۡحَامَۚ إِنَّ ٱللَّهَ كَانَ عَلَيۡكُمۡ رَقِيبٗا ١ ﴾ (النساء: ١)

***"Ey insanlar! Sizi tək bir şəxsdən (Adəmdən) xəlq edən, ondan zövcəsini (Həvvanı) yaradan və onlardan da bir çox kişi və qadınlar törədən Rəbbinizdən qorxun! (Adı ilə) bir-birinizdən (cürbəcür şeylər) istədiyiniz Allahdan, həmçinin qohumluq əlaqələrini kəsməkdən həzər edin! Şübhəsiz ki, Allah sizin üzərinizdə gözətçidir!" (ən-Nisa: 1).***

﴿ يَٰٓأَيُّهَا ٱلنَّاسُ إِنَّا خَلَقۡنَٰكُم مِّن ذَكَرٖ وَأُنثَىٰ وَجَعَلۡنَٰكُمۡ شُعُوبٗا وَقَبَآئِلَ لِتَعَارَفُوٓاْۚ إِنَّ أَكۡرَمَكُمۡ عِندَ ٱللَّهِ أَتۡقَىٰكُمۡۚ إِنَّ ٱللَّهَ عَلِيمٌ خَبِيرٞ ﴾(الحجرات: ١٣)

***"Ey insanlar! Biz sizi bir kişi və bir qadından (Adəm və Həvvadan) yaratdıq. Sonra bir-birinizi tanıyasınız (kimliyinizi biləsiniz) deyə, sizi xalqlara və qəbilələrə ayırdıq. Allah yanında ən hörmətli olanınız Allahdan ən çox qorxanınızdır (pis əməllərdən ən çox çəkinəninizdir). Həqiqətən, Allah (hər şeyi) biləndir, (hər şeydən) xəbərdardır." (əl-Hucurat: 13).***

Əgər kişi ilə qadının evlənməsi qeyri qanuni *(qeyri şəri)* edilsə onda insanla heyvanın doğmasında və nəsil törəməsində heç bir fərq olmaz. Uşaq doğular atasının və ya anasının kim olduğunu tanımaz. Ata anasını itirən uşaq deməli öz qardaşını, bacısını, dayısını, əmisini, bibisini, xalasını və s. i.a. da itirmişdir. Belə halda həmin uşaq insana təsəlli verən və onu sevindirən adlardan məhrum qalır.

6. Şəriətə uyğun qanuni evlilik insanın nəsli-nəcabətini qoruyur və hər bir fərdi digərinə qarşı məsuliyyətli edir. Demək, hər bir kəs şəriətə uyğun evlilik nəticəsində öz atasını, anasını, qardaşını, bacısını, əmisini, dayısını, bibisini və xalasını tanıyır. Onların hər birinin hüquqları olduğu üçün həmin adam boynuna düşən məsuliyyətini dərk edir.

   Abdullah İbn Ömər ﵁ Peyğəmbərin ﷺ belə buyurduğunu rəvayət edir:

عن النبي ﷺ أنه قال: «ألا كلكم راع، وكلكم مسئول عن رعيته. فالأمير الذي على الناس راع، وهو مسئول عن رعيته. والرجل راع على أهل بيته، وهو مسئول عنهم. والمرأة راعية على بيت بعلها وولده، وهي مسئولة عنهم، والعبد راع على مال سيده وهو مسئول عنه، ألا فكلكم راع وكلكم مسئول عن رعيته». أخرجه البخاري في صحيحه ومسلم.

***"Sizin hər biriniz məsuliyyətlisiniz. Və tabeçiliyinizdə olanlara görə də məsuliyyət daşıyırsınız. İnsanlar üzərində rəhbərlik edən adam məsuliyyətlidir və onlara görə də məsuliyyət daşıyır. Kişi öz ailə üzvləri üzərində məsuliyyətlidir və onlara görə də məsuliyyət daşıyır. Qadın öz ərinin evi və uşaqları üzərində məsuliyyətlidir və onlara görə də məsuliyyət daşıyır. Kölə öz ağasının malı üzərində məsuliyyətlidir və ona görə də məsuliyyət daşıyır. Həqiqətən sizin hər biriniz məsuliyyətlisiniz"[1].*** Hər bir insanın ona məxsus hüquq və məsuliyyəti vardır. Bu hüquqları sahiblərinə çatdırmaq və məsuliyyəti dərk etmək üçün mütləq iki şəxs arasında sıx rabitə olmalıdır. Bunu bilməyin yeganə yolu isə öz nəslini tanımaq və qorumaqdır. Nəslin qorunması isə yalnız şəriətə uyğun *(qanuni)* evlilik vasitəsi ilə mümkündür.

7. Düzgün nikah dinin və İslam ümmətinin qorunmasında çox böyük əhəmiyyət daşıyır. Çünki evlənmək, Allaha ibadət edən bəndələrin yaradılması üçün halal vasitədir. Ona görə də evlənmək üçün seçim etdikdə din xüsusiyyətinə daha çox üstünlük vermək lazımdır.

[1] Buxari: 9\ 299\ № 5200. Müslim: 3\ 1459\ № 1829.

Peyğəmbər ﷺ evlənmək üçün seçim etmək istəyənlərə nəsihət olaraq buyurmuşdur:

قال النبي ﷺ: «فاظفر بذات الدين تربت يداك» . جزء من حديث أبي هريرة ﷺ، أخرجه البخاري في صحيحه ومسلم.

*"Dini xüsusiyyətə üstünlük ver! Xeyrə çatarsan"*[1]. Əgər nikah dini xüsusiyyət əsasında bağlanarsa, dünyaya gələcək yeni nəsil çox gözəl bir nəsil olar. Öz nəfsində Allahın dinini qoruyar, ailəsində yaxşılıqları əmr etmək və pisliklərdən çəkindirməklə dinini mühafizə edər. Həmçinin dinini qorumaq üçün düşmənlərinə qarşı Allah yolunda cihad edər. İslam cəmiyyətində mömin nəsil artdıqca ümmət özünü daha da arxayın hiss edər.

8. Evlənmək, ərdə kişilik, arvadda isə qadınlıq xüsusiyyətlərini təkmilləşdirir. Çox xüsusiyyətlər ailə həyatı qurduqdan sonra təkmilləşir. Məsələn, ər ilə arvadın bir-birlərinə qarşı hiss etdikləri ülfət, atalıq və analıq hissləri, nəvaziş və nəzakət hissləri, ərlə arvad arasında olan əlaqələrin təkmilləşməsi. Hər iki tərəfin ailə çərçivəsində öz boynuna düşən məsuliyyəti dərk etməsi. Kişi ailənin ehtiyaclarını ödəmək üçün özünü ciddi işə vurur, qadın isə evində səliqə-səhman yaratmaq və övladları düzgün, cəmiyyət üçün yararlı şəkildə tərbiyə etmək üçün əlindən gələni edir... bütün bunlar insan həyatını əks etdirən gözəl və qiymətli ailə həyatının nəticələridir.
9. Evlənmək cəmiyyətin təkmilləşməsi və inkişafına bir səbəbdir. Ona görə ki, o, insanın yer üzərində ən gözəl şəkildə çoxalmasına və qalmasına bir vasitədir. Bu haqda Allah taala buyurur:

[1] Buxari: 9\ 132\ № 5090. Müslim: 2\ 1086\ № 1466.

﴿ يَـٰٓأَيُّهَا ٱلنَّاسُ ٱتَّقُواْ رَبَّكُمُ ٱلَّذِى خَلَقَكُم مِّن نَّفْسٍ وَٰحِدَةٍ وَخَلَقَ مِنْهَا زَوْجَهَا وَبَثَّ مِنْهُمَا رِجَالاً كَثِيرًا وَنِسَآءً ﴾ (النساء:١)

**"Ey insanlar! Sizi tək bir şəxsdən (Adəmdən) xəlq edən, ondan zövcəsini (Həvvanı) yaradan və onlardan da bir çox kişi və qadınlar törədən Rəbbinizdən qorxun!..." (ən-Nisa: 1).**

﴿ وَٱللَّهُ جَعَلَ لَكُم مِّنْ أَنفُسِكُمْ أَزْوَٰجًا وَجَعَلَ لَكُم مِّنْ أَزْوَٰجِكُم بَنِينَ وَحَفَدَةً ﴾ (النحل:٧٢)

**"Allah sizin üçün özünüzdən (Adəm və Həvvadan, yaxud öz cinsinizdən) zövcələr yaratdı, zövcələrinizdən də sizin üçün oğullar, nəvələr əmələ gətirdi,..." (ən-Nəhl: 72).**

Bütün insanların evlənməkdən imtina etdiklərini fərz etsək, yer üzündən insaniyyətin silindiyini və əvəzində heyvaniliyin yayılmasının şahidi olarıq. Bu isə, dünyanın korlanması və xaraba qalması deməkdir.

10. Evlənmək, ruzinin bərəkətlənməsi üçün bir səbəbdir. Uca Allah bu haqda Öz kitabında belə buyurur:

﴿ وَأَنكِحُواْ ٱلْأَيَـٰمَىٰ مِنكُمْ وَٱلصَّـٰلِحِينَ مِنْ عِبَادِكُمْ وَإِمَآئِكُمْ إِن يَكُونُواْ فُقَرَآءَ يُغْنِهِمُ ٱللَّهُ مِن فَضْلِهِۦ وَٱللَّهُ وَٰسِعٌ عَلِيمٌ ﴿٣٢﴾ ﴾ (النور: ٣٢)

**"(Ey möminlər!) Aranızda olan subay kişiləri və ərsiz qadınları, əməlisaleh (yaxud evlənməyə qabil) kölə və cariyələrinizi evləndirin. Əgər onlar yoxsuldurlarsa, Allah öz lütfü ilə onları dövlətli edər. Allah (lütfü, mərhəmətilə) genişdir, (hər şeyi) biləndir!" (ən-Nur: 32).**

Allah taala bol ruzi və bərəkət sahibidir. Onun lütfü çox genişdir. O, insanları evlənməyə və evləndirməyə təşviq etmiş, əməlisaleh evlənənlərə kasıblıqdan sonra bol ruzi vəd etmişdir. Allahdan daha doğru danışan varmı!

11. Evlənmək, insanı bir çox bədən və əxlaq xəstəliklərindən mühafizə edir. Ona görə Allah taala Öz kitabında evli adamı qorunan adlandıraraq buyurur:

﴿ وَأُحِلَّ لَكُم مَّا وَرَآءَ ذَٰلِكُمْ أَن تَبْتَغُواْ بِأَمْوَٰلِكُم مُّحْصِنِينَ غَيْرَ مُسَٰفِحِينَ ﴾ (النساء: ٢٤)

**"Bunlardan başqaları isə namusla (iffətlə), zinakarlığa yol vermədən, mallarınızı sərf edərək evlənmək üçün sizə halal edildi...." (ən-Nisa: 24).**

﴿ مُحْصَنَٰتٍ غَيْرَ مُسَٰفِحَٰتٍ ﴾ (النساء: ٢٥)

**"İffətini qoruyub saxlayan, zinakarlıq etməyən ..." (ən-Nisa: 25).**

Ərəb dilində İffətli qadına *"Muhsan"* deyilir. Bu sözün lüğəti mənası: qala divarları arxasında qorunan - deməkdir. Həmçinin evlənən adam da, bu işlə sanki özünə belə bir qala inşa edir və onunla əxlaqını, bədənini və s. qoruyur.

Həmçinin Allah taalanın həm kişiyə və həm də qadınlara verdiyi cinsi şəhvət uzun müddət həbs edilərsə, bunun bədəndə və s. çox pis fəsadları ortaya çıxar. Millət qəzetinin 1959\ 06\ 06 tarixində yaydığı məlumatda BMT-ın qərarı haqqında belə deyilir: ***"Kişi və qadınlar arasında subay, evlənib boşanmış və ya dul olmasından asılı olmayaraq, evli adamlar subay adamlardan daha çox yaşayırlar... Evli olmayanlara nisbətən, evlilər arasında olan, müxtəlif yaşları əhatə edən ölüm fərqləri daha azdır".*** Buna əsasən demək olar ki, evlənmək həm kişi, həm də qadınların sağlamlıqlarına eyni səviyyədə xeyirdir.

12. Evliliyin faydaları yalnız dünya həyatını əhatə etmir, hətta ölümdən sonrakı həyata da şamil olunur. İnsan öldükdə özündən sonra onun üçün dua edən əməlisaleh zürriyyət qoyub gedərsə bu Allahın rəhmətinə nail olmaq, axirətdə savab

qazanmaq üçün bir səbəb olar. Əbu Hureyrə ﷺ Peyğəmbərin ﷺ belə buyurduğunu xəbər verir:

أن رسول الله ﷺ قال: «إذا مات الإنسان انقطع عنه عمله إلا من ثلاثة إلا من صدقة جارية أو علم ينتفع به أو ولد صالح يدعو له». أخرجه مسلم.

***"İnsan vəfat etdikdən sonra yalnız üç əməldən: daimi qalan sədəqə (xeyirxah iş), öyrətdiyi faydalı elm və ya onun üçün dua edən əməlisaleh övladdan başqa, onun bütün əməlləri kəsilir"[1].***

13. İslam şəriəti evlənməyi qanuniləşdirmiş və müsəlmanlar üçün evlənməyin hökmlərini, şərtlərini, əsaslarını açıq-aşkar göstərən bir qayda yaratmışdır. Müsəlmana daimi və ya müvəqqəti evlənməsi qadağan olan qadınları təyin etmiş, evlənməsi halal olan qadınları açıqlamışdır. Onlara, həqiqi evliliyi batil evlilikdən ayırd etmək üçün qiyamət gününə qədər qalan və heç bir ölkədə dəyişməyən ümumi qayda-qanunlar buyurmuşdur. Bu, Allah taalanın İslama və müsəlmanlara verdiyi xüsusi özəllik və nemətdir. İslamda gördüyün bu qanunları, başqa dinlərdə belə açıqlama və təfsilatla görməzsən.

Xülasə: İslam şəriəti evlənməyi qanun etməklə insana çox böyük bir xeyirxahlıq və yaxşılıq etmişdir. Çünki bu işdə insanın dünyası və axirəti üçün çoxlu məsləhət və xeyir vardır. Allah taala evlənməyin faydalarını çox qısa və mənalı cümlədə bəyan etmiş və buyurmuşdur:

﴿ هُنَّ لِبَاسٌ لَّكُمْ وَأَنتُمْ لِبَاسٌ لَّهُنَّ ﴾ (البقرة: ١٨٧)

**"Onlar (qadınlarınız) sizin, siz də onların libasısınız. ..." (əl-Bəqərə: 187).**

---

[1] Müslim: 3\ 1255\ № 1631.

Paltar insanın bədənini qoruduğu və onu isitdiyi kimi, evlilik də hər iki tərəfin bir-birlərini onların əxlaqına, namuslarına, şərəflərinə, bədənlərinə pis təsir edən bütün naqisliklərdən uzaqlaşdırır və qoruyur.

## İkinci: Çoxevliliyə icazə verilməsi:

İslam, çoxevliliyə icazə vermişdir. Hər bir müsəlman eyni vaxtda birdən artıq qadınla evlənə bilər. Lakin eyni zamanda həmin qadınların sayı dörddən çox olmamalıdır. Bu məsələ Qurani Kərimdə, Sünnədə *(hədislərdə)* və alimlərin sözlərində öz əksini tapmışdır.

Qurandan sübut: Allah taala buyurur:

﴿ وَإِنْ خِفْتُمْ أَلَّا تُقْسِطُوا۟ فِى ٱلْيَتَـٰمَىٰ فَٱنكِحُوا۟ مَا طَابَ لَكُم مِّنَ ٱلنِّسَآءِ مَثْنَىٰ وَثُلَـٰثَ وَرُبَـٰعَ ۖ فَإِنْ خِفْتُمْ أَلَّا تَعْدِلُوا۟ فَوَٰحِدَةً أَوْ مَا مَلَكَتْ أَيْمَـٰنُكُمْ ۚ ذَٰلِكَ أَدْنَىٰٓ أَلَّا تَعُولُوا۟ ﴿٣﴾ ﴾ (النساء: ٣)

**"Əgər yetim qızlarla (evlənəcəyiniz təqdirdə) ədalətlə rəftar edə bilməyəcəyinizdən qorxarsınızsa, o zaman sizə halal olan (bəyəndiyiniz) başqa qadınlardan iki, üç və dörd nəfərlə nikah bağlayın! Əgər (onlarla da) ədalətlə dolanmağa əmin deyilsinizsə, o halda təkcə bir nəfər (azad) qadın və ya sahib olduğunuz kənizlə evlənin (yaxud: o halda təkcə bir nəfər azad qadınla evlənin və ya əlinizin altında olan kənizlərlə kifayətlənin). Bu, ədalətli olmağa (ədalətdən kənara çıxmamağa) daha yaxındır." (ən-Nisa: 3).**

Sünnədən *(hədislərdən)* dəlil: Peyğəmbər ﷺ dörd arvad almış səhabələrə bunu inkar etməzdi. Həmçinin İslamı yeni qəbul etmiş səhabənin dörddən çox arvadı olduqda Peyğəmbər ﷺ həmin səhabəyə dörd arvad ilə kifayətlənməyi, digərlərini isə boşamağı əmr edərdi.

Həmçinin səhabələr, tabeinlər və bütün İslam alimləri şəriətdə deyilən şərtlər əsasında dörd arvad almağın halal olduğunu qeyd etmişlər.

İslam şəriətinin çoxevlilik baxımından alicənablığının və ortalığının *(neytrallığının)* açıqlanması:

1. İnsanlar, İslam şəriəti gəlməmişdən öncə evlilik məsələsində iki hissəyə bölünmüşdülər: Bir hissə çoxevliliyə tam icazə verir, qadınların haqlarının tapdalanmasına, mənimsənilməsinə baxmayaraq bunun üçün müəyyən say təyin etmirdilər. Digər hissə insanlar isə, kişilərə çətinlik yaransa da qəti olaraq təkevliliyi dəstəkləyirdilər.

İslam şəriəti gəldikdən sonra çoxevlilikdə ifrata varanlardan və təkevliliyi qanun etməklə insanları məhrum edənlərdən fərqli olaraq, özünə orta mövqe götürdü. O, eyni vaxtda arvadların sayının dörddən çox olmaması, onların arasında ədalətliliyin olması, qadının maddi və cismi ehtiyaclarını kişinin ödəməsi şərti ilə çoxevliliyə icazə verdi.

2. Cinsi fəallığın güclü olmasına, yaxud qadınların hamiləlik, doğuş, aybaşı, nifas, əldən düşmə və s. hallarıyla üzləşmələrinə görə bəzi kişilərə bir arvad kifayət etmir. Belə kişilər çoxevlilikdən məhrum edildikdə və təkevliliyə məruz qaldıqda özlərinə qeyri qanuni çıxış yolları: zina, uşaqbazlıq və s. tapacaq, təmiz və iffətli qadınlarla evlənmək əvəzinə, natəmiz qadınlarla yaxınlıq edərək ehtiyaclarını ödəyəcəklər. Hal-hazırda çoxevliliyi qadağan edən ölkələrdə bu vəziyyət açıq-aşkar görsənməkdədir. Elə bu qanunlarla yaşayan ölkə əhalisi də buna şahidlik edərək deyirlər: "Şərq ölkələri çoxevliliyə icazə verməklə yenə də doğru qərar vermişlər. Çünki bu, insaniyyətin etiraf etdiyi bir əsasdır. Çox təəccüblüdür ki, çoxevliliyi inkar edən avropalılar öz əməllərində buna qarşı çıxırlar. Mən onların arasında bir nəfərin də olsa, təkevliliyə lazımı qaydada riayət etdiyini sanmıram".

Başqa birisi isə deyir: "Xaçpərəstlik dininin çoxevliliyi qadağan edib, təkevliliyi təkidlə insanlara məcbur etməsi həqiqətdirmi? Bu qanuna heç əməl edən varmı? Sualın cavabında "Bəli" deyən adam mütləq buna gülməlidir. Çünki, məsələn, biz qədim Fransa krallarına fikir versək onların saraylarında neçə-neçə arvadların və aşnaların olduğunu görərik. Belə olmasına baxmayaraq kilsə həmin krallara çox böyük müqəddəslik və ehtiramla yanaşırdı. Çoxevlilik təbii qanundur və o, dünyanın sonuna qədər davam edəcəkdir. Ona görə xaçpərəstliyin qoyduğu bu qanun istənilən nəticəni verməmişdir... Xaçpərəstliyin zahirən iddia etdiyi təkevlilik qanununun bir neçə həlakedici zərəri vardır və bunlardan üçünü qeyd etmək mümkündür. Əxlaqsızlıq, dul qadınlar və qanunsuz uşaqlar. Bu ictimai xəstəliklər pis əxlaq daşıyıcısıdır. Belə xəstəliklər İslam şəriəti tam tətbiq olunan ölkələrdə müşahidə olunmurdu. Yalnız qərb mədəniyyəti gəldikdən sonra bu xəstəliklər yayılmağa başlamışdır".

Aşna qadınlarla yaxınlıq edən və homoseksualizmlə məşğul olan cəmiyyətlərə baxdıqda, onların heyvani həyat sürdüklərini gördükdə, İslam şəriətinin çoxevliliyi halal etməsinin sirrini aşkar edirik. İslamın bütün nəsillərə, irqlərə, zaman və məkana münasib fitri din olmasını dərk edirik.

3. Hər iki tərəfi nəzərə almaq. Ümumiyyətlə kişilər çətin işlərə baş vurduqlarından onların arasında ölüm hadisələri daha çox olur. Əgər qadınlara nisbətən daha çox vəfat edən kişilərdirsə, deməli qadınların sayı kişilərin sayından daha çoxdur. Həmin qadınların onlara kömək edən və onların namusunu qoruyan kişilərə ehtiyacları vardır. Bunun ən sağlam yolu yalnız çoxevliliyə icazə verilməsidir.
4. İnsan cəmiyyətləri kişilərin kəskin şəkildə azalması ilə üzləşir. Xüsusən də müharibələrdən sonra bu vəziyyət daha da

acınacaqlı olur. Əgər çoxevliliyə icazə verilməsə onda bir çox qadınlar onlara həm maddi, həm mənəvi kömək edə biləcək ərsiz qalmalıdırlar.
Bunun əyani tarixi sübutu ikinci dünya müharibəsi (1939-1945) dövründə iyirmi milyondan çox kişinin məhv edilməsidir. Belə olduğu halda dul qadınların sayı çoxalıb hətta iyirmi beş milyona çatmışdı. Ona görə o vaxtlar özünə ər tapan qadın sanki qiymətli bir xəzinə tapırdı. Almaniyada qadınlar böyük nümayişlərə çıxır və çoxevliliyə icazə verilməsini tələb edirdilər. Hətta iş o yerə gəlib çatmışdı ki, Almaniya dövləti məsələnin həlli üçün Misirin əl-Əzhər universitetindən *(İslamda çoxevlilik qanunu)* haqda məlumatlar almışdır. Dünya gənclər birliyi təşkilatı 1948-ci il Almaniyanın Münhen şəhərində keçirdiyi konfransda demişdir: Bu məsələnin yeganə həlli çoxevliliyə icazə verməkdir.

5. Hər hansı ölkədə kişilərin azalması müşahidə edildikdə və ölkə kişilərin sayını çoxaltmaq istədikdə ən əlverişli və səmərəli həll çoxevlilikdir.
6. Bir qadınla evlənən kişinin həyat yoldaşı müəyyən bir müddətdən sonra hansısa xəstəlik və ya qüsurla üzləşir, ərinin və ailəsinin haqlarını ödəməkdə acizlik çəkir, yaxud qadın qısır olur və s. Buna baxmayaraq onların arasında məhəbbət olduğundan onlar bir-birindən ayrılmaq istəmirlərsə, kişi də öz ehtiyaclarını ödəmək və övlad sevgisi məcburiyyətində qalarsa, bütün bu hallarda İslam şəriəti kişini pis işlərdən qoruyan ikinci evlilikdən məhrum etmir. Həmçinin ikinci qadın almış kişi özünün övlad arzusuna yetişir və bununla o xoşbəxtlik hissləri keçirir.

Həmçinin belə hallarda kişinin öz keçmiş həyat yoldaşını boşaması heç də məqsədyönlü deyildir. Əksinə, kişilik və insaniyyətə görə o keçmiş həyat yoldaşını saxlamalı, ona hər cür köməklik etməli, onu şəfqət və yaxşılıqdan məhrum etməməlidir. Həmçinin belə qadının öz əri ilə qalması boşanmasından daha

xeyirlidir. Çünki belə vəziyyətdə boşanan qadınla heç kəs evlənmək istəməz və beləliklə o dul qalmalı olacaq, özünü şəfqət və yaxşılıqdan məhrum edəcəkdir. Ələlxüsus İslam şəriəti qadına qarşı ədalətli olmağı əmr etmiş, ona zülm etməyi və haqqını tapdalamağı haram saymışdır.

7. Həm də ola bilər ki, bir kişi iş dalınca digər ölkələrə çox və uzunmüddətli səfər etsin və hər dəfə ailəsini özü ilə aparmağa gücü çatmasın və ya hansısa maneə olsun. Belə halda kişi haram iş görəcəyindən qorxarsa, ağıl və məntiqə görə ona ikinci evlilik üçün icazə verilməlidir ki, o, haram və çirkin işlərə qurşanmasın.

Sonda onu demək olar ki, İslam şəriətinin təyin etdiyi qanun çərçivəsində çoxevliliyin insan cəmiyyəti üçün çox böyük əhəmiyyəti vardır. Çünki hər bir cəmiyyət kişi və qadınlardan ibarətdir. Hər bir fərdin özünə məxsus ictimai problemləri vardır. Bu problemlərin həlli isə yalnız çoxevliliyə icazə verməkdədir. İslam şəriəti də problemlərin həlli üçün bu qapını açmış və onun istifadəsini şəriət qanunları çərçivəsində təyin etmişdir. Bütün bunlar İslam dininin alicənablığı və gözəlliyinin sübutudur. İslam şəriətinin qanunları insanların problemlərini həll etməyə zəmanət verir. O, irqindən və cisindən, zamanından və məkanından asılı olmayaraq hamıya aiddir.

## Üçüncü: Talaq *(boşamaq):*

Talaq – qanuni evliliyin yerində və ya gələcəkdə pozulmasını bildirən söz və ya onu əvəz edən işarə, yazı və s. ilə sona yetməsidir.

**Talaq haqda şəriət dəlilləri:**

Bu haqda Quran və hədislərdə bir çox dəlillər mövcuddur. Allah taala buyurur:

﴿ٱلطَّلَٰقُ مَرَّتَانِۖ فَإِمۡسَاكُۢ بِمَعۡرُوفٍ أَوۡ تَسۡرِيحُۢ بِإِحۡسَٰنٖ﴾ (البقرة: ٢٢٩)

**"(Rici) talaq vermə (boşama) iki dəfə mümkündür, ondan sonra yaxşı dolanmaq (qadını yaxşı saxlamaq), ya da xoşluqla ayrılmaq (buraxmaq) gərəkdir...." (əl-Bəqərə: 229).**

﴿ يَٰٓأَيُّهَا ٱلنَّبِيُّ إِذَا طَلَّقۡتُمُ ٱلنِّسَآءَ فَطَلِّقُوهُنَّ لِعِدَّتِهِنَّ وَأَحۡصُواْ ٱلۡعِدَّةَ ﴾ (الطلاق: ١)

**"(Ya Peyğəmbər!) Övrətləri boşadığınız zaman onları gözləmə müddətlərində (heyzdən pak olduqdan sonra) boşayın. Gözləmə müddətini (iddəti) sayın. ..." (ət-Talaq: 1).**

كان الطلاق على عهد رسول الله ﷺ وأبي بكر وسنتين من خلافة عمر، طلاق الثلاث واحدة. فقال عمر بن الخطاب: «إن الناس قد استعجلوا في أمر قد كانت لهم فيه أناة فلو أمضيناه عليهم فأمضاه عليهم» . أخرجه مسلم.

*İbn Abbas ﷺ deyir: Peyğəmbərin ﷺ vaxtında, həmçinin Əbu Bəkrin və Ömərin (Allah onlardan razı olsun) xilafəti dövründə üç talaq bir sayılırdı. Ömər İbn Xəttab ﷺ belə buyurdu: "İnsanlar onlara möhlət verilmiş bir işdə (yəni, üç dəfə deyilən talağın bir sayılmasından istifadə edərək rəcə müddətini gözləməyərək) yaman tələsirlər. Bəlkə bu üç talağı elə üç talaq sayaq!" Sonra üç dəfə deyilən talağı bir deyil üç saydı"*[1].

Elə bu dəlillərə əsasən bütün müsəlmanlar talağın *(boşamanın)* icazəli olması fikrindədirlər. Talaq Peyğəmbərin ﷺ vaxtından bu günə qədər davam edən bir işdir.

Talağın şəriət hökmü etmək baxımından İslam dininin gözəllikləri:

İslam ailənin sağlamlığına çox böyük əhəmiyyət verir və ona xələl yetirə biləcək ən uzaq təhlükəni belə ondan uzaqlaşdırır. Bunun

---

[1] Müslim: 2\ 1091\ № 1472.

üçün müvafiq tədbirlər buyurur və beləliklə ailədə baş vermiş hər bir xəstəliyin qarşısını alır. Deyilənlərin təsdiqi olaraq İslam şəriətinin talaq haqda buyurduğu ehkamlara nəzər salmaq kifayətdir.

1. İslam şəriəti müsəlmanlara, talaqın baş verə biləcəyinin real olmasını onların nəfslərinə həkk etmişdir. Evlikdən əsas məqsəd bu həyatı sona qədər yaşatmaqdır. Hər-hansı bir nigaha vaxt təyin edilərsə o nigah batil sayılır. Ona görə siğə *(mutə)* etmək, müvəqqəti evlənmək kimi nigahları haram etmişdir. İslam, evlənməkdən ləzzət aldıqdan sonra onu dağıtmağı qadağan edir və evlənənləri sona ana qədər qoşa yaşamağa sövq edir.
2. İslam, talaqın baş verməməsi üçün əvvəlcədən məsləhətlər vermişdir və daha əhəmiyyətli olan məsləhətlər aşağıdakılardır:
   A. İslam, evlənmək istəyənlərə gözəl seçim etməyi buyurmuş və bu seçimdə onlara sərbəstlik vermişdir. Ona görə də hər kəs məcburiyyət olmadan öz sevdiyini seçir və onunla həyat qurur. Heç şübhəsiz ki, bu da ailənin davamiyyətli olmasına əsas səbəblərdəndir.
   B. İslam, evlənənləri gözəl davranışa rəğbətləndirmişdir. Kişilərə qadınlarla yaxşı davranmağı, qadınlara isə ərlərinə itaət etməyi əmr etmiş və hər iki tərəfə buna görə çox böyük savab vəd etmişdir. Bu mənalarda olan şəriət dəlilləri həddindən artıq çoxdur.
   C. İslam, evlənənləri bir-birlərində olan eyiblərə və xoşlamadıqları xüsusiyyətlərə qarşı səbirli və təmkinli olmağa çağırmışdır. Allah təalə buyurur:

﴿ وَعَاشِرُوهُنَّ بِٱلۡمَعۡرُوفِۚ فَإِن كَرِهۡتُمُوهُنَّ فَعَسَىٰٓ أَن تَكۡرَهُواْ شَيۡـٔٗا وَيَجۡعَلَ ٱللَّهُ فِيهِ خَيۡرٗا كَثِيرٗا ١٩ ﴾ (النساء: ١٩)

**"Onlarla gözəl (Allahın buyurduğu kimi) rəftar edin. Əgər onlara nifrət etsəniz (dözün). Ola bilsin ki, sizdə nifrət doğuran hər hansı bir şeydə Allah (sizdən ötrü) çoxlu xeyir nəzərdə tutmuş olsun." (ən-Nisa: 19).**

Əbu Hureyrə ﵁ Peyğəmbərin ﷺ belə buyurduğunu deyir:

«لا يفرك مؤمن مؤمنة إن كره منها خلقا رضي منها غيره» . أخرجه مسلم.

***"Mömin kişi mömin qadına nifrət etməz. Onun bir xüsusiyyətinə nifrət etsə, digər xüsusiyyətindən razı qalar"[1].***

D. İslam, qadına səbəbsiz yerə kişidən boşanma tələb etməkdən çəkindirmişdir. Hədislərin birində Peyğəmbər ﷺ buyurmuşdur:

«أيما امرأة سألت زوجها الطلاق من غير ما بأس فحرام عليها رائحة الجنة» . أخرجه أبو داود في سننه والترمذي في سننه والحاكم، وحسنه الترمذي وصححه الحاكم على شرط الشيخين ووافقه الذهبي وصححه الألباني على شرط مسلم. انظر: إرواء الغليل.

***"Heç bir səbəb olmadan ərindən boşanma tələb edən qadına cənnətin iyi haram olar"[2].***

E. İslam, evlilik həyatında baş verə biləcək problemlərin həlli olaraq: yüngül həlldən ağıra doğru - iki çıxış yolu qoymuşdur.

**Birinci çıxış yolu:** Ərlə arvad arasında ailə sirrini qoruyub saxlamaq və camaatın dilində söz-söhbətlər gəzməmək üçün kişinin əlaqələri düzəltmək üçün atacağı addımlar. Bu mərhələdə problemlərin həlli üç mərhələdən ibarətdir:

---

[1]Müslim: 2\ 1099\ № 1469.

[2] Əbu Davud, Tirmizi və Hakim rəvayət ediblər. Tirmizi hədisin həsən, Hakim səhih və iki alimin (Buxari və Müslimin) şərtinə uyğun olduğunu deyib, Zəhəbi də Hakimin sözünü təsdiqləyib. Albani isə hədisin Müslimin şərtlərinə əsasən səhih olduğunu deyib. Bax: İrvaul Ğəlil kitabı: 7\ 100\ № 2035.

**İlkin mərhələ:** Öyüd-nəsihət, yol göstərmə, xəbərdarlıq və xatırlatma. Bu üslub unudana, qəflətdə olana fayda verə bilər və məsələyə ciddi və məsuliyyətli yanaşmaqla problem həll olunar.

**İkinci mərhələ:** Arvadla yaxınlıqdan imtina etmək və yatağını ayırmaq: Əgər öyüd-nəsihət öz səmərəsini verməsə onda kişi məsələnin həlli üçün ikinci mərhələyə əl atır. Bu mərhələdə, qadınla birgə yeyib-içmək, danışmaq və xoş davranmaq lazımdır. Yalnız cinsi yaxınlıqdan imtina etmək və yatağını ayırmaq kifayətdir.

**Üçüncü mərhələ:** Əgər qadın inadkar olsa, bir və ikinci mərhələlər müsbət nəticə verməsə bu zaman kişi qadını yüngülcə vura bilər. Lakin bədəninin üz, həssas, ağradıcı yerlərinə vurmaqdan çəkinmək lazımdır. Həmçinin zərbə çox qüvvətli: sümüyü sındıran, yaralayan və ya zədəsi qalan - olmamalıdır.

Allah təalə buyurur:

﴿ وَٱلَّٰتِي تَخَافُونَ نُشُوزَهُنَّ فَعِظُوهُنَّ وَٱهۡجُرُوهُنَّ فِي ٱلۡمَضَاجِعِ وَٱضۡرِبُوهُنَّۖ فَإِنۡ أَطَعۡنَكُمۡ فَلَا تَبۡغُواْ عَلَيۡهِنَّ سَبِيلاً ﴾ (النساء: ٣٤)

**"(Ey kişilər!) Özbaşınalıq etmələrindən qorxduğunuz qadınlara nəsihət edin, (yola gəlməzsə) onlardan yatağınızı ayırın və döyün! Sizə itaət etdikdə isə daha onlara (əziyyət vermək üçün) başqa yol axtarmayın. Əlbəttə, Allah ucadır, böyükdür!" (ən-Nisa: 34).**

Deyilən bu üç mərhələ qadının özbaşnalığını islah etmək üçün nəzərdə tutulmuşdur. Allah təalə Yaradan olduğu üçün insanların təbiətini də gözəl bilir. O bilir ki, elə qadınlar var ki, onlara gözəl söz, öyüd-nəsihət bəs edir. Bəzi qadınlar yalnız tərk olunduqda, digər qism qadınlar isə döyülməklə islah olunurlar.

Bunların hamısı problemlərin həlli üçün bu ardıcıllıqla ailə daxilində aparılan proseslərdir. Əgər deyilənlər səmərəsiz olsa onda problemin sonuncu həlli:

**Ikinci çıxış yolu: Münsif *(vasitəçi)* təyin etmək;**

Əgər ərlə arvad özləri problemləri həll edə bilməsələr onda hər iki tərəfdən münsiflər *(vasitəçilər)* seçilir. Seçilmiş münsiflər öz aralarında olan qohumluq əlaqələrini qoruyub saxlamaq üçün məsələnin həllinə çoxlu yollar axtaracaqlar. Ona görə yaxşı olar ki, münsiflər onların yaxın qohumlarından olsunlar. Çünki qohum öz əqrabasının problemlərinə daha yaxşı bələddir. Əgər bu cür münsif tapmaq mümkün olmasa onda qohum olmayan birisini bu işdə təyin etmək olar. Çünki bütün möminlər qardaş və dostdurlar.

Allah təalə buyurur:

﴿ وَإِنْ خِفْتُمْ شِقَاقَ بَيْنِهِمَا فَٱبْعَثُواْ حَكَمًا مِّنْ أَهْلِهِۦ وَحَكَمًا مِّنْ أَهْلِهَآ إِن يُرِيدَآ إِصْلَٰحًا يُوَفِّقِ ٱللَّهُ بَيْنَهُمَآ ﴾ (النساء: ٣٥)

**"(Ey möminlər!) Əgər ər-arvad arasında ixtilaf olacağından qorxsanız, o zaman kişinin adamlarından bir nəfər və qadının adamlarından da bir nəfər münsif (vasitəçi) təyin edib (onların yanına) göndərin. Əgər onlar (bu iki vasitəçi ər-arvadı) barışdırmaq istəsələr, Allah da onların köməyi olar. Həqiqətən, Allah (hər şeyi) biləndir, (hər işdən) xəbərdardır!" (ən-Nisa: 35).**

***"Əgər onlar (bu iki vasitəçi ər-arvadı) barışdırmaq istəsələr, Allah da onların köməyi olar."* ayəsi münsiflərə bu işdə ədalətli olmaq, ailənin dağılmaması üçün əllərindən gələn səbəblərdən istifadə etmələri haqda göstəriş verir. Əgər onlar deyilənlərə əsasən hərəkət etsələr Allah təalə də onları tək qoymaz və onlara doğru qərar çıxarmaqda kömək edər.**

3. İslam, talaq etmək üçün müəyyən şərtlər təyin etmişdir. Bu şərtlərin bəziləri talaqın baş verməsinin qarşısını alır, digərləri isə onun zərərlərini azaldır. Bu deyilənlərə aşağıda açıqlama verəcəyik:

a. Talaq yalnız zərurət doğuran səbəblərə görə ola bilər. Əgər deyilən səbəblər yoxdursa kişi talaq verməkdən çəkinməlidir. Allah təalə buyurur:

﴿ فَإِنْ أَطَعْنَكُمْ فَلَا تَبْغُوا۟ عَلَيْهِنَّ سَبِيلًا ۗ إِنَّ ٱللَّهَ كَانَ عَلِيًّا كَبِيرًا ﴾ (النساء: ٣٤)

**"Sizə itaət etdikdə isə daha onlara (əziyyət vermək üçün) başqa yol axtarmayın. Əlbəttə, Allah ucadır, böyükdür!" (ən-Nisa: 34).**

b. Kişi öz həyat yoldaşını heyzli *(aybaşı)* halda, yaxud heyzdən təmizlənib sonra yaxınlıq etdiyi qadını da belə halda boşamamalıdır. Yalnız heyzdən təmizlənib sonra yaxınlıq etmədiyi qadınını boşaya bilər. Allah təalə buyurur:

﴿ يَـٰٓأَيُّهَا ٱلنَّبِىُّ إِذَا طَلَّقْتُمُ ٱلنِّسَآءَ فَطَلِّقُوهُنَّ لِعِدَّتِهِنَّ وَأَحْصُوا۟ ٱلْعِدَّةَ ۖ وَٱتَّقُوا۟ ٱللَّهَ ﴾(الطلاق: ١)

**"(Ya Peyğəmbər!) Övrətləri boşadığınız zaman onları gözləmə müddətlərində (heyzdən pak olduqdan sonra) boşayın. Gözləmə müddətini (iddəti) sayın. Rəbbiniz olan Allahdan qorxun." (ət-Talaq: 1).**

Bu şəriət hökmündə bir çox hikmətlər mövcuddur və ən önəmlisi odur ki: Hikmətli şəriət sahibi olan Allah insanları talaqdan çəkindirməklə onların ailə həyatlarının uzunmüddətli olmasını buyurur. Əgər kişi qadını heyzli halda və ya cinsi əlaqədə olduğu təmizlik müddətində boşamaq istəsə o qadının heyzdən təmizlənməsini, yaxud cinsi əlaqədə olmayacağı təmizliyi gözləməlidir. Qarşısında belə bir vaxt olan adam boşanma haqda daha dərindən fikirləşər. Bu müddətdə o boşanma niyətini də dəyişə bilər. Belə olduqda ailə olduğu kimi qalar və qohumluq da davam edər.

c. Əgər kişi öz yoldaşını boşamaq istəsə o boşanma üçün iki nəfər adil müsəlmanı bu işdə şahid tutmalıdır. Allah təalə buyurur:

﴿وَأَشۡهِدُواْ ذَوَيۡ عَدۡلٖ مِّنكُمۡ وَأَقِيمُواْ ٱلشَّهَٰدَةَ لِلَّهِ﴾ (الطلاق: ٢)

**"*(Sonradan aranızda ixtilaf olmasın deyə)* içərinizdən iki ədalətli şahid tutun. *(Siz də ey şahidlər!)* Allah üçün *(doğru)* şahidlik edin!..." (ət-Talaq: 2).**

Heç şübhəsiz şahidləri seçmədən öncə kişi bu işin məsuliyyəti haqda daha da dərindən düşünür, özünün tam istəyi və düşüncəsi ilə bu işə qərar verir. Elə boş-boş adi bir sözlə talaq vermir. Şahid tapmaq və ya gətirmək onu bu işdə daha da məsuliyyətli edir.

4. İslam şəriəti talaq kəlməsini ailə həyatını dağıtmaq üçün qiymətsiz bir söz etməmiş, əksinə ailə problemlərinin həlli və müalicə yolunu tutmuşdur. Kişiyə üç talaqı üç müxtəlif vaxtlarda söyləməyi buyurmuşdur. Allah təalə buyurur:

﴿ ٱلطَّلَٰقُ مَرَّتَانِۖ فَإِمۡسَاكُۢ بِمَعۡرُوفٍ أَوۡ تَسۡرِيحُۢ بِإِحۡسَٰنٖ ﴾ (البقرة: ٢٢٩)

**"*(Rici)* talaq vermə *(boşama)* iki dəfə mümkündür, ondan sonra yaxşı dolanmaq *(qadını yaxşı saxlamaq),* ya da xoşluqla ayrılmaq *(buraxmaq)* gərəkdir..." (əl-Bəqərə: 229).**

﴿ فَإِن طَلَّقَهَا فَلَا تَحِلُّ لَهُۥ مِنۢ بَعۡدُ حَتَّىٰ تَنكِحَ زَوۡجًا غَيۡرَهُۥ ﴾ (البقرة: ٢٣٠)

**"Əgər *(kişi)* övrətini yenə də *(üçüncü dəfə)* boşarsa, o zaman *(qadın)* başqa bir ərə getməmiş ona *(əvvəlki ərinə)* halal olmaz...." (əl-Bəqərə: 230).**

Şəriət, arvadını boşamaq niyətində olan kişiyə ilk olaraq rici talaq *(arvadını qaytarmaq mümkün olan boşama)* verməsini əmr etmişdir. Belə halda ər-arvad yenidən fikirlərini dəyişə və əvvəlki ailəlik həyatlarında dönə bilərlər. Bu onlar üçün bir fürsətdir.

Əgər birinci rici talaq problemlərin və ailədaxili qarışıqlığın qarşısını almazsa onda kişi ikinci talaqı versə onda yenidən ailə həyatına qayıtmaq üçün yalnız bir fürsət qalmış sayılır. Və bu sonuncu şansda hər ikisi məsələnin ciddiliyini və təhlükəsini dərk

etməli və məsuliyyətli olmalıdırlar. Bir və ikinci talaq fayda verməzsə kişi üçüncü talaqı verir. Sonra onlar bir daha bu ailə həyatına qayıda bilməzlər. Yalnız çətin bir şərtdən sonra əvvəlki ailə həyatına qayıda bilərlər. Deyilən bu çətin şərt Allah təalənin bu ayəsində buyurulur:

﴿ فَلَا تَحِلُّ لَهُۥ مِنۢ بَعۡدُ حَتَّىٰ تَنكِحَ زَوۡجًا غَيۡرَهُۥ ﴾ (البقرة:٢٣٠).

**"Əgər *(kişi)* övrətini yenə də *(üçüncü dəfə)* boşarsa, o zaman *(qadın)* başqa bir ərə getməmiş ona *(əvvəlki ərinə)* halal olmaz." (əl-Bəqərə: 230).**

Heç şübhəsiz, bu şərti fikirləşən kişi arvadını əbəs yerə boşamaz. Kişi birinci və ikinci talaqı verib yenidən övrəti *(arvadı)* ilə ailə həyatına qayıdandan sonra üçüncü talaqı verməyə məcbur olursa deməli bu ailəlikdən bir fayda yoxdur və onların ayrılmaları daha xeyirlidir.

Islamda buyurulan talaq qanunu necə də gözəldir. Bax gör Islam şəriəti ailə həyatını qorumaq üçün necə qayğı göstərir. Kişiyə bir necə mərhələlik fürsət verir və əvvəldə dediyimiz şərtləri onun qarşısına qoyur ki, əgər haradasa bir müsbət cəhət baxımından bəlkə də ailə dağılmaz və əvvəlki vəziyyətdə davam edər. Bu, İslamın ailəyə olan hədsiz qayğısıdır.

5. İslam kişiyə yalnız üç talaq ixtiyarı vermişdir. Bu isə qadınlara qarşı hədsiz bir mərhəmət deməkdir. Açıqlaması isə belədir:

İslamın erkən çağlarında və ondan əvvəl cahillik dövründə arvadı boşadıqdan sonra onu qaytarmaq üçün müəyyən hədd yox idi və kişi arvadını boşayır, gözləmə *(iddə)* vaxtı başa çatmamış yenidən arvadı qaytarırdı. Sonra yenidən arvadını boşayır gözləmə *(iddə)* vaxtı başa çatmamış yenidən arvadı qaytarırdı. Bu minvalla da həddi-hüdudu olmayan talaq davam edirdi. Belə olduğu halda qadın da həmin kişidən asılı qalırdı. Nə başqasına ərə gedə bilir nə də əri onu həqiqi mənada arvadlığa qaytarmırdı ki, bir övrət kimi kişidən

istədiyinə nail ola bilsin. Belə olduğu halda qadınlara qarşı çox haqsızlıq edilirdi. Sonra Allah təalə bəyan etdi ki, kişi yalnız üç talaqa malikdir. Birinci və ikinci talaqdan sonra kişi arvadını yenidən qaytara bilər. Üçüncü talaqdan sonra isə: arvadı başqa kişiyə ərə getməmiş - onu bir daha qaytara bilməz. Heç bir halda kişinin bundan çox haqqı yoxdur. Qadını kişilərin bu zülmündən xilas etmək İslam şəriətinin qadına qarşı olan hədsiz mərhəmətidir.

6. İslam şəriəti, aşağıda sadalayacağımız müəyyən səbəblərə: ailənin dağılmaması və s. - görə talaqı qadının deyil, kişinin ixtiyarına vermişdir. Səbəblər isə bunlardır:

a. Qadının təbiəti kişinin təbiətindən fərqlidir. Qadınlar çox vaxt bir iş baş verəndə tez təsirlənir və ona dərhal reaksiya verirlər. Öz qəzəbini saxlaya bilməyən qadın hirsəlib nəticəni fikirləşmədən talaq verə bilərdi. Amma kişi isə öz təbiətinə uyğun olaraq sakit, təmkinli, nəticəni fikirləşərək, lehinə və əleyhinə olanları düşündükdən sonra talaqa qərar verir.

b. Kişi qadına mehr[1] vermiş və toy xərcini çəkmişdir. Əgər o talaq versə bundan sonra da onu maddi xərclər gözləyir. Yarımçıq qalmış mehri tamamlamalı, boşamanın başa çatmasını *(iddə)* gözləyən qadının xərcini ödəməli, əgər uşaqlar ana ilə qalarsa onda yenə də uşaqlarının xərcliklərini boynuna götürməlidir. Bütün bu xərcləri fikirləşən kişi talaqa çox məsuliyyətlə yanaşır və o talaq verməkdə tələsmir, çox dərin fikirləşdikdən sonra talaqın qaçılmaz olduğunu görüb bu işə qədəm qoyur.

c. Kişi çəkdiyi və çəkəcəyi xərclərə görə uduzan, qadın isə aldığı və alacağı xərcliklərə görə udan tərəfdir. Kişi uduzan tərəf olduğu üçün Allah təalə də talaqı kişinin ixtiyarına vermişdir. Qadın isə maddi xəsarət çəkmir, əksinə maddi mənfəət əldə edir. Əgər talaq qadının ixtiyarına verilsəydi onda qadın evlənib boşanmanı alverə çevirərdi. Ərə gedər mehr alar, sonra kişini boşayar və

[1] Mehr: Kişi ilə qadın arasında kəbin kəsilərkən kişinin qadına verdiyi xərclikdir.

götürdüyü mehr də ona qalar beləcə qazanardı. Ona görə də şəriətin hikmətli sahibi talaqı qadının ixtiyarına deyil, məhz kişinin ixtiyarına verib. Kişi də talaqda uduzan tərəf olduğundan əbəs yerə talaq verməz, yalnız qaçılmaz vəziyyətdə buna əl atar.

d. İslam talaq məsələsində qadına laqeydliklə yanaşmamışdır. Qadına öz ərindən ayrılmaq üçün hakimə müraciət etməsini buyurmuşdur. Hakimə isə: talaqın olması üçün lazımi səbəblərin olduğunu gördükdə - qadının tələbini icra etmək vacib edilmişdir.

e. Kişi özünə layiq hesab etdiyi bir qadınla evlənməyə qərar verir. Ola bilsin həmin qadın kişinin istəyinə uyğun olsun. Çünki həqiqi uyğunluq evləndikdən sonra bilinir. Əgər seçimdə səhvə yol verilibsə və bu səhvi başqa yolla düzəltmək mümkün deyilsə belə halda İslam şəriəti talaq etməyə icazə vermişdir.

Heç bir müdrik insan deməz ki, öz seçimində səhv etmiş kişi və ya qadın ömrünün sonuna qədər bu səhvinin acısını çəkməlidir. Ona görə İslam şəriəti bunun üçün ən gözəl həll buyuraraq talaqı qanun etmişdir ki, xoşbəxt həyat qura bilməyən və ağrı-acı içərisində yaşayan kişi və qadın özləri üçün bununla çıxış yolu tapsınlar.

Şübhə yoxdur ki, gözəl məntiq bu halda çıxış yolunu yalnız boşanmada görər. Ingilis filosofu demişdir: "Əgər qanun, yola getməyən ərlə-arvadı birgə yaşamağa məcbur etsə, nifrət onların qəlblərini yeyər, biri digərini aldadar, həyatın ləzzətini başqasında axtarar... Əgər evliliyin əvvəlində *"Aramızda olan məhəbbətin əvəzində nifrət, kin-küdurət və s. nə olursa olsun biz heç vaxt ayrılmayacayıq"* deyib belə bir şərt kəssələr bu fitrətə və müdrikliyə zidd olan pis bir iş olardı. Əgər bu ayrılıq: heç vaxt ayrılmayacaqlarını, daim qoşa yaşayacaqlarını, aralarında məhəbbətdən sonra nifrətin heç vaxt olmayacağını deyən - iki gənc arasında baş verirsə, deməli insanların təbiətinə bələd olan

qanun yazarı heç vaxt evliliyin davamiyyətli olmasını ərlə-arvada icbari qanun etməz. Belə olan halda, ərlə-arvadı aralarında olan və qəlblərini parçalayan nifrətlə qoşa yaşamağa məcbur etmək lazımdır? Yoxsa, onları talaqla ayırmaq və hər kəsə özünə yeni və möhkəm bir ev tikməyə imkan vermək? Məyər özünə yeni bir arvad almaq, aşna qadın tutmaqdan, yaxud nifrət edilən ərdən əlavə başqa kişiylə gizli yaşamaqdan xeyirli deyilmi?!".

Elə buna görə İslam şəriətinin qanunlarına əsasən edilən talaqın bir çox gözəllikləri vardır:

1. Bir-biri ilə yola getməyən ərlə-arvadın sonuncu gözəl çıxış yolu boşanmadır. Həyatda baş verən reallıqlar da görsədir ki, arvadı ilə yola getməyən kişi onu boşayıb yenisi ilə evləndikdə onunla daha gözəl həyat qurur və evliliyin xoş anlarını yaşayır. Həmçinin ərdən boşanmış çox qadınlar da başqa kişiyə ərə getməklə özlərinin istədikləri xoşbəxt ailə həyatı tapırlar. Bu bir reallıq və Allah təalənin bu sözlərinin təsdiqidir:

﴿ وَإِن يَتَفَرَّقَا يُغْنِ ٱللَّهُ كُلاًّ مِّن سَعَتِهِۦ ۚ وَكَانَ ٱللَّهُ وَٰسِعًا حَكِيمًا ﴿١٣٠﴾ ﴾ (النساء:١٣٠)

**"Əgər onlar *(ər-arvad)* bir-birindən ayrılacaq olsalar, Allah onların hər birini Öz geniş lütfü *(kərəmi)* ilə ehtiyacsız edər. Həqiqətən, Allah geniş lütf sahibi, hikmət sahibidir!" (ən-Nisa: 130).**

2. İslam şəriətinin dediyi qaydada edilən talaq ər-arvada bir mərhəmətdir. Çünki arvadına nifrət edən kişi həmin arvadla yaşaya bilməz. Ola bilər elə buna görə də kişi arvada zülm versin, təhqir etsin, onunla cinsi əlaqədən imtina etsin. Hətta öz şəhvətini ödəmək üçün haram işlərə də əl ata bilər. Bütün bunları etmək kişiyə haramdır və o buna görə günah qazanır, Allah təalədən uzaqlaşır. Elə buna görə də kişi həmin qadınla bədbəxt olur. Həmçinin qadın da kişiyə nifrət edirsə o da həmin kişi ilə

yaşaya bilməz. Ona görə kişiyə qarşı haqsızlıq edərək ona lazımi xidmət göstərməz, cinsi yaxınlığa icazə verməz, hətta qadının bu vəziyyəti onu zina etməyə apara bilər. Bütün bunları etmək qadına haramdır və o, buna görə günah qazanır, Allah təalədən uzaqlaşır. Bu problemin ən gözəl həlli talaqdır. Beləliklə onlar özlərinə münasib olan həyatı tapa bilərlər.

3. Şəriət qanunlarına müvafiq talaq vermək problem və nifrətlə dolu birgə həyatdan daha xeyirli və az zərərlidir. Bu övladların elə həyatın şahidi olmasından daha xeyirlidir. Çünki uşaqların ata ilə ana arasında olan problemləri görmələri onlara mənfi təsir göstərəcəkdir. Belə halda onlar ya atanın tərəfini tutub anaya qarşı, yaxud da ananın tərəfini tutub ataya qarşı olacaqlar, yaxud görüb eşitdikləri onların əxlaqlarını korlayacaqdır. Həmçinin bu problemlərə görə atalarının və ya analarının hansısa haram işlə məşğul olduğunun şahidi ola bilərlər. Valideynlərinin çirkin haram işlərinin şahidi olan övlad da bu əxlaqdan təsirlənər *(Allah bizi pis əməllərdən qorusun!)*. Lakin talaq olduqda onlar bir-birlərindən ayrılar və hər kəs öz həyatını sakit davam etdirər. Boşanmadan sonra özünə uyğun arvad tapmış kişinin, yaxud özünə uyğun ər tapmış qadının uşaqları ən azından onlardan xoşagəlməz hərəkətlər görməzlər.

Deyilənlərdən aydın olur ki, İslamda talaq etmək heç də bəyənilmir. Ona görə də İslam şəriəti müsəlmanları talaq etməkdən həzər etmiş və imkan daxilində onları bu qərardan yayınmağa çalışmışdır. Eləcə də insanları evlənməyə sövqləndirmiş və onu sevgi, xoş davranış, qarşılıqlı hörmətlə qorumağı tövsiyə etmişdir. Lakin ailə həyatı pozulduğu və onlar üçün bir əzaba çevrildiyi anda İslam şəriəti ər-arvadı bu halda əzabverən həyatla birgə yaşamağa məcbur etməmişdir. Əksinə onlara ayrılmaq üçün icazə vermiş və talaqı qanun etmişdir. Talaq Allah təalənin Öz bəndələrinə minnət etdiyi nemətdir. Çünki talaq əzabverici həyatdan qurtulmağın ən

gözəl yoludur. Bundan sonra isə Allah təalə hər iki tərəfə xeyirli olanı nəsib edər. Allah təalə buyurur:

﴿ وَإِن يَتَفَرَّقَا يُغْنِ ٱللَّهُ كُلاًّ مِّن سَعَتِهِۦ ۚ وَكَانَ ٱللَّهُ وَٰسِعًا حَكِيمًا ﴿١٣٠﴾ ﴾ (النساء: ١٣٠)

**"Əgər onlar *(ər-arvad)* bir-birindən ayrılacaq olsalar, Allah onların hər birini Öz geniş lütfü *(kərəmi)* ilə ehtiyacsız edər. Həqiqətən, Allah geniş lütf sahibi, hikmət sahibidir! "(ən-Nisa: 130).**

## 4. Dördüncü: Miras;

O, vəsiyyətçinin özündən sonra qoyduğu mirasda, onu paylamadan öncə lazımlı xərcləri ödədikdən sonra, varisə düşən paydır. Allah taala buyurur:

﴿ لِّلرِّجَالِ نَصِيبٌ مِّمَّا تَرَكَ ٱلْوَٰلِدَانِ وَٱلْأَقْرَبُونَ وَلِلنِّسَآءِ نَصِيبٌ مِّمَّا تَرَكَ ٱلْوَٰلِدَانِ وَٱلْأَقْرَبُونَ مِمَّا قَلَّ مِنْهُ أَوْ كَثُرَ ۚ نَصِيبًا مَّفْرُوضًا ﴾ (النساء: ٧)

**"Ata, ana və qohumların (vəfat etdikdə) qoyub getdikləri maldan kişilərə və qadınlara pay düşür. Həmin malın azından da, çoxundan da (bunlara veriləcək) hissə müəyyən edilmişdir." (ən-Nisa: 7).**

﴿ يُوصِيكُمُ ٱللَّهُ فِىٓ أَوْلَـٰدِكُمْ ۖ لِلذَّكَرِ مِثْلُ حَظِّ ٱلْأُنثَيَيْنِ...﴾(النساء:١١)

**"Allah övladlarınız haqqında sizə tövsiyə buyurur ki, oğula iki qız hissəsi qədər pay düşür. ..." (4: 11).**

İbn Abbas ﷺ Peyğəmbərin ﷺ belə buyurduğunu rəvayət edir:

قال رسول الله ﷺ: «اقسموا المال بين أهل الفرائض على كتاب الله، فما تركت الفرائض فلأولى رجل ذكر» . أخرجه البخاري في صحيحه ومسلم.

***"Malı varislər arasında Allah taalanın kitabına uyğun olaraq bölün. Varislərin payı özlərinə yetişdikdən sonra artıq qalan mal (vəsiyyətçiyə daha yaxın olan) birinci kişiyə düşür"[1].***

Ona görə də miras Peyğəmbərin ﷺ zamanından bu günə qədər müsəlmanlar arasında davam edir. Mirasın şəriət qanunu edilməsində günorta vaxtı görünən günəş kimi açıq-aşkar gözəllikləri vardır və bunlar aşağıdakılardan ibarətdir:

1. Hər bir insan, varlı və ya kasıb olmasından asılı olmayaraq, öləcək və özündən sonra mütləq mal-dövlət qoyacaq və bu mülk ondan başqasına keçəcəkdir. Hikmətli şəriət sahibi varisləri və onların paylarını müəyyən etməklə vəsiyyətçinin işini rahatlaşdırmışdır. Çünki vəsiyyətçi bu məsələyə xüsusi diqqət yetirir. O, özündən sonra malının kimə qalacağını və kimin götürəcəyini düşünür. Ümumiyyətlə hər insan malını lazımınca xərcləyə bilmir. Bəzən xərcləmək istəyənlər istəklərinə nail olmurlar. Ola bilsin ki, öz malını bölüşdürmək haqda düşünən zaman ölüm onu qabaqlasın və malını bölmədən həyatdan köçsün. Bir sözlə İslam şəriəti miras qanununu tətbiq etməklə mal sahibinə, fikirdən, kədərdən, pis nəticədən və malı düzgün bölməməkdən xilas edərək ona rahatlıq vermişdir. Bu şəriət, mirasın kəsərli və aydın qanunlarını açıqlamışdır.
2. İslam şəriəti mirasın bölünməsini vəsiyyətçiyə, varislərə və ya hər hansı adama həvalə etməmişdir. Mirasın bölünməsini, bu dini nazil edən, hikmətli şəriət sahibi olan Allah taala Özü, ölənin yaxınlarından hər kəsin payını təyin etmişdir. Çünki insanın varisləri təyin etməsi və onların arasında bu malı istədiyi kimi bölməsi etibarlı olmazdı. Onun hisləri və mülayimliyi ona qalib gələrək kiməsə çox, kiməsə az pay verə bilərdi. Halbuki o, kimin daha haqlı olduğunu, bu malın kimin üçün daha xeyirli olmasını bilmir. Dünya və axirətdə kimə nə fayda verəcəyini dərk etmir. Mirasın təyin

---

[1] Buxari: 11\ 12\ № 6732. Müslim: 3\ 1234\ № 1615.

edilməsi insanlara həvalə edilsəydi kifayət qədər zərər və xəsarət gözə dəyərdi. Bu haqda Allah taala buyurur:

﴿ ءَابَآؤُكُمۡ وَأَبۡنَآؤُكُمۡ لَا تَدۡرُونَ أَيُّهُمۡ أَقۡرَبُ لَكُمۡ نَفۡعٗاۚ فَرِيضَةٗ مِّنَ ٱللَّهِۗ إِنَّ ٱللَّهَ كَانَ عَلِيمًا حَكِيمٗا ﴾ (النساء: ١١)

**"Valideynlərinizdən və övladlarınızdan hansı birinin (xeyir və) mənfəət cəhətdən sizə daha yaxın olduğunu bilmədiyiniz üçün bu (bölgü) Allah tərəfindən müəyyən edilmişdir. Həqiqətən, Allah (hər şeyi) biləndir, hikmət sahibidir!" (4: 11).**

3. İslam hər kəsin mirasda olan payını tam, layiqli şəkildə ödəmişdir. Peyğəmbər ﷺ buyurub:

قال النبي ﷺ: «إن الله أعطى كل ذي حق حقه فلا وصية لوارث». جزء من حديث أبي أمامة الباهلي رضي الله عنه، أخرجه أبو داود في سننه والترمذي في سننه وابن ماجه في سننه، قال الترمذي: حديث حسن صحيح.

***"Allah taala hər kəsin haqqını layiqincə vermişdir. Vəsiyyətçi (əlavə olaraq öz malından) varisə nə isə vəsiyyət edə bilməz"*[1].** Hər kəs, kiçik və ya böyük, kişi və ya qadın, güclü və ya zəif, yaxın və ya uzaqlığından asılı olmayaraq, heç bir maneə olmadan varis olmaq səbəbinə malikdirsə, o, öz payına yetişəcəkdir.

Bununla İslam yunanların, yəhudilərin, cahillik dövründə yaşamış ərəblərin və romalıların qadınlara qarşı etdikləri haqsızlıqlardan onları xilas etmişdir. Həmçinin ərəblərin Cahillik dövründə azyaşlı oğlan uşaqlarına etdikləri zülmdən də onları azad etmişdir. Çünki Cahillik ərəbləri azyaşlı uşaqları, silah daşıya bilməyənləri mirasdan məhrum edərdilər. Lakin İslam şəriəti hər kəsin mirasda olan haqqını tam bölüşdürür. Bu qanunda heç bir

---

[1]Bu hədis Əbu Ümamənin hədisindən bir hissədir. Əbu Davud: 3\ 290-291\ № 2870. Tirmizi: 4\ 376-377\ № 2120. İbn Macə: 2\ 905\ № 2713. Tirmizi hədisin həsənun səhih olduğunu bildirmişdir.

zülm və ya mənimsəmə yoxdur. Bu qanun adillik, hikmət, bərabərlik, rəhmət, ehtiyaclı uşaqları, kişiləri və qadınları nəzərə almaq prinsipləri üzərində dayanmışdır.

4. İslam vəsiyyət edənə miras malını istədiyi kimi paylamasına icazə vermir. Həmçinin vəsiyyət edəni tərk edəcəyi miras malından tam məhrum etməmişdir. Ona öz mirasının üçdə bir hissəsini istədiyi yerə xərcləməyə icazə vermişdir.

عن سعد بن أبي وقاص ﷺ قال: مرضت بمكة فأشفيت منه على الموت، فأتاني النبي ﷺ يعودني، فقلت: يا رسول الله، إن لي مالا كثيرا، وليس يرثني إلا ابنتي، أفأتصدق بثلثي مالي؟ قال: «لا» . قال: قلت: فالشطر؟ قال: «لا» . قلت: الثلث؟ قال: «الثلث كبير، إنك إن تركت ولدك أغنياء خير من أن تتركهم عالة يتكففون الناس، وإنك لن تنفق نفقة إلا أجرت عليها حتى اللقمة ترفعها إلى في امرأتك . . . » الحديث . أخرجه البخاري في صحيحه ومسلم.

Səəd İbn Əbu Vaqqas ﷺ deyir: ***Mən Məkkə şəhərində olarkən xəstələnmişdim. Bu xəstəliyimdən öləcəyimi düşünürdüm. Bir gün Peyğəmbər ﷺ mənə baş çəkmək üçün gəldi. Mən ona dedim: Ey Allahın Elçisi, mənim çoxlu var-dövlətim var. Mənə varis olacaq yalnız bircə qızımdır. Mən öz malımın üçdən iki hissəsini sədəqə verə bilərəmmi? Peyğəmbər ﷺ buyurdu: Xeyr! Dedim ki, bəs yarısını? Yenə də "xeyr" deyərək cavab verdi. Mən dedim: Bəs üçdə birini necə? Peyğəmbər ﷺ buyurdu ki, üçdə bir də çoxdur. Övladını varlı qoyub getməyin, onları kasıb, dilənçi kimi qoyub getməndən daha xeyirlidir. Sən xərclədiyin hər malın savabını qazanırsan. Hətta***

***həyat yoldaşına yedizdirdiyin bir tikənin də savabını qazanırsan..."*[1].

İslam varisləri kasıblıq və möhtac olmaqdan qorumaq məqsədilə mirasın üçdə ikisini onlar üçün qoruyub saxlamışdır. Vəsiyyətçi cavanlığında xeyirxah işlər görmədiyinin peşmançılığını çəkdikdə, tərk edəcəyi mirasın yalnız üçdən birini istədiyi yerlərə, xeyirxah işlərə xərcləyə bilər. Mirasın qalan hissəsi isə varislərin payına düşməlidir.

5. İslamda vərəsəlik intizamı varisləri ehtiyaclarının miqdarına görə bölmüşdür. O, mirasın böyük hissəsini ehtiyacı çox olana verir. Ona görə də övladlar atalara nisbətdə daha çox miras götürürlər. Çünki övladların həyatı hələ qabaqdadır və onların, dünya həyatının əsaslarından sayılan, mal-dövlətə ehtiyacları olacaqdır. Atalar isə artıq öz ömürlərini keçmiş və həyatlarının sonuna yetişmişlər. Onların yalnız qocalıq vaxtlarını yaşamaları üçün xərcliyə ehtiyacları qalmışdır. Onlar aldıqları bu az miqdarla bərabər əvvəlki mallarını toplayıb öz həyatlarını davam etdirə bilərlər.

Elə bu baxımdan da çox vaxt kişilərin miras payları qadınların miras payından bir dəfə çox olur. Oğul öz atasının mirasından bacısına düşən payın iki qatını pay götürür. Çünki oğul bundan sonra ailə qurmalı, kəbində mehr ödəməli, özünün, yoldaşının və uşaqlarının maddi ehtiyaclarını ödəməlidir. Əgər bacıları onun himayəsindədirsə oğul onların himayəsinə və maddı xərclərinə məsuliyyət daşıyır.

Qızın payı oğulun payının yarısına bərabər olmasına baxmayaraq o, heç bir maddi xərc etmir. Həyatı boyu bütün maddi xərclərdən azaddır. Qızdan evlənmək üçün xərc tələb olunmur, evinin, uşaqlarının, ailəsinin hətta özünün maddi xərclərini ödəməsi belə ondan tələb edilmir. Bunlarla bərabər o ərə gedəcək və kəbin

---

[1] Buxari: 12\ 14\ № 6733. Müslim: 3\ 1250\  № 1628.

zamanı ona mehr də veriləcəkdir. Digər xərclər isə ərinin üzərinə düşəcəkdir.

İslamın qadın üçün təyin etdiyi miras payı doğru və insaflı bölgüdür. İslam, qadını miras hüququndan məhrum edənlərlə, mirası qadın və kişi arasında bərabər bölənlərə münasibətdə, orta mövqedədir.

6. İslamda varislik nizamı, ailə üzvləri arasında mehribançılıq əlaqələrini gücləndirir, onları qarşılıqlı həsəddən, nifrətdən və dava-dalaşdan tam mühafizə edir. Çünki hər kəs bilir ki, qoyulmuş miras onların çevrəsindən kənara çıxan deyildir. Hər kəsin haqqı özünə yetişəcək, heç kəs başqasının haqqından bir zərrə qədər də artıq götürməyəcəkdir. Beləliklə, onlar həsəddən, paxıllıqdan, və nifrətdən uzaq olub mehriban ailə olaraq həyatlarını davam etdirəcəklər.

7. Həqiqətən də İslam, ölənin tərk etdiyi mal-dövləti, onun təəssüfünü çəkən, əziz və yaxın adamlarına verməyi qərara almışdır. Bu haqda Allah taala buyurur:

﴿ لِّلرِّجَالِ نَصِيبٌ مِّمَّا تَرَكَ ٱلْوَٰلِدَانِ وَٱلْأَقْرَبُونَ وَلِلنِّسَآءِ نَصِيبٌ مِّمَّا تَرَكَ ٱلْوَٰلِدَانِ وَٱلْأَقْرَبُونَ مِمَّا قَلَّ مِنْهُ أَوْ كَثُرَ ۚ نَصِيبًا مَّفْرُوضًا ﴿٧﴾ ﴾ (النساء: ٧)

"**Ata, ana və qohumların (vəfat etdikdə) qoyub getdikləri maldan kişilərə və qadınlara pay düşür. Həmin malın azından da, çoxundan da (bunlara veriləcək) hissə müəyyən edilmişdir." (4: 7).**

İslam, mirası ölənin ailəsinə, uşaqlarına və qohumlarına aid etmişdir. Bunun öz böyük hikmətləri vardır:

a. Bu adam, sağlığında öz malından mənfəət əldə edir, həmin maldan ailəsi və qohumları üçün xərcləyirdi. Onlar da həmin adamın malından faydalanır, ehtiyaclarını ödəyirdilər. Həmin adam öləndən sonra onun qohumlarını bu mənfəətdən məhrum edərək, malı ölən adamla əlaqəsi olmayan başqa birisinə vermək ədalətli

olmaqdan uzaqdır. Əksinə bu mal ölənin varislərinə verilməlidir. Hədislərin birində Peyğəmbər ﷺ belə buyurmuşdur:

قال النبي ﷺ: «ومن ترك مالا فلورثته» . جزء من حديث أبي هريرة رضي الله عنه، أخرجه مسلم.

***"Kim özündən sonra mal qoyub gedərsə, həmin mal onun varislərinindir[1]".***

b. İnsan, fitrətinə görə öz uşaqlarını və qohumlarını sevir. Həyatı boyu onların səadəti üçün çalışır. Ölmədən öncə ehtiyaclarını ödəmələri üçün onlara mal-dövlət qoyub getməyi arzu edir. Insan ölüm ayağında onun tərk etdiyi mal-dövlətin sevdiyi adamlara yetişəcəyini bildikdə bu dünyadan çox rahat və arxayın gedir. Qohumlarının xoş və firavan yaşayacaqlarını bildikdə onun qəlbi xoş olur.

c. Bir kimsə topladığı mal-dövləti özü xərcləyəcəyini və öldükdən sonra həmin malın sevdiyi adamlara qalacağını bildikdə, öz malını artırmağa və onu qoruyub saxlamağa həris olur. Əks halda, topladığı bu mal-dövlətin o öldükdən sonra dövlətə qalacağını, qohum əqrabasının onun topladığı maldan faydalanmayacağını bildikdə həmin malı qoruyub saxlamaq və artırmaq onun üçün bir maraq doğurmaz. Nəticədə ümumi iqtisadiyyat, dövlət zəifləyir və kasıbçılıq hökm sürər.

Beləliklə aydın olur ki, İslamda qanuniləşdirilmiş vərəsəlik hökmü hər kəsin haqqını özünə çatdırmaq məqsədi güdür. İslam şəriəti, mal sahibi onu lazımsız yerə xərcləməsin deyə, malı tam mənada sahibinin ixtiyarına verməmişdir. Eləcə də onun bu malda olan hüququnu da tam olaraq onun əlindən almamışdır. İnsanların ixtira etdikləri qanunların bəzilərinə əsasən mal tam olaraq dövlətin hesabına keçir, dövlət də həmin malı qohum və ya digərlərini

[1] Hədis Əbu Hureyrənin rəvayət etdiyi uzun hədisdən bir hissədir. Müslim: 3\ 1237\ № 1619.

bərabər tutaraq onu istədiyinə verir. Digər qanunlara əsasən malın sahibinə tam xərcləmək hüququ verilir. İstəsə qohumlarına yardım edər və ya onları bu kömərkdən məhrum edər. Hətta bu qanunlara əsasən o, öz malını it-pişiyə verər və qohumlarına verməz. İslam dini orta mövqeli din və doğru şəriətdir. Bu şəriət bütün insanların tələbatlarını ödəyir, hər kəsin haqqını özünə çatdırır. Həqiqətən, hikmətli və alim Allah bütün naqis və eyibli sifətlərdən pakdır.

## Beşinci: Ata haqları:

İslam ailəyə tam qayğı göstərərək ailəni hər cəhətdən mühafizə etmişdir. İslamın ailəni qoruması həmin ailənin tərkibində olan ata, ana və uşaqları da mühafizə etməsi deməkdir. Ata və ana ailənin əsası olduğuna, bütün məşəqqətləri, uşaqların tərbiyəsini öz üzərlərinə götürdüklərinə görə İslam onların böyük və əzəmətli məqamlarını açıqlamışdır. Övladlar üzərində ata və ananın hüquqlarını təyin etmişdir. Övladlardan onlara yaxşılıq, mülayim davranış, himayə, sevgi, rəhmət, gözəl ədəb, əxlaq tələb etmişdir. Bütün bu hüquqları bir neçə üslub və vasitələrlə təsdiq etmişdir.

Allah taala, ata-anaya edilən yaxşılığı Ona edilən ibadət və Ona heç bir məxluqu ortaq qoşmamaq müddəası ilə birgə buyurmuşdur. Allah taala buyurur:

﴿ وَإِذْ أَخَذْنَا مِيثَٰقَ بَنِىٓ إِسْرَٰٓءِيلَ لَا تَعْبُدُونَ إِلَّا ٱللَّهَ وَبِٱلْوَٰلِدَيْنِ إِحْسَانًا ﴾ (البقرة:٨٣)

**"Yadınıza gətirin ki, Biz bir zaman İsrail oğullarından: “Allahdan qeyrisinə ibadət etməyin, valideynlərinizə ehsan (yaxşılıq, kömək) edin..." (2: 83).**

﴿ وَٱعْبُدُواْ ٱللَّهَ وَلَا تُشْرِكُواْ بِهِۦ شَيْـًٔا ۖ وَبِٱلْوَٰلِدَيْنِ إِحْسَٰنًا ﴾ (النساء:٣٦)

**"Allaha ibadət edin və Ona heç bir şeyi şərik qoşmayın! Ata-anaya yaxşılıq edin!..." (4: 36).**

﴿ قُلْ تَعَالَوْاْ أَتْلُ مَا حَرَّمَ رَبُّكُمْ عَلَيْكُمْ ۖ أَلَّا تُشْرِكُواْ بِهِۦ شَيْـًٔا ۖ وَبِٱلْوَٰلِدَيْنِ إِحْسَٰنًا ﴾ (الأنعام:١٥١)

**"(Ya Rəsulum!) De: "Gəlin Rəbbinizin sizə nələri haram etdiyini deyim: Ona heç bir şərik qoşmayın; ata-anaya yaxşılıq edin;..." (6: 151).**

﴿ أَنِ ٱشْكُرْ لِى وَلِوَٰلِدَيْكَ ﴾ (لقمان: ١٤)

**"(Biz insana buyurduq:) "Mənə və ata-anana şükür et..." (31: 14).**

Müsəlmana, öz valideynlərinə, hətta müşrik olduqları halda da, yaxşılıq etməyi əmr etmişdir. Yalnız bir halda, Allah taalaya asilik etməyi əmr etdikdə, onlara itaət etməməyə icazə vermişdir. Allah taala buyurur:

﴿ وَوَصَّيْنَا ٱلْإِنسَٰنَ بِوَٰلِدَيْهِ حُسْنًا ۖ وَإِن جَٰهَدَاكَ لِتُشْرِكَ بِى مَا لَيْسَ لَكَ بِهِۦ عِلْمٌ فَلَا تُطِعْهُمَآ ۚ إِلَىَّ مَرْجِعُكُمْ فَأُنَبِّئُكُم بِمَا كُنتُمْ تَعْمَلُونَ ﴾ (العنكبوت:٨)

**"Biz insana ata-anasına yaxşılıq etməyi (onlarla gözəl davranmağı) tövsiyə etdik. (Ey insan!) Əgər (valideynlərin) bilmədiyin bir şeyi Mənə şərik qoşmağına cəhd göstərsələr, onlara itaət etmə. Hamınız (qiyamət günü) Mənim hüzuruma qayıdacaqsınız. Mən də (dünyada) nə etdiklərinizi sizə bir-bir xəbər verəcəyəm!" (29: 8).**

﴿ وَوَصَّيْنَا ٱلْإِنسَٰنَ بِوَٰلِدَيْهِ حَمَلَتْهُ أُمُّهُۥ وَهْنًا عَلَىٰ وَهْنٍ وَفِصَٰلُهُۥ فِى عَامَيْنِ أَنِ ٱشْكُرْ لِى وَلِوَٰلِدَيْكَ إِلَىَّ ٱلْمَصِيرُ ﴿١٤﴾ وَإِن جَٰهَدَاكَ عَلَىٰٓ أَن تُشْرِكَ بِى مَا لَيْسَ لَكَ بِهِۦ عِلْمٌ فَلَا تُطِعْهُمَا ۖ وَصَاحِبْهُمَا فِى ٱلدُّنْيَا مَعْرُوفًا ۖ وَٱتَّبِعْ سَبِيلَ مَنْ أَنَابَ إِلَىَّ ۚ ﴾ (لقمان: ١٤-١٥)

**"Biz insana ata-anasına (yaxşılıq etməyi, valideyninə yaxşı baxmağı, onlarla gözəl davranmağı) tövsiyə etdik. Anası onu (bətnində) çox zəif bir halda daşımışdı. (Uşağın süddən) kəsilməsi isə iki il ərzində olur. (Biz insana buyurduq: ) "Mənə və ata-anana şükür et. Axır dönüş Mənədir! Əgər (ata-anan) bilmədiyin bir şeyi Mənə şərik qoşmağına cəhd göstərsələr, (bu işdə) onlara itaət etmə. (Qalan) dünya işlərində onlarla gözəl keçin (onlara itaət et). Tövbə edib Mənə tərəf dönənlərin (İslamı qəbul edənlərin) yolunu tut. Sonra (qiyamət günü) Mənim hüzuruma qayıdacaqsınız. Mən də (dünyada) nə etdiklərinizi (bir-bir) sizə xəbər verəcəyəm!" (31: 14-15).**

Həmçinin qocaldıqda da onlara yaxşılıq etməyi övladlara əmr etmişdir. Bu haqda Allah taala buyurur:

﴿ وَقَضَىٰ رَبُّكَ أَلَّا تَعْبُدُوٓاْ إِلَّآ إِيَّاهُ وَبِٱلْوَٰلِدَيْنِ إِحْسَٰنًا ۚ إِمَّا يَبْلُغَنَّ عِندَكَ ٱلْكِبَرَ أَحَدُهُمَآ أَوْ كِلَاهُمَا فَلَا تَقُل لَّهُمَآ أُفٍّ وَلَا تَنْهَرْهُمَا وَقُل لَّهُمَا قَوْلًا كَرِيمًا ٢٣ وَٱخْفِضْ لَهُمَا جَنَاحَ ٱلذُّلِّ مِنَ ٱلرَّحْمَةِ وَقُل رَّبِّ ٱرْحَمْهُمَا كَمَا رَبَّيَانِى صَغِيرًا ﴾

(الإسراء: ٢٣-٢٤)

**"Rəbbin yalnız Ona ibadət etməyi və valideynlərə yaxşılıq etməyi (onlara yaxşı baxıb gözəl davranmağı) buyurmuşdur. Əgər onların biri və ya hər ikisi sənin yanında (yaşayıb) qocalığın ən düşkün çağına yetərsə, onlara: "Uf!" belə demə, üstlərinə qışqırıb acı söz söyləmə. Onlarla xoş danış! Onların hər ikisinə acıyaraq mərhəmət qanadının altına salıb: "Ey Rəbbim! Onlar məni körpəliyimdən (nəvazişlə) tərbiyə edib bəslədikləri kimi, Sən də onlara rəhm et!" – de." (17: 23-24).**

Peyğəmbər ﷺ də valideynlərin üzünə ağ olmağı qadağan etmişdir. Belə əməli, Allaha şərik qoşmaqdan sonra, ən böyük günahlardan hesab etmişdir. Əbu Bəkrə ؓ Peyğəmbərin ﷺ onlara belə buyurduğunu deyir:

قال رسول الله ﷺ: «ألا أنبئكم بأكبر الكبائر؟» قلنا: بلى يا رسول الله. قال: «الإشراك بالله، وعقوق الوالدين -وكان متكئا فجلس فقال- ألا وقول الزور، وشهادة الزور، ألا وقول الزور، وشهادة الزور»، فما زال يقولها، حتى قلت: لا يسكت. أخرجه البخاري في صحيحه ومسلم.

***"Sizə ən böyük günahları çatdırımmı?" Biz dedik: Bəli, ey Allahın Elçisi. O buyurdu: "Allaha şərik qoşmaq, valideynlərin üzünə ağ olmaq, -*** bu zaman Peyğəmbər ﷺ dirsəklənmişdi. O, oturub buyurdu: ***yalan danışmaq, yalandan şahidlik etmək, yalan danışmaq, yalandan şahidlik etmək." Peyğəmbər ﷺ bu sözləri təkrarlayırdı və mən öz-özlüyümdə dedim ki, o susan deyil[1].***

Muğirə ibn Şöbə ﷺ Peyğəmbərdən ﷺ rəvayət edərək deyir:

قال: «إن الله حرم عليكم عقوق الأمهات، ومنعا وهات، ووأد البنات، وكره لكم: قيل وقال، وكثرة السؤال، وإضاعة المال». أخرجه البخاري في صحيحه ومسلم.

***"Allah taala sizə valideynlərinizin üzünə ağ olmağı, kiminsə haqqını verməməyi, kimdənsə lazım olmayanı istəməyi və qız uşaqlarını diri-diri basdırmağı haram etmişdir. Həmçinin sizin üçün, dedi-qodu etməyi, çoxlu sual verməyi və malı tələf etməyi məkruh etmişdir (bəyənməmişdir)"[2].***

Peyğəmbər ﷺ buyurmuşdur ki, yaxşı yoldaşlıq üçün daha haqlı olan ilk növbədə ana, sonra isə atadır. Əbu Hureyrə ﷺ deyir ki, bir kişi Peyğəmbərin ﷺ yanına gəlib dedi:

---

[1] Buxari: 10\ 405\ № 5976. Müslim: 1\ 91\ № 87.

[2] Buxari: 10\ 405\ № 5975. Müslim: 3\ 1341\ № 593.

جاء رجل إلى رسول الله ﷺ فقال: يا رسول الله من أحق الناس بحسن صحابتي؟ قال: «أمك» . قال: ثم من؟ قال: «ثم أمك» . قال: ثم من؟ قال: «ثم أمك» . قال: ثم من؟ قال: «ثم أبوك» . أخرجه البخاري في صحيحه ومسلم.

***"Ey Allahın Elçisi! Yaxşı yoldaşlıq etməm üçün, kim daha haqlıdır? Peyğəmbər ﷺ buyurdu: "Anan" həmin adam dedi: Bəs sonra? Peyğəmbər ﷺ buyurdu: "Anan" o, yenə də dedi: Bəs sonra? Peyğəmbər ﷺ yenə də: "Anan" deyərək cavab verdi. Həmin adam dedi: Bəs sonra? Peyğəmbər ﷺ buyurdu: "Sonra atan"[1].***

İslam şəriəti valideynlərə qulluq göstərməyi vacib *(fərdul ayn)* olmayan cihaddan üstün etmişdir. Abdullah Ibn Amr Ibn əl-As ﵄ deyir: bir kişi Peyğəmbərin ﷺ yanına gəlib dedi:

أقبل رجل إلى نبي الله ﷺ فقال: أبايعك على الهجرة والجهاد، أبتغي الأجر من الله. قال: «فهل من والديك أحد حي؟» قال: نعم. بل كلاهما . قال: «فتبتغي الأجر من الله؟» قال: نعم . قال: «فارجع إلى والديك فأحسن صحبتهما» أخرجه مسلم.

***"Mən səninlə birgə hicrət və cihad etmək üçün əlimi uzadıb razılıq verirəm. Bununla Allah taaladan savabımı diləyirəm. Peyğəmbər ﷺ buyurdu: sənin valideynlərindən sağ olanı varmı? O dedi: Bəli, hər ikisi sağdır. Peyğəmbər ﷺ buyurdu: Sən Allah taaladan savab istəyirsən? Həmin adam dedi: Bəli. Peyğəmbər ﷺ***

[1] Buxari: 10\ 401\ № 5971. Müslim: 4\ 1974\ № 2548.

***buyurdu: valideynlərinin yanına qayıt və onlarla xoş rəftar edərək onlara xidmət et!"[1].***

Peyğəmbər ﷺ bir nəfərin digərinin atasını, başqası da onun atasını söyməyi qadağan etmişdir. Abdullah İbn Amr ﵄ Peyğəmbərdən ﷺ rəvayət edərək deyir:

قال رسول الله ﷺ : «إن من أكبر الكبائر أن يلعن الرجل والديه» . قيل: يا رسول الله، وكيف يلعن الرجل والديه ؟ قال: «يسب الرجل أبا الرجل فيسب أباه ويسب أمه فيسب أمه» .

أخرجه البخاري في صحيحه ومسلم.

***"Günahların ən böyüyü bir adamın öz valideynlərini lənətləməsidir".*** Orada əyləşənlər dedilər: ***"Ey Allahın Elçisi, bir nəfər öz valideynlərini necə lənətləyə bilər? Peyğəmbər ﷺ buyurdu: "Biri digərinin atasını söyür. Söyülən adam da cavab olaraq onun atasını söyür. Biri digərinin anasını söyür. Söyülən adam da cavab olaraq onun anasını söyür"[2].***

Ona görə də demək olar ki, valideynlərə hörmət etməyin əmr olunması aşağıdakı əsaslara görə İslamın gözəlliklərindəndir.

1. Valideynlərin övladları üzərində, Allah taalanın haqqından sonra, birbaşa haqları vardır. Övladlar onlara xidmət etməli, qulluğunda durmalıdırlar. Çünki bu, onların boyunlarına düşən borcdur. Ana övladını bətnində daşımış, ona süd vermiş, nəvazişlə böyütmüşdür. Ata isə övladına qarşı mülayim, qayğıkeş olub onun üçün malını əsirgəməmişdir. Onun üçün bütün xeyirxahlıqları etmişdir. Ona görə də övladın valideynlərə xidmət etməsi, onların borclarının bir hissəsini ödəməsidir.

2. Valideynlərə yaxşılıq etmək onların xoş əməllərinə edilən təşəkkürün təzahürüdür. Əgər Allah taalanın, sonra isə

---

[1] Müslim: 4\ 1975\ № 2549.
[2] Buxari: 10\ 403\ № 5973. Müslim: 1\ 92\ № 90.

validedeynlərin nəzarəti və köməyi olmasaydı onda həmin övlad çatdığı məqama yetişə bilməzdi. Valideynlər lazımlı vaxtlarda onun keşiyində dayanmış, ehtiyaclarını ödəmişlər. Valideynlər onun üçün heç nə əsirgəməmişlər. Ona görə də nemət verənin nemətinə, yaxşılıq edənin yaxşılığına görə təşəkkür etmək, gözəl əxlaq nümunəsidir. İslam hər kəsin haqlarını qorumağa, gözəl əxlaqa nail olmağa səsləyir. İslam dini valideynlərin çəkdikləri əziyyətlərin və çətinliklərin əvəzində, övlada onlara xidmət etməyi əmr etməklə, öz gözəlliyini nümayiş etdirir. Bu, valideynlərə verilən ən gözəl qiymətdir!

3. İslamın gözəlliklərindən biri də, yaşa dolmuş qoca valideynlərə xidmət etməyi və onların keşiyində durmağı əmr etməsidir. Artıq valideynlərin vəziyyətləri dəyişmiş, onların nəvazişli xidmətlərə ehtiyacları vardır. Bu yaşda onlara övlad qayğısı gərəkdir. Ona görə də övladın onlara bu yaşda xidmət etməsi onun boynuna düşən borcdur. Bu borcdan yalnız, gözəllikləri inkar edən, nəfsi xəstə və təbiəti pis olan insan imtina edər.

4. İslamın daha bir gözəlliyi, valideynlərə edilən yaxşılıq və itaət üçün sərhəd qoymamağıdır. Yalnız bir halda, Allah taalanın əmr etdiyinə zidd olan bir əməli yerinə yetirməyi əmr etdikdə, valideynlərə itaətsizlik etməyə icazə vermişdir. Bu Allah taalanın lütf və mərhəmət sahibi olduğunun açıq-aşkar dəlilidir. Çünki O, valideynlərin əziyyətlərini dəyərləndirmiş və çəkdikləri əzab-əziyyətin əvəzini onlara bəxş etmişdir. Yəni, övladlara valideynlərinə xidmət etmələrini, inilti və ya hərəkətlə də olsa onlara pislik etməməyi əmr etmişdir. Bu haqda Allah taala buyurur:

﴿ فَلَا تَقُل لَّهُمَآ أُفٍّ وَلَا تَنْهَرْهُمَا وَقُل لَّهُمَا قَوْلًا كَرِيمًا ﴾(الإسراء:٢٣)

**"...Onlara: “Uf!” belə demə, üstlərinə qışqırıb acı söz söyləmə. Onlarla xoş danış!" (17: 23).**

5. İslam şəriətinin daha bir gözəlliyi, valideynlərə olan yaxşılığı yalnız sağlıqlarında deyil, hətta öldükdən sonra da onlar üçün yaxşılıq yeri qoymasıdır. Bir kişi Peyğəmbərin ﷺ yanına gələrək dedi:

فقد جاء رجل إلى النبي ﷺ فقال: يا رسول الله هل يبقى عليّ من بر والدي شيء أبرهما به بعد موتهما ؟ قال: «نعم: الدعاء لهما وإنفاذ عهدهما، وصلة الرحم التي لا توصل إلا بهما»

رواه أبو داود في سننه.

***Ey Allahın Elçisi! Mənim boynumda valideynlərim üçün, onlar vəfat etdikdən sonra edəcəyim yaxşılıq qalmışdırmı? Peyğəmbər ﷺ buyurdu: "Bəli, onlar üçün dua etmək, dediklərini həyata keçirmək və onların saxladıqları qohumluq əlaqələrini davam etdirmək"[1].***

Digər hədisdə Peyğəmbər ﷺ buyurur:

وقال عليه الصلاة والسلام: «إن من أبر البر صلة الرجل أهل ود أبيه بعد أن يولي» رواه مسلم.

***"Ən gözəl yaxşılıq, övladın atası öldükdən sonra, onun sevdiyi dost-tanışlarla əlaqə saxlamasıdır"[2].***

Çünki övladın bu səviyyəyə gəlməsində, əməlisaleh bəndələrdən olmasında valideynlərin hədsiz əməyi vardır. Ona görə də övladın etdiklərindən onlara da savab gedir. Çünki, insanın haqq yolda olmasına səbəb, Allah taaladan sonra, birbaşa valideynlərdir. Bu haqda Peyğəmbər ﷺ buyurmuşdur:

---

[1] Əbu Davud: 5\ 352\ № 5142.
[2] Müslim: 4\ 1979\ № 2552.

قال عليه الصلاة والسلام: «كل مولود يولد على الفطرة فأبواه يهودانه أو ينصرانه أو يمجسانه» رواه البخاري في صحيحه ومسلم.

*"Hər insan (İslam) fitrəti üzərində doğulur. Sonradan valideynləri onu yəhudi, xaçpərəst və ya atəşpərəst edirlər"[1].*

Valideynlər müsəlman olub, övladlarını müsəlman kimi böyütdüklərinə görə uşaq öz fitrətində qalmışdır. Buna görə də valideynlərin uşağı belə böyütməkdə Allah taaladan sonra çox böyük dəyərləri vardır. Bu səbəbdən də övladların öz valideynləri üçün onlar öldükdən sonra dua etmək, dediklərini həyata keçirmək, onların qohumluq əlaqələrini qoruyub saxlamaq, sevdikləri dost-tanışlarla daima ünsiyyətdə olmaq bir borcdur. Buradan görünür ki, İslam şəriəti övladların öz valideynlərinə yaxşılıq etmələrini əmr etməklə, valideynlərə verdiyi qiyməti dəyərləndirmişdir.

6. İslam şəriəti, övladların valideynlərə yaxşılıq etmələrini əmr etməklə, valideynlər tərəfdən övladlara olan qayğının, gözəl tərbiyənin, məqsədyönlü göstərişlərin daha da artmasına səbəb olmuşdur. Həyatda görünən həqiqətlər də bunu təsdiqləyir. Çünki, valideynlərinə xidmət edənlər, adətən ata-anadan gözəl tərbiyə almış insanlardır. Valideynlərin övladlarına öyrətdikləri bu gözəl xüsusiyyətlər və verdikləri tərbiyə onların qarşısına çıxır. Övlad həmin ədəb-ərkanla öz valideynlərinə qulluq edir. Hansı valideyn öz övladının ona xidmət etməsini arzulayırsa, onda kiçik yaşlarından öz övladlarına gözəl tərbiyə versin.

Bu qısa da olsa İslamın, valideynlərin hüquqlarını təyin etməklə bağlı görünən gözəllikləridir. İslam dini belə əməllər üçün axirətdə Allah taala tərəfindən böyük bir mükafat vəd edir. Peyğəmbər ﷺ buyurur:

[1] Buxari: 3\ 219\ № 1358. Müslim: 4\ 2047\ № 2658.

قال عليه الصلاة والسلام: «سخط الله في سخط الوالد ورضا الله في رضا الوالد» رواه الترمذي في سننه وانظر: صحيح الجامع للألباني.

*"Allahın qəzəbi valideynin qəzəbindədir. Allahın razılığı valideynin razılığındadır"*[1].

Digər bir hədisdə isə buyurmuşdur:

وقال: «رغم أنف امرئ أدرك أبويه أو أحدهما عند الكبر ولم يدخلاه الجنة» رواه مسلم.

*"Valideynlərinin hər ikisini, yaxud birini qoca vaxtlarında sağ görüb, bununla cənnətə daxil olmayanın burnu yer ilə sürünər"*[2].

Bütün bunlara nail olmaq arzu və istəkləri övladları həmin əmələ sövq etdirir və onları şücaətləndirir.

## Altıncı: Övlad haqları;

Allah taala övladlara bir çox valideyn haqlarını tanımağı vacib etdiyi kimi, valideynlərə də övlad haqlarını vacib etmişdir. Bu övlad haqlarının bəziləri dünyaya gəlməmişdən əvvəl, digərləri isə doğulduqdan sonra yaranır. İndi isə bu hüquqlardan bəzilərini sadalayaq və bu hüquqlara məxsus olan İslamın gözəlliklərini qeyd edək.

**Birinci: Övladların dünyaya gəlməmişdən öncə olan haqları:**

1. Evlənərkən və ya qız ərə verərkən onun saleh bəndə olmasına, eləcə də dini və əxlaqi xüsusiyyətlərinə daha üstünlük vermək. Peyğəmbər ﷺ buyurmuşdur:

---

[1] Tirmizi: 4\ 274\ № 1899. Albaninin Sahihul Cami kitabı: № 3507.

[2] Müslim: 4\ 1978\ № 2551.

قال النبي ﷺ: «فاظفر بذات الدين تربت يداك» . جزء من حديث أبي هريرة ﷺ، أخرجه البخاري في صحيحه ومسلم.

***"Dini gözəllik xüsusiyyətinə görə seç, xeyrə çatarsan!"[1].***
Həmçinin başqa bir hədisdə buyurur:

وقال أيضا: «إذا جاءكم من ترضون دينه وخلقه فأنكحوه إلا تفعلوا تكن فتنة في الأرض وفساد» . جزء من حديث أبي حاتم المزني، أخرجه الترمذي في سننه وحسنه الترمذي وله طرق وشواهد .

***"Sizin yanınıza dinindən və əxlaqından razı qaldığınız adamlar (evlənmək məqsədi ilə) gəlsələr, onları evləndirin. Əgər belə etməsəniz yer üzündə fitnə-fəsad olar"[2].***

Çünki evlənməkdən məqsəd sadəcə olaraq ehtiras hisslərini ödəmək deyildir. Əslində evlənmək gözəl yaşayış, yaxşılıq və mütilik üzərində olan bir həyatdır. Ər öz arvadına xeyir işləri və Allah taalaya müti olmağı əmr edir, arvad da kişiyə nəsihət edir və bunları həyata keçirmək üçün ərinə kömək olur. Həmçinin ər-arvad uşaq üçün saleh tərbiyə mənbəyi olmalıdır. Valideynlərin əməlisaleh olmaları uşağın gözəl tərbiyə alması üçün çox əhəmiyyətlidir. Bütün bu gözəl xüsusiyyətlərə nail olmaq yalnız əməlisaleh qadınla evlənmək və əməlisaleh kişiyə qız verməklə mümkündür.

2. Cinsi əlaqədən öncə kişinin bu duanı deməsi sünnədir. İbn Abbas ﷺ Peyğəmbərdən ﷺ rəvayət edərək deyir:

[1] Əbu Hureyrənin hədisindən bir parçadır. Buxari: 9\ 132\ № 5090. Müslim: 2\ 1086\ № 1466.

[2] Əbu Hatim əl-Muzəninin hədisindən bir parçadır. Tirmizi: 3\ 395\ № 1085. Tirmizi bu hədisə həsən demişdir. Hədisin bir çox yolları və şahidləri vardır.

عن النبي ﷺ قال: «لو أن أحدكم إذا أراد أن يأتي أهله فقال: باسم الله، اللهم جنبنا الشيطان وجنب الشيطان ما رزقتنا، فإنه إن يقدر بينهما ولد في ذلك، لم يضره شيطان أبداً» . أخرجه البخاري في صحيحه ومسلم.

***"Sizlərdən biriniz ailəsi ilə yaxınlıq etmək istədikdə: "Bismilləh, Allahummə cənnibnəş şeytanə və cənnibiş şeytanə mə razəqtənə" bu duanı dedikdən sonra həmin əlaqədən uşaq qalarsa həmin uşağa şeytanın heç bir zərəri dəyməz"[1].*** Çünki, kişi öz qadını ilə yaxınlıq etdiyi zaman şeytan dünyaya gələcək uşaqda öz payını istər. O, Allah taalaya and içərək demişdir:

﴿ وَقَالَ لَأَتَّخِذَنَّ مِنْ عِبَادِكَ نَصِيبًا مَّفْرُوضًا ۝١١٨ ﴾ (النساء: ١١٨)

**"O isə dedi: "Əlbəttə, mən Sənin bəndələrindən müəyyən bir qismini ələ alacağam"." (ən-Nisa: 118).** Bu vaxt Allah taalaya sığınmaq şeytanı uzaqlaşdırır. Onu uşağın ilk yaradılışına təsir etməkdən kor-peşman döndərir. Bu da Allah taalanın izni ilə uşağın şeytandan qorunmasıdır.

**İkinci: Övlad doğulduqdan sonra onun haqları.**

1. Doğulmuş uşağın qulağına azan oxumaq.

عن أبي رافع رضي الله عنه قال: «رأيت رسول الله ﷺ أذن في أذن الحسن بن علي حين ولدته فاطمة بالصلاة» أخرجه أبو داود في سننه والترمذي في سننه وقال الترمذي: هذا حديث صحيح والعمل عليه.

---

[1] Buxari: 13\ 379\ № 7396. Müslim: 2\ 1058\ № 1434.

Əbu Rafi ﵁ deyir ki, ***mən Peyğəmbəri ﷺ Hüseyn İbn Əli doğularkən onun qulağına azan verdiyini gördüm"[1].***

Bu, körpənin ilk olaraq Allah kəlməsini və onun əzəmətli Rəbb olduğunu eşitməsi, şəhadət kəlməsini duyması, şeytanın azan sözlərini eşitdikdə qaçması, Allah taalanın dəvətinin şeytanın çağırışından əvvəl olması və s. üçündür.

2. Doğulmuş uşağın əvəzinə əqiq etmək *(yəni, Allaha şükr əlaməti olaraq qoç kəsmək)*, başını qırxmaq və adını qoymaq. Salman ibn Amir əl-Dabbi ﵁ Peyğəmbərin ﷺ belə buyurduğunu deyir:

قال رسول الله ﷺ: «مع الغلام عقيقة، فأهريقوا عنه دما، وأميطوا عنه الأذى». أخرجه البخاري في صحيحه.

***"Doğulmuş körpə ilə əqiq (qurban) vardır, onun əvəzinə qan axıdın və üzərindəki natəmizliyi (saçını) təmizləyin"[2].***

Səmurə ﵁ Peyğəmbərin ﷺ belə buyurduğunu deyir:

وعن سمرة ﵁ قال: «كل غلام رهين بعقيقته، تذبح عنه يوم سابعه ويحلق رأسه ويسمى». أخرجه أبو داود في سننه والترمذي في سننه والنسائي في سننه وابن ماجه، قال الترمذي: هذا حديث حسن صحيح والعمل على هذا.

***"Hər bir doğulmuş uşağın əqiqi (qurbanı) onunladır. Yeddinci günü onun adından heyvan kəsilir, başı qırxılır və adı qoyulur"[3].***

Aişə ﵂ Peyğəmbərdən ﷺ rəvayət edərək deyir:

---

[1] Əbu Davud: 5\ 333\ № 5105. Tirmizi: 4\ 82\ № 1514. Tirmizi demişdir ki, bu hədis səhihdir və bu hədisə riayət edilir. Lakin bu məsələ alimlərin arasında ixtilaflı məsələdir.

[2] Buxari: 9\ 590\ № 5472.

[3] Əbu Davud: 3\ 260\ № 2838. Tirmizi: 4\ 85\ № 1522. Nəsai: 7\ 186-187\ № 4231. Ibn Macə: 2\ 1056-1057\ № 3165. Tirmizi, bu hədis həsən hədisdir və buna da riayət edilir, demişdir.

قال رسول الله ﷺ: «عن الغلام شاتان مكافئتان، وعن الجارية شاة». أخرجه الإمام أحمد في المسند والترمذي في سننه وغيرهما، وقال الترمذي: حديث حسن صحيح.

***"Doğulmuş oğlan uşağının əvəzinə birgə iki, qız uşağının əvəzinə isə bir qoç (yaxud qoyun) kəsilir"[1].***

Bu heyvanların kəsilməsi Allah taalaya, onlara uşaq bəxş etdiyindən şükür əlaməti olaraq kəsilir. Hamıya məlumdur ki, əksər hallarda valideynlər tərəfindən oğlan uşağı daha çox sevilir. Ona görə də oğlan uşağının doğulması daha böyük nemət sayılır. Onun üçün Allah taala oğlan uşağının əvəzinə iki, qız uşağının əvəzinə isə bir qoç kəsməyi əmr etmişdir. Bunların hər ikisi Allah taalanın neməti olduğu üçün onların əvəzinə qoç kəsib ətinin paylanmasını əmr etmişdir ki, qoy bununla çox insanlar sevinsin və hamı bu uşaq üçün xeyirli dua etsin. Doğulmuş uşağın gözəl qarşılanması, onun qədrini bilmək, onu doğru yola yönəltmək və gözəl tərbiyə etmək üçün müsəlman valideynlərə bir xatirədir.

3. Uşaqlara gözəl adlar vermək: Peyğəmbər ﷺ uşaqlara gözəl adlar verməyi tövsiyə edərdi. Abdullah Ibn Ömər ؓ deyir ki, Peyğəmbər ﷺ buyurmuşdur:

قال رسول الله ﷺ: «إن أحب أسمائكم إلى الله عبد الله وعبد الرحمن» أخرجه مسلم.

***"Sizin Allah taalaya ən sevimli adlarınız, Abdullah və AbdurRəhmandır"[2].***

Gözəl ad seçmək, uşaqların haqlarından sayılır. Çünki, uşaq adı ilə tanınır və onunla da çağırılır. Ad, uşağın üzərində bir əlamətdir. O, xoşladığı və qəlbi rahat olduğu adı eşitdikdə rahatlanar və nəfsi dayaq tapar. Həmçinin burada olacaq haqda xəbər verən

---

[1] Əhməd: 6\ 158, 251. Tirmizi: 4\ 81\ № 1513. Tirmizi, hədisin həsənun səhih olduğunu demişdir.

[2] Müslim: 3\ 1682\ № 2132.

gözəl əlamət vardır və Peyğəmbər ﷺ gözəl əlamətləri xoşlayardı. Əgər uşağın adı pis olarsa o yalnız pis söz eşidəcək və bununla çağırılacaqdır. Bu da onun təbiətini korlamaq üçün bir səbəb ola bilər. Bu ad onun canını sıxar və ciddi problemlərə səbəb ola bilər. İslam şəriətinin, uşaqlara gözəl ad qoymağı əmr etməsi, bu şəriətin gözəlliyindən bir guşədir. Peyğəmbər ﷺ buyurmuşdur:

«فإن الله لا يحب الفحش ولا التفحّش» كما قال عليه الصلاة والسلام .

***"Çünki, Allah taala pis işləri və pislikləri sevməz".***

4. Sünnət etmək. Uşaqları sünnət etmək fitrətdən və Peyğəmbərin ﷺ sünnəsindəndir (qoyduğu qaydalardandır). Əbu Hureyrə رضي الله عنه Peyğəmbərin ﷺ belə buyurduğunu rəvayət edir:

قال رسول الله ﷺ: «الفطرة خمس: الختان، والاستحداد، وقص الشارب، وتقليم الأظفار، ونتف الإبط». أخرجه البخاري في صحيحه ومسلم.

***"Fitrət (işləri) beşdir: Sünnət, övrət yerlərini qırxmaq, bığları qısaltmaq, dırnaqları tutmaq və qoltuqaltı tükləri yolmaq"[1].***

Eləcə də, sünnət təmizlik və yaradılışın gözəlləşdirilməsi deməkdir. Sünnət olunmayanlar natəmizlikdən və digər səhhətə aid problemlərdən şikayətlənirlər. Bu da açıq dəlildir ki, sünnət etmək fitrətdəndir. İslam şəriəti də bu fitrəti dəstəkləyərək sünnət etməyi müstəhəb etmişdir.

**5.** Onlarla nəvaziş və rəhmətlə davranmaq. Peyğəmbər ﷺ bu xüsusiyyətə görə Qureyş qəbiləsindən olan saleh qadınları tərifləmişdir. Əbu Hureyrə رضي الله عنه Peyğəmbərin ﷺ belə buyurduğunu deyir:

[1] Buxari: 10\ 349\ № 5891. Müslim: 1\ 221\ № 257.

عن النبي ﷺ قال: «خير نساء ركبن الإبل صالح نساء قريش، أحناه على ولد في صغره، وأرعاه على زوج في ذات يده» . أخرجه البخاري في صحيحه ومسلم.

***"Dəvə üzərində oturmuş ən xeyirli qadınlar Qüreyşli qadınlardır. Bu qadınlar körpə uşağa nəvazişlə baxar, öz ərinə gözəl xidmət göstərərlər"[1].***

Uşaqlara qarşı rəhmli və şəfqətli davranmaq lazımdır. Əslində həyatı, rəhmət və mərhəmətsiz təsəvvür etmək mümkün deyildir.

6. Onlar özlərini dolandırmaq iqtidarında olana qədər, onların xərcliklərini və gündəlik təlabatlarını ödəmək atanın boynundadır. Bu xərclik və gündəlik təlabata yemək, içmək, geyim, məskunlaşma, müalicə, oxutmaq və tərbiyə etmək daxildir. Bunlar həm qız, həm də oğlan uşaqlarının haqlarıdır.

Sovban ﷺ Peyğəmbərin ﷺ belə buyurduğunu rəvayət edərək deyir:

قال رسول الله ﷺ : «أفضل دينار ينفقه الرجل: دينار ينفقه على عياله، ودينار ينفقه الرجل على دابته في سبيل الله، ودينار ينفقه على أصحابه في سبيل الله» أخرجه مسلم.

***"Kişinin xərclədiyi ən yaxşı dinar (pul), ailəsi, Allah taala yolunda mindiyi miniyi və Allah yolunda öz yaxınları üçün xərclədiyi dinardır (puldur)"[2].***

Əbu Hureyrə ﷺ Peyğəmbərdən ﷺ rəvayət edərək deyir:

---

[1] Buxari: 9\ 125\ № 5082. Müslim: 4\ 1958-1959\ № 2527.

[2] Müslim: 2\ 691-692\ № 994.

قال رسول الله ﷺ: «دينار أنفقته في سبيل الله، ودينار أنفقته في رقبة، ودينار تصدقت به على مسكين، ودينار أنفقته على أهلك، أعظمها أجرا الذي أنفقته على أهلك».

أخرجه مسلم.

***"Allah yolunda xərclədiyin dinar, kölə azad etdiyin dinar, kasıba verdiyin dinar və ailən üçün xərclədiyin dinar. Bunların ən çox savab olanı ailən üçün xərclədiyin dinardır"[1].***

Çünki, azyaşlı uşaq, qız və ya oğlan olmasından asılı olmayaraq qazanc əldə etmək iqtidarında deyildir. Ona görə də Allah taala bu xərcliyi ata üzərində vacib hüquqlardan etmişdir. Ona görə ki, bu uşaqların gələcək həyatları güclü kömək və dəstək əsasında qurulmalıdır. Allah taala ataların qəlblərində elə bir məhəbbət və mərhəmət yaratmışdır ki, onlar bu xərcləri ödəməkdə heç bir çətinlik çəkməzlər. Bununla belə Allah taala bunu vacib etmiş və atalara etdikləri bu əməlin əvəzi olaraq çoxlu savab vəd etmişdir. Peyğəmbər ﷺ buyurmuşdur:

قال عليه الصلاة والسلام: «إنك لن تنفق نفقة تبتغي بها وجه الله إلا كان لك فيها أجر حتى ما تجعل في فيّ امرأتك» رواه البخاري في صحيحه ومسلم.

***"Sən Allah yolunda xərclədiyin hər malın savabını qazanırsan. Hətta həyat yoldaşına yedizdirdiyin bir tikənin də savabını qazanırsan..."[2].*** Bütün deyilən və vəd olunanlar ataları bu və digər xərcliklərdə xəsislik etməməyə çağırır!

7. Övladlar arasında bərabərliyin vacibliyi. Onların arasında qız yaxud oğlan olmasından asılı olmayaraq heç bir fərq qoymamaq.

---

[1] Müslim: 2\ 692\ № 995.
[2] Buxari: 5\ 363\ № 2742. Müslim: 3\ 1250\ № 1628.

عن النعمان بن بشير -رضي الله عنهما- قال: تصدق علي أبي ببعض ماله، فقالت أمي عمرة بنت رواحة: لا أرضى حتى تشهد رسول الله ﷺ فانطلق أبي إلى النبي ﷺ ليشهده على صدقتي. قال له رسول الله ﷺ: «أفعلت هذا بولدك كلهم» ؟ قال: لا . قال: «اتقوا الله واعدلوا في أولادكم» . فرجع أبي، فرد تلك الصدقة. أخرجه البخاري في صحيحه ومسلم.

***Noman Ibn Bəşir ﷺ deyir: Atam malının bir hissəsini mənə sədəqə olaraq vermişdi. Anam, Amratu Bint Rəvahə ﷺ dedi ki, Peyğəmbərdən ﷺ bu haqda soruşmasan mən razı olan deyiləm! Atam Peyğəmbərin ﷺ yanına gedib mənə verdiyi sədəqə haqda soruşdu. Peyğəmbər ﷺ buyurdu: "Bu sədəqəni, övladlarının hamısına vermisənmi?" Atam: xeyr, deyərək cavab verdi. Peyğəmbər ﷺ buyurdu: "Allahdan qorxun və övladlarınız arasında adillik edin!" Atam, qayıdıb mənə verdiyi sədəqəni geri götürdü[1].***

Övladlar arasında adillik etmək vacibdir.

( وإذا أعطى بعض ولده شيئًا لم يجز حتى يعدل بينهم ويعطي الآخرين مثله ). أخرجه البخاري في صحيحه.

***"Övladlarının bəzilərinə bir şey verdikdə digərlərinə də eynisini vermək lazımdır. Yalnız bu halda onlara qarşı adil olmaq mümkündür"[2].***

Bu şəriət qaydasında, ataya və övlada həddindən artıq çox mərhəmət və lütf vardır.

---

[1] Buxari: 5\ 211\ № 2587. Müslim: 3\ 1242\ № 1623.

[2] Buxari: 5\ 210.

a. Övladlar arasında fərq qoymaq, onların birini digərinə qarşı həsədli, nifrətli və qəzəbli edir. Bunu, Yusif peyğəmbər (Ona Allahın salamı olsun!) və onun qardaşlarının əhvalatı təsdiq edir. Əslində Yaqub (Ona Allahın salamı olsun!) Yusifə digər qardaşlarından daha çox xərclik verməmişdi. Sadəcə olaraq atalarının Yusifi onlardan daha çox sevdiyini hiss edib istədiklərini etdilər.

Əgər qardaşlar arasında həsəd və nifrət varsa, deməli onların qohumluq əlaqələri qırılmış hesab olunur. Belə halda onlar bir-birinə dayaq olmaqdan vaz keçər, düşmənçilik və nifrət göstərərlər.

b. Övladlar arasında fərq qoymaq, onların valideynin üzünə ağ olmalarına səbəbdir. Çünki şeytan, məhrum edilmiş övlada: "atan səni sevmir, digər qardaşını səndən çox sevir" deyərək vəsvəsə verəcəkdir. Nəticədə övlad valideynlərin haqlarını layiqincə verməyəcəkdir. Ona görə də Peyğəmbər ﷺ Noman ibn Bəşirin ؓ nəql etdiyi hədisinin bəzi rəvayətlərində buyurmuşdur:

في إحدى روايات حديث النعمان بن بشير: «أيسرك أن يكونوا لك في البر سواء ؟»

***"Sənə göstərdikləri yaxşılıqda eyni olmalarını istəmirsənmi?"***

c. Ata xərclik verməkdə övladları arasında fərq qoymaqla, övladlarının niyyətlərini korlamış olur. Çünki, bundan sonra onlar, etdikləri əməlləri və itaətlərini Allah taala üçün deyil, atalarının gözündə yaxşı görünmək və digər qardaşa verilən xərcliyə nail olmaq üçün edəcəklər.

d. Xərclik verilən övlad özünü digər qardaşlarından üstün və daha layiqli hesab edə bilər. Bu da onun həlak olması və işlərinin pozulması üçün kifayətdir.

8. Övladlara *yaxşı* tərbiyə vermək: Allah taala buyurur:

﴿ وَقُل رَّبِّ ٱرۡحَمۡهُمَا كَمَا رَبَّيَانِي صَغِيرٗا ﴾ (الإسراء:٢٤)

**"“Ey Rəbbim! Onlar məni körpəliyimdən *(nəvazişlə)* tərbiyə edib bəslədikləri kimi, Sən də onlara rəhm et!” – de." (əl-İsra: 24).**

﴿ وَإِذۡ قَالَ لُقۡمَٰنُ لِٱبۡنِهِۦ وَهُوَ يَعِظُهُۥ يَٰبُنَيَّ لَا تُشۡرِكۡ بِٱللَّهِۖ إِنَّ ٱلشِّرۡكَ لَظُلۡمٌ عَظِيمٞ...﴾ إلى قوله تعالى: ﴿ وَٱقۡصِدۡ فِي مَشۡيِكَ وَٱغۡضُضۡ مِن صَوۡتِكَۚ إِنَّ أَنكَرَ ٱلۡأَصۡوَٰتِ لَصَوۡتُ ٱلۡحَمِيرِ ١٩ ﴾ (لقمان: ١٣-١٩)

**"*(Ya Rəsulum!)* Yadında qalsın ki, bir zaman Loğman öz oğluna nəsihət edərək belə demişdi: “Oğlum! Allaha şərik qoşma. Doğrudan da, Allaha şərik qoşmaq böyük zülmdür! *(Ağır günahdır!)*”. Biz insana ata-anasına *(yaxşılıq etməyi, valideyninə yaxşı baxmağı, onlarla gözəl davranmağı)* tövsiyə etdik. Anası onu *(bətnində)* çox zəif bir halda daşımışdı. *(Uşağın süddən)* kəsilməsi isə iki il ərzində olur. *(Biz insana buyurduq:)* “Mənə və ata-anana şükür et. Axır dönüş Mənədir! Əgər *(ata-anan)* bilmədiyin bir şeyi Mənə şərik qoşmağına cəhd göstərsələr, *(bu işdə)* onlara itaət etmə. *(Qalan)* dünya işlərində onlarla gözəl keçin *(onlara qulaq as!)*, tövbə edib Mənə tərəf dönənlərin *(İslamı qəbul edənlərin)* yolunu tut. Sonra *(qiyamət günü)* Mənim hüzuruma qayıdacaqsınız. Mən də *(dünyada)* nə etdiklərinizi *(bir-bir)* sizə xəbər verəcəyəm!” *(Loğman öyüd-nəsihətinə davam edərək)* dedi: “Oğlum, *(dünyada gördüyün hər hansı yaxşı, yaxud pis iş)* bir xardal dənəsi ağırlığında olsa da, bir qayanın *(daşın)* içində, yaxud göylərdə və ya yerin təkində olsa da, Allah onu *(qiyamət günü)* ortaya gətirər *(onun haqq-hesabını çəkər)*. Həqiqətən, Allah lətifdir *(bütün incə, nazik işləri biləndir; lütfkardır)*, *(hər şeydən)* xəbərdardır! Oğlum! Namaz qıl, *(insanlara)* yaxşı işlər görməyi əmr et, pis işləri qadağan elə. *(Bu yolda)* sənə üz verəcək müsibətlərə döz. Həqiqətən, bu *(dediklərim)* vacib əməllərdəndir! Adamlardan təkəbbürlə üz**

**çevirmə, yer üzündə lovğa-lovğa gəzib dolanma. Həqiqətən, Allah heç bir özündən razını, lovğalanıb fəxr edəni sevməz! Yerişində müvazinət gözlə** ***(nə çox yeyin, nə də çox asta get)*** **və** ***(danışanda)*** **səsini qaldırma. Çünki ən çirkin səs uzunqulaq səsidir!"** ***(Loğman: 13-19).***

Bu, ataların boynuna düşən ən mühüm vacib olandır. Çünki Allah taala insanı yalnız Ona ibadət etmək üçün yaratmışdır. Allah taala buyurur:

﴿ وَمَا خَلَقْتُ ٱلْجِنَّ وَٱلْإِنسَ إِلَّا لِيَعْبُدُونِ ﴿٥٦﴾ ﴾ (الذريات:٥٦)

**"Mən, cinləri və insanları yalnız mənə ibadət etmək üçün yaratdım!" (əz-Zariyat: 56).**

İbadətlərin ən əzəmətlisi də namazdır. Atanın öz övladına namaz qılmağı əmr etməsi vacibdir. Peyğəmbər ﷺ buyurmuşdur:

قال عليه الصلاة والسلام: «مروا أولادكم بالصلاة لسبع واضربوهم عليها لعشر وفرقوا بينهم في المضاجع» رواه أبو داود في سننه، وهو حديث حسن.

***"Övladlarınıza yeddi yaşları tamamlandıqda namaz qılmağı əmr edin. On yaşlarından isə (namaz qılmasalar) onları vurun və (qızlarla oğlanların) yataqlarını ayırın"[1].***

Bu, övladların ata üzərində olan ən əhəmiyyətli haqdır. Çünki ata yalnız əməlisaleh övladından xeyir görə bilər. Əməlisaleh övlad öz atasına yaxşılıq edər, onun üçün dua edər, adından sədəqə verər və onun vəfatından sonra ona fayda verər. Allah taala atalara öz övladlarını tərbiyə etməyi və şəriət qanunlarına riayət etməyi əmr etmişdir. Bu, atanın övlada olan hədsiz yaxşılığıdır. Əslində bu, atanın özü üçün etdiyi bir yaxşılıqdır. Çünki, əgər övlad əməlisaleh olarsa, atasına həm sağlığında və həm də öləndən sonra fayda verər.

---

[1] Əbu Davud: 1\ 334\ № 495. Hədis həsəndir.

Övlad fasiq olarsa sağlığında ona zərər verər, öləndən sonra isə ona xeyir verməz.

Onlar üçün xeyir və doğru yol istəməklə dua etmək: Allah taala İbrahim və İsmailin dualarından bəzilərini xatırladaraq buyurmuşdur:

﴿ رَبَّنَا وَٱجۡعَلۡنَا مُسۡلِمَيۡنِ لَكَ وَمِن ذُرِّيَّتِنَآ أُمَّةٗ مُّسۡلِمَةٗ لَّكَ وَأَرِنَا مَنَاسِكَنَا وَتُبۡ عَلَيۡنَآۖ إِنَّكَ أَنتَ ٱلتَّوَّابُ ٱلرَّحِيمُ ﴾ (البقرة:١٢٨)

**"*(İbrahim və İsmail dedilər: )* “Ey Rəbbimiz! Bizim hər ikimizi Sənə itaətkar *(müsəlman)*, nəslimizdən yetişənləri Sənə təslim olan ümmət *(müsəlman)* et, bizə *(həcc)* əməllərimizi *(ibadət qaydalarımızı)* göstər. tövbəmizi qəbul et! Həqiqətən, Sən tövbələri qəbul edənsən, mərhəmətlisən!”" (əl-Bəqər: 128).**

Həmçinin Allah taala Zəkəriyyə peyğəmbərin belə dua etdiyini buyurur:

﴿ وَإِنِّي خِفۡتُ ٱلۡمَوَٰلِيَ مِن وَرَآءِي وَكَانَتِ ٱمۡرَأَتِي عَاقِرٗا فَهَبۡ لِي مِن لَّدُنكَ وَلِيّٗا ۝ يَرِثُنِي وَيَرِثُ مِنۡ ءَالِ يَعۡقُوبَۖ وَٱجۡعَلۡهُ رَبِّ رَضِيّٗا ﴾ (مريم: ٥-٦)

**"Mən özümdən sonra gələn qohum-əqrabamdan *(yerimə keçəcək əmioğlularımın və digər vərəsələrimin məsləkimi ləyaqətlə davam etdirməyəcəyindən)* qorxuram. Zövcəm də ki, qısırdır. Buna görə də mənə Öz dərgahından bir oğul *(vəli)* bəxş et ki, O həm mənə, həm də Yəqub nəslinə *(onlara lütf edilmiş peyğəmbərliyə)* varis olsun. Ey Rəbbim! Həm də elə et ki, o *(öz əqidəsi, itaəti və gözəl əxlaqi ilə)* riza *(Sənin rizanı)* qazanmış olsun!”" (Məryəm: 5-6)**

Əbu Hureyrə ﷺ Peyğəmbərdən ﷺ rəvayət edərək buyurur:

عن النبي ﷺ قال: «ثلاث دعوات مستجابات لا شك فيهن، دعوة الوالد، ودعوة المسافر، ودعوة المظلوم» . رواه أبو داود في سننه والترمذي في سننه وابن ماجه في سننه وحسنه الترمذي والألباني وغيرهما .

***"Üç dua qəbul olunandır və bu duaların qəbul olunmasında heç bir şübhə yoxdur. Atanın duası, müsafirin duası və məzlumun duası"[1].***

Əgər Allah taala rəhmət olaraq, ata-analara övladları üçün etdikləri duaları qəbul edəcəyini vəd edibsə, onlar övladları üçün gözəl dualar etməyi unutmamalıdırlar. Çünki övladlar nə qədər bu dünyada sağdırlarsa, valideynlər üçün dünyada göz işığı, öldükdən sonra isə daimi sədəqə ola bilərlər.

Bu, valideynlərin boynuna düşən bəzi övlad haqlarıdır. Biz sadəcə olaraq onun az bir hissəsində İslamın gözəlliklərini qeyd etdik. Deyilənlərin hamısı, İslam şəriətinin kamil və hikmətli şəriət olmasının sübutudur.

**Yeddinci: İslamda qadın hüquqları:**

1. İslamdan öncə, Cahillik dövründə insanlar qız uşaqlarını özlərinə ayıb və ar hesab edərdilər. Bu hissiyat bəzi yerlərdə, başqa üsullarla, hələ də davam etməkdədir. İlk Cahillik dövründə bəziləri doğulmuş qız uşaqlarını diri-diri basdırırdılar. Müasir Cahillik dövründə isə çox insanlar var ki, uşağının qız olduğunu bilib uşağı saldırır *(abort etdirir)* və həmin körpəni həyatdan məhrum edirlər.

İslam dini qız uşaqlarına qarşı olan bu münasibəti rədd edir, onlara bəslənən nifrət və məyusluğa qarşı mübarizə aparır, qadınlara

---

[1] Əbu Davud: 2\ 187\ № 1536. Tirmizi: 5\ 468\ № 3448. Ibn Macə: 2\ 1270\ № 3862. Tirmizi, Albani və digər alimlər hədisin həsən olduğunu demişlər.

həyatda zəruri olan hüquqlarını verir. Ona görə də Cahillik dövrünə bunu eyib sayaraq buyurmuşdur:

﴿ وَيَجۡعَلُونَ لِلَّهِ ٱلۡبَنَٰتِ سُبۡحَٰنَهُۥ وَلَهُم مَّا يَشۡتَهُونَ ﴿٥٧﴾ وَإِذَا بُشِّرَ أَحَدُهُم بِٱلۡأُنثَىٰ ظَلَّ وَجۡهُهُۥ مُسۡوَدّٗا وَهُوَ كَظِيمٞ ﴿٥٨﴾ يَتَوَٰرَىٰ مِنَ ٱلۡقَوۡمِ مِن سُوٓءِ مَا بُشِّرَ بِهِۦٓۚ أَيُمۡسِكُهُۥ عَلَىٰ هُونٍ أَمۡ يَدُسُّهُۥ فِي ٱلتُّرَابِۗ أَلَا سَآءَ مَا يَحۡكُمُونَ ﴾ (النحل:٥٧-٥٩)

**"Onlar Allaha qızlar isnad edirlər** ***(Mələklər Allahın qızlarıdır, deyirlər).*** **Allah pakdır, müqəddəsdir.** ***(Onun oğula-qıza ehtiyacı yoxdur.)*** **Özlərinə gəldikdə isə istədiklərini** ***(oğlan uşaqlarını)*** **aid edirdilər. Onlardan birinə qızı olması ilə müjdə verdikdə qəzəblənib üzü qapqara qaralır. Verilən müjdənin pisliyi üzündən tayfasından qaçıb gizlənir.** ***(Allah bilir!)*** **Görəsən, onu** ***(o körpəni)*** **zillət içində saxlayacaq, yoxsa torpağa göməcək?** ***(Diri-diri basdıracaq?)*** **Bir görün onlar necə pis mühakimə yürüdürlər!** ***(Oğlanları özlərinə götürüb qızları Allaha isnad edirlər.)*** **" (ən-Nəhl: 57-59).**

﴿ وَإِذَا ٱلۡمَوۡءُۥدَةُ سُئِلَتۡ ﴿٨﴾ بِأَيِّ ذَنۢبٖ قُتِلَتۡ ﴾ (التكوير: ٨-٩)

**"Diri-diri torpağa gömülən körpə qızdan: “Axı o hansı günaha görə öldürüldü?”; soruşulacağı zaman;" (ət-Təkvir: 8, 9).**

Əslində İslam dini qızları gözəl tərbiyə etməyə, onlara yaxşı baxmağa yönəltmiş və bunun əvəzində çox böyük savab vəd etmişdir.

فعن عائشة –رضي الله عنها– قال: جاءتني مسكينة تحمل ابنتين لها، فأطعمتها ثلاث تمرات، فأعطت كل واحدة منهما تمرة، ورفعت إلى فيها تمرة لتأكلها، فاستطعمتها

ﷺ فقال: «إن الله قد أوجب لها بها الجنة أو أعتقها بها من النار» .

أخرجه مسلم.

***Aişə ﵂ deyir: "kasıb bir qadın iki qızı ilə birlikdə mənim yanıma gəldi. Mən ona üç ədəd xurma verdim. O, qızlarının hərəsinə bir xurma yedizdirdi. Birini də özü yemək istədikdə qızları ondan həmin xurmanı da istədilər. O, əlində olan xurmanı iki hissəyə bölüb onlara verdi. Qadının bu hərəkəti mənim çox xoşuma gəldi. Mən onun hərəkətini Peyğəmbərə ﷺ danışdıqda o belə buyurdu: "Allah taala bu qız uşağı ilə ona cənnəti (oraya daxil olmağı) vacib etmiş, yaxud o qız uşağı ilə onu cəhənnəmdən xilas etmişdir"[1].***

Ənəs ibn Malik ﵁ Peyğəmbərdən ﷺ rəvayət edərək deyir:

قال رسول الله ﷺ: «من عال جاريتين حتى تبلغا جاء يوم القيامة أنا وهو وضم أصابعه» . أخرجه مسلم.

***"Kim iki qız uşağını böyüdüb başa çatdırarsa qiyamət günü mənimlə belə olar" deyərək (şəhadət və orta) barmaqlarını birləşdirdi"[2].***

2. İslam, qadının ibadət əhli və şəriət qanunlarının icraçılarından olduğunu qeyd etmişdir. Kişilərə müraciət etdiyi kimi onlara da müraciət etmişdir. İtaət etmələri müqabilində kişilərə verilən savab qadınlara da verilmişdir. Bu haqda Allah taala buyurur:

---

[1] Müslim: 4\ 2027\ № 2630.
[2] Müslim: 4\ 2027\ № 2631.

﴿ فَٱسۡتَجَابَ لَهُمۡ رَبُّهُمۡ أَنِّي لَآ أُضِيعُ عَمَلَ عَٰمِلٖ مِّنكُم مِّن ذَكَرٍ أَوۡ أُنثَىٰۖ بَعۡضُكُم مِّنۢ بَعۡضٖ ﴾ (آل عمران:١٩٥)

**"Rəbbi də onların dualarını qəbul edərək cavab verdi: "İstər kişi, istərsə də qadın olsun, Mən heç birinizin əməlini puça çıxartmaram. Siz *(hamınız)* bir-birinizdənsiniz *(dində kişi, qadın eynidir)*." (Ali İmran: 195).**

﴿ وَٱلۡمُؤۡمِنُونَ وَٱلۡمُؤۡمِنَٰتُ بَعۡضُهُمۡ أَوۡلِيَآءُ بَعۡضٖۚ يَأۡمُرُونَ بِٱلۡمَعۡرُوفِ وَيَنۡهَوۡنَ عَنِ ٱلۡمُنكَرِ وَيُقِيمُونَ ٱلصَّلَوٰةَ وَيُؤۡتُونَ ٱلزَّكَوٰةَ وَيُطِيعُونَ ٱللَّهَ وَرَسُولَهُۥٓۚ أُوْلَٰٓئِكَ سَيَرۡحَمُهُمُ ٱللَّهُۗ إِنَّ ٱللَّهَ عَزِيزٌ حَكِيمٞ ﴾ (التوبة:٧١)

**"Mömin kişilərlə mömin qadınlar bir-birinə dostdurlar *(hayandırlar)*. Onlar *(insanlara)* yaxşı işlər görməyi əmr edər, pis işləri yasaq edər, namaz qılıb zəkat verər, Allaha və Onun Peyğəmbərinə (*ona Allahın salavatı və salamı olsun!*) itaət edərlər. Allah, əlbəttə ki, onlara rəhm edəcəkdir. Allah, həqiqətən, yenilməz qüvvət sahibi, hikmət sahibidir!" (ət-Tövbə: 71).**

﴿ إِنَّ ٱلۡمُسۡلِمِينَ وَٱلۡمُسۡلِمَٰتِ وَٱلۡمُؤۡمِنِينَ وَٱلۡمُؤۡمِنَٰتِ وَٱلۡقَٰنِتِينَ وَٱلۡقَٰنِتَٰتِ وَٱلصَّٰدِقِينَ وَٱلصَّٰدِقَٰتِ وَٱلصَّٰبِرِينَ وَٱلصَّٰبِرَٰتِ وَٱلۡخَٰشِعِينَ وَٱلۡخَٰشِعَٰتِ وَٱلۡمُتَصَدِّقِينَ وَٱلۡمُتَصَدِّقَٰتِ وَٱلصَّٰٓئِمِينَ وَٱلصَّٰٓئِمَٰتِ وَٱلۡحَٰفِظِينَ فُرُوجَهُمۡ وَٱلۡحَٰفِظَٰتِ وَٱلذَّٰكِرِينَ ٱللَّهَ كَثِيرٗا وَٱلذَّٰكِرَٰتِ أَعَدَّ ٱللَّهُ لَهُم مَّغۡفِرَةٗ وَأَجۡرًا عَظِيمٗا ٣٥ ﴾ (الأحزاب:٣٥)

**"Həqiqətən, Allah məhz müsəlman kişilər və qadınlar, mömin kişilər və qadınlar, *(Allaha)* müti kişilər və qadınlar, doğru danışan kişilər və qadınlar, səbirli kişilər və qadınlar, təvazökar**

***(yalnız Allah qarşısında kiçilən)* kişilər və qadınlar, sədəqə verən, oruc tutan kişilər və qadınlar, ayıb *(övrət)* yerlərini *(zinadan)* qoruyub saxlayan kişilər və qadınlar və Allahı çox zikr edən kişilər və qadınlar üçün *(axirətdə)* məğfirət *(bağışlanma)* və böyük bir mükafat *(Cənnət)* hazırlamışdır!" (əl-Əhzab: 35).**

3. İslam qadına sahiblik hüququ, öz şəxsi mülkiyyətini istədiyi kimi istifadə etməsinə icazə vermişdir. Bu haqda Allah taala buyurur:

﴿ لِّلرِّجَالِ نَصِيبٌ مِّمَّا ٱكۡتَسَبُواْۖ وَلِلنِّسَآءِ نَصِيبٌ مِّمَّا ٱكۡتَسَبۡنَ ﴾ (النساء:٣٢)

**"Kişilərin öz qazandıqlarından öz payı, qadınların da öz qazandıqlarından öz payı vardır..." (ən-Nisa: 32).**

4. İslam qadının varislik hüququnu da qorumuşdur. Qız, oğulun qızı, ana, nənə, bacı və azad edilmiş kölə qadın üçün, şəriətin vərəsədə nəzərdə tutduğu miqdarda pay vardır. Allah taala buyurur:

﴿ لِّلرِّجَالِ نَصِيبٌ مِّمَّا تَرَكَ ٱلۡوَٰلِدَانِ وَٱلۡأَقۡرَبُونَ وَلِلنِّسَآءِ نَصِيبٌ مِّمَّا تَرَكَ ٱلۡوَٰلِدَانِ وَٱلۡأَقۡرَبُونَ مِمَّا قَلَّ مِنۡهُ أَوۡ كَثُرَۚ نَصِيبًا مَّفۡرُوضًا ﴿٧﴾ ﴾ (النساء:٧)

**"Ata, ana və qohumların *(vəfat etdikdə)* qoyub getdikləri maldan kişilərə və qadınlara pay düşür. Həmin malın azından da, çoxundan da *(bunlara veriləcək)* hissə müəyyən edilmişdir." (ən-Nisa: 7).**

İslamdan əvvəl, Cahillik dövründə əri ölmüş qadın, ərinin yaxınları tərəfindən məcburən miras payı kimi götürülürdü. Onlar həmin qadınla ya evlənir, yaxud istədiyinə ərə verir və ya evlənməkdən məhrum edərək əvəzində özünü azad etməsi üçün ondan pul tələb edərdilər. İslam gəldikdən sonra qadını bu təhqir və alçaltmadan xilas etdi. Onun heyvan və ya var-dövlət kimi miras obyekti olmadığını bəyan etdi. Onu sıxışdırmağı qadağan etdi və evlənmək qadağasını ləğv etdi.

Bu haqda Allah taala buyurur:

﴿ يَٰٓأَيُّهَا ٱلَّذِينَ ءَامَنُواْ لَا يَحِلُّ لَكُمۡ أَن تَرِثُواْ ٱلنِّسَآءَ كَرۡهٗاۖ وَلَا تَعۡضُلُوهُنَّ لِتَذۡهَبُواْ بِبَعۡضِ مَآ ءَاتَيۡتُمُوهُنَّ إِلَّآ أَن يَأۡتِينَ بِفَٰحِشَةٖ مُّبَيِّنَةٖ ﴾ (النساء:١٩)

**"Ey iman gətirənlər! Qadınlara zorla varis olmaq sizə halal deyil! *(Qadınlar)* açıq-aşkar pis bir iş görməyincə, özlərinə verdiyiniz şeylərin *(mehrin)* bir hissəsini geri qaytarmaq məqsədilə onlara əziyyət verməyin..." (ən-Nisa: 19).**

5. Cahillik dövründə qadın ər seçməkdən məhrum idi. İslam dini gəldikdən sonra qadına ər seçmək üçün tam ixtiyar vermişdir. Əbu Hureyrə ﷺ Peyğəmbərdən ﷺ rəvayət edərək deyir:

أن النبي ﷺ قال: «لا تنكح الأيم حتى تستأمر، ولا تنكح البكر حتى تستأذن». قالوا: يا رسول الله وكيف إذنها؟ قال: «أن تسكت». أخرجه البخاري في صحيحه ومسلم.

***"Dul qadınla onun (dili ilə dediyi) icazəsindən sonra nikah edilir, bakirə qızla ondan icazə aldıqdan sonra nikah bağlanır"*** Səhabələr dedilər: Ey Allahın Rəsulu, ondan icazə necə alınır? *(yəni, bakirə qız utandığından danışmadığı üçün səhabələr bu sualı verirlər!)* Peyğəmbər ﷺ buyurdu: ***"Onun susması – icazəsi deməkdir"[1].***

وعن خنساء بنت خدام الأنصارية أن أباها زوجها وهي ثيب فكرهت ذلك فأتت رسول الله ﷺ فرد نكاحها. أخرجه البخاري في صحيحه.

***Xənsə bint Xidam əl-Ənsariyyə deyir: Mən dul qadın idim. Atam məni ərə vermişdi. Lakin mən istəmirdim. Peyğəmbərin ﷺ yanına gəldim və o mənim nikahımı geri qaytartdı[2].***

---

[1] Buxari: 9\ 191\ № 5136. Müslim: 2\ 1036\ № 1419.
[2] Buxari: 12\ 318\ № 6945.

وعن ابن عباس –رضي الله عنهما– أن جارية بكرا أتت النبي ﷺ فذكرت له أن أباها زوجها وهي كارهة؛ فخيرها النبي ﷺ. أخرجه أبو داود في سننه وابن ماجه في سننه وصححه الألباني في صحيح سنن ابن ماجة.

***İbn Abbas ﷺ deyir: Bir bakirə qız Peyğəmbərin ﷺ yanına gəlib atasının onu zorla ərə verdiyini dedikdə, Peyğəmbər ﷺ qıza seçim etmək üçün ixtiyar verdi[1].***

İslam qadına, bakirə yaxud dul olmasından asılı olmayaraq, özünə ər seçmək üçün tam hüquq vermişdir. Əgər onun böyükləri onu istəmədiyi bir adama ərə versələr, qadının həmin nikahı geri qaytarmağa tam hüququ çatır.

6. İslam, evlənmək istəyən kişiyə nikah bağlayacağı qadına mehr verməsini vacib etmişdir. Bu mehr, qadının maddi hüququdur. Bu mal onun özünə məxsus olur. Heç kəsin bunda payı ola bilməz. Mehrin sahibkarı da odur. Allah taala buyurur:

﴿ وَءَاتُواْ ٱلنِّسَآءَ صَدُقَٰتِهِنَّ نِحۡلَةٗۚ فَإِن طِبۡنَ لَكُمۡ عَن شَيۡءٖ مِّنۡهُ نَفۡسٗا فَكُلُوهُ هَنِيٓـٔٗا مَّرِيٓـٔٗا ٤ ﴾ (النساء:٤)

**"Qadınlarınızın mehrlərini könül xoşluğuyla verin! Əgər onlar qəlbən, öz razılıqları ilə bundan sizə bir şey bağışlasalar, onu halal olaraq, nuşcanlıqla yeyin!" (ən-Nisa: 4)**

﴿ فَمَا ٱسۡتَمۡتَعۡتُم بِهِۦ مِنۡهُنَّ فَـَٔاتُوهُنَّ أُجُورَهُنَّ فَرِيضَةٗۚ وَلَا جُنَاحَ عَلَيۡكُمۡ فِيمَا تَرَٰضَيۡتُم بِهِۦ مِنۢ بَعۡدِ ٱلۡفَرِيضَةِ ﴾ (النساء:٢٤)

[1] Əbu Davud: 2\ 576\ № 2096. Ibn Macə: 1\ 603\ № 1875. Albani hədisin səhih olduğunu qeyd edib.

**"İstifadə etdiyiniz qadınların mehrlərini lazımi qaydada verin! Mehr müəyyən edildikdən sonra aranızda razılaşdığınız şeydən ötrü sizə heç bir günah yazılmaz...." (ən-Nisa: 24).**

7. İslam şəriətinin qanunlarına görə qadın da hər hansı düşmənə aman verə bilər. Bu Peyğəmbərin ﷺ səhih Sünnəsində öz əksini tapmışdır.

فعن أبي مرة مولى أم هانئ بنت أبي طالب أخبره أنه سمع أم هانئ بنت أبي طالب تقول: ذهبت إلى رسول الله ﷺ عام الفتح، فوجدته يغتسل وفاطمة ابنته تستره، فسلمت عليه، فقال: «من هذه؟» فقلت: أنا أم هانئ بنت أبي طالب. فقال: «مرحبا بأم هانئ». فلما فرغ من غسله قام فصلى ثماني ركعات ملتحفا في ثوب واحد، فقلت: يا رسول الله زعم ابن أمي علي أنه قاتل رجلا قد أجرته فلان بن هبيرة، فقال رسول الله ﷺ: «قد أجرنا من أجرت يا أم هانئ». قالت: أم هانئ وذلك ضحى. أخرجه البخاري في صحيحه.

Ummu Hani binti Əbu Talibin köləsi Əbu Murrah sahibəsi Ummu Hani binti Əbu Talibdən rəvayət edərək deyir: *"Mən Məkkənin fəthi ilində Peyğəmbərin ﷺ yanına getdim. Bu vaxt o çimirdi və qızı Fatimə ona pərdə tutmuşdu. Mən Peyğəmbərə ﷺ salam verdim. O dedi: "Bu kimdir?" Dedim: Ummu Hani binti Əbu Talibdir. O dedi: "Ummu Hani xoş gəlib!" o, çimib qurtardıqdan sonra bir paltara bürünmüş halda qalxıb səkkiz rükət namaz qıldı. Mən dedim: Ey Allahın Elçisi! Anamın oğlu Əli, İbn Hubeyranın aman verdiyi kimsəni öldürdüyünü iddia edir. Peyğəmbər ﷺ buyurdu: "Ey Ummu Hani! Sənin aman verdiyinə biz də aman*

***verdik!" Ummu Hani demişdir: (o vaxt Peyğəmbərin ﷺ qıldığı) Bu namaz duha namazı idi[1].***

İslam dini, qadının əhdi-peymanına ehtiramla yanaşmağı, verdiyi vədləri həyata keçirməyi əmr edir. Onun aman verdiyi insana heç bir zərər toxundurmaq olmaz.

8. İslam, hətta kafirlərlə müsəlmanlar arasında baş verən müharibə vaxtı qadınları öldürməyi qadağan etmişdir.

فعن عبد الله بن عمر – رضي الله عنهما – قال: وجدت امرأة مقتولة في بعض مغازي رسول الله ﷺ، فنهى رسول الله ﷺ عن قتل النساء والصبيان. أخرجه البخاري في صحيحه وسلم.

Abdullah ibn Ömər ﵁ deyir: ***Peyğəmbərin ﷺ apardığı döyüşlərinin birində ölmüş qadın meyidi tapıldı. Bundan sonra Peyğəmbər ﷺ döyüş vaxtı qadınların və uşaqların öldürülməsini qadağan etdi[2].***

Qadın döyüşçü sayılmadığına görə onu öldürmək yasaq edilmişdir. Qadın Allah taalanın düşməni olsa belə, İslam onun zəif olduğunu nəzərə almışdır. Çünki İslamın məqsədi insanları qırmaq deyil, onun təbliğatının qarşısını kəsən maneələri götürməkdir.

9. İslam, qadınlara yaxşılıq etməyi, onlarla gözəl davranmağı kişilərə tövsiyə etmişdir. Allah taala buyurur:

﴿ وَعَاشِرُوهُنَّ بِٱلْمَعْرُوفِ ﴾ (النساء:١٩)

**"Onlarla gözəl (Allahın buyurduğu kimi) rəftar edin..." (ən-Nisa: 19).**

Əbu Hureyrə ﵁ Peyğəmbərdən ﷺ rəvayət edərək deyir:

---

[1] Buxari: 6\ 273\ № 3171.

[2] Buxari: 6\ 148\ № 3015. Müslim: 3\ 1364\ № 1744.

عن النبي ﷺ قال: «من كان يؤمن بالله واليوم الآخر؛ فلا يؤذِ جاره، واستوصوا بالنساء خيرا؛ فإنهن خلقن من ضِلَع، وإن أعوج شيء في الضلع أعلاه، فإن ذهبت تقيمه كسرته، وإن تركته لم يزل أعوج؛ فاستوصوا بالنساء خيرا» أخرجه البخاري في صحيحه ومسلم.

***"Kim Allaha və axirət gününə iman gətirirsə qonşusuna əziyyət verməsin. Qadınlarla xoş davranın. Çünki onlar qabırğadan yaradılmışlar. Qabırğanın ən əyri hissəsi yuxarı tərəfidir. Sən (qabırğadakı) bu əyriliyi düzəltmək istəsən onu sındıracaqsan. Onu düzəltməkdən vaz keçsən öz əyriliyində qalacaqdır. Qadınlarla xoş davranın!"[1].***

10. İslam qadının yemək, içmək, geyim, ev, müalicə və s. xərcliklərinə zəmanət vermişdir. Bu bir arxayın ictimai zəmanətə bənzəyir. Bu zəmanət onun həyat mərhələlərinə şamil edilir. Bu xərcliklər, kişinin: atanın, ərin yaxud oğulun üzərinə düşən vacibatlardır... Allaha and olsun ki, bu qadına verilən ən gözəl himayədarlıq və hədsiz mərhəmətdir. İslam, qadının bütün xərclərini kişiyə vacib etdiyi bir halda, qadını bütün məsrəflərdən azad etmişdir. Qadına öz malını qorumağa haqq vermiş və onu öz malının sahibi təyin etmişdir.

Bu, İslam şəriətinin gözəlliklərindəndir. Çünki qadının cəmiyyətdə çox böyük və məsuliyyətli vəzifəsi vardır. Bu vəzifə - dünyaya övlad gətirmək və onları gözəl tərbiyə etməkdir. Bunu etmək üçün ona vaxt lazımdır. Həmçinin qadın yaradılış baxımından zəifdir. Ona görə də işləmək onu üzür və ona əziyyət verir. Ən əhəmiyyətlisi isə, qadın kişilərin tamah obyektidir. Qadının kişi ilə birlikdə işləməsi onun və kişinin dininə zərərdir. Bununla belə

[1] Buxari: 9\ 252-253\ № 5185, 5186. Müslim: 2\ 1091\ № 1468.

qadının işləməsinə və ruzi qazanmasına müəyyən şərtlər çərçivəsində icazə verilir. Belə şərtlərdən biri: iş qadının dünyaya uşaq gətirməsinə və onları tərbiyə etməsinə mane olmamalı, işə gedərkən abır-həyalı olmalı, hicab geyinməli, işlədiyi yerdə kişilər olmamalıdır. Əgər bu şərtlər olarsa qadının işləməsi eyib etməz. Lakin qadının İslam cəmiyyətində əsas təyinatı onun himayədə olmasıdır. Evdə olan kişinin; ata, oğul, ər və ya qardaşın qadının maddi ehtiyaclarını ödəməsi vacibdir.

Əsas odur ki, İslam şəriəti qadına ona məxsus fitri hüquqlarını vermiş, İslam şəriətinə uyğun xoşbəxt, hörmət və izzətlə yaşamasına şərait yaratmışdır. İslamın sayəsində nemətlər əldə edən qadın ən gözəl bolluq içindədir. Ey müsəlmanlar! Allah taalanın bizə verdiyi İslam nemətinə şükr etməliyik.

# Dördüncü fəsil:
## İslamın sehr, zina, uşaqbazlıq, açıq-saçıqlıq, kişi və qadınların ünsiyyəti, sələm, sərxoşedicilər və qumar kimi haram əməlləri qadağan etməsində olan gözəllikləri:

İslam təmiz nemətləri, onların gözəlliyinə görə halal etmişdir. Murdar *(napak)* şeyləri də pisliklərinə, fəsadına və şərinə görə haram etmişdir. Allah taala buyurur:

﴿ ٱلنَّبِيَّ ٱلۡأُمِّيَّ ٱلَّذِي يَجِدُونَهُۥ مَكۡتُوبًا عِندَهُمۡ فِي ٱلتَّوۡرَىٰةِ وَٱلۡإِنجِيلِ يَأۡمُرُهُم بِٱلۡمَعۡرُوفِ وَيَنۡهَىٰهُمۡ عَنِ ٱلۡمُنكَرِ وَيُحِلُّ لَهُمُ ٱلطَّيِّبَٰتِ وَيُحَرِّمُ عَلَيۡهِمُ ٱلۡخَبَٰٓئِثَ ﴾ (الأعراف:١٥٧)

**"O kəslər ki, əllərindəki Tövratda və İncildə *(adını, vəsfini və əlamətlərini)* yazılmış gördükləri rəsula–ümmi *(heç kəsin yanında oxuyub elm öyrənməmiş və ya məkkəli)* peyğəmbərə tabe olurlar. *(O Peyğəmbər)* onlara yaxşı işlər görməyi buyurar, pis işləri qadağan edər, təmiz *(pak)* nemətləri halal, murdar *(napak)* şeyləri haram edər,..." (əl-Əraf: 157).**

İslamda haram olan şeylər bəllidir. Bu məqamda biz yalnız onların bəzilərini qeyd edəcəyik. Onları etməyin cəzasını, törətdikləri fəsadları xatırladacağıq. İslam şəriətinin bu kimi şeyləri haram etməsi, haram əməl edənləri qorxudaraq şiddətli cəzalar vəd etməsi, onun gözəlliyini bir daha sübuta yetirir. Belə haramlardan:

**Birinci: sehr;**

Sehr, sehrləndirilən adama, onun qəlbinə və yaxud ağlına dolayı yolla təsir etmək üçün sehrbazın dediyi və ya yazdığı söz və yaxud da etdiyi şeydir.

**Sehrin zərəri və onun haram edilməsinin gözəllikləri:**

Sehr, şeytan ilə sehrbaz arasında olan bağlılığın nəticəsidir. Bunların hər ikisi pis nəfslərdir və onlar öz məqsədlərinə nail olmaq üçün əlbir olublar. Tamahının həddi olmayan pis nəfsdən cəmiyyət üçün nə fayda olar? Ona görə də sehr, cəmiyyət üçün böyük təhlükədir və dağıdıcılıqdır. Indi isə bu təhlükələrin bəzilərinə nəzər salaq:

1. Sehr insanın bədəninə və ağlına təsir edir. Sehr olunmuş adama qarşı düşmənçilik edilmişdir. Bu sehr onu öldürə, yaxud ağlına və ya bədəninə xələl gətirə bilər. Nəticədə insan və onun yaşadığı cəmiyyət zərər çəkər.
2. Sehrbaz əməlini uzaqdan etdiyinə görə, dünyada öz cəzasını çəkmir. O bu əməli ilə, cinayət törədib sonra tapılmayacağından əmin olub gizlənən cinayətkara bənzəyir. Belə cinayətkar cəzalanmayacağına arxayın olaraq çoxlu fəsad törədər. Sehrbaz da bu dünyada cəzalanmayacağına arxayındır. Ona görə də onun şəri və fəsadı yer üzündə çoxalır və insanlar şərin haradan gəldiyinin fərqində olmurlar.
3. Allah taala buyurur:

﴿ وَيَتَعَلَّمُونَ مَا يَضُرُّهُمْ وَلَا يَنفَعُهُمْ ﴾ (البقرة:١٠٢)

**"Onlar *(yəhudilər)* ancaq özlərinə faydası olmayan, zərər verən şeyləri öyrənirdilər..." (əl-Bəqərə: 102).**

Sehr hərtərəfli ziyandır. Onun heç bir xeyir tərəfi yoxdur. Ilk zərər çəkən sehrbazın özüdür. Çünki o, özünü düşməni olan iblisə tabe etmişdir. Iblis onun üçün yalnız şər istər. Insan bu gözəgörünməz düşməni görməkdə acizdir. Sehrbazın başqalarına verdiyi zərər isə açıq-aşkardır.

4. Sehr, tikilmiş evlərin yıxılmasına səbəbdir. O, mehriban insanları və ailələri parçalamağa səbəbdir. Bu yalnız sehr əməli ilə mümkündür. Onun nəticəsində kişi öz arvadına, yaxud arvad öz

kişisinə nifrət edir və onların ayrılmasına gətirib çıxarır. Bu haqda Allah taala buyurur:

﴿ فَيَتَعَلَّمُونَ مِنْهُمَا مَا يُفَرِّقُونَ بِهِۦ بَيْنَ ٱلْمَرْءِ وَزَوْجِهِۦ ﴾ (البقرة:١٠٢)

"*(Bununla belə yəhudilər)* **yenə də ər-arvad arasına nifaq salan işləri onlardan öyrənirdilər..." (əl-Bəqərə: 102).**

Ailələrin dağılması cəmiyyətdə fitnə-fəsadın çoxalması deməkdir.

5. Sehr, insanların dərrakəsini xurafat və mövhumatçılığa qaytarır. Çünki sehr elm üzərində qurulmamış və bəlli yollarla təcrübədən keçmiş üsullardan ibarət deyildir. Əslində sehr sehrbazın gizli yollarla, şeytan vasitəsi ilə əldə etdiyi məlumatlardır. Bu fəslə insanların cahilliyindən istifadə etmək istəyən hər yalançı daxildir. Insanlar problemlərini həll etmək üçün doğru yollardan və maddi səbəblərdən istifadə etmək əvəzinə, qəlblərini sehrbazlara, baxıcılara və falçılara bağlayırlar. Bu fırıldaqçıların işləri yalnız insanların dərdlərinin üstünə dərd qoymaq və onların mallarını mənimsəməkdir. Eyni zamanda insanlara yanlış fikirlər aşılamaqla onları dinlərindən uzaqlaşdırır və mallarına sahib çıxırlar.

6. Əslində sehrbaz muzdlu qatildir. O, pulun əvəzində hansısa evi dağıtmağa, ər-arvadı ayırmağa, ailə üzvlərində müvəqqəti xəstəliklər göstərməyə razılıq verir. Ailə bu problemləri həll etmək üçün müəyyən çətinliklər, tibbi müalicə və müayinələr ilə qarşılaşırlar. Bütün bunlar sehr olunmuş adamın nəfsinə pis təsir göstərir və eyni zamanda onun malı və bədəni tələf olur. Hətta bəzi hallarda sehr ölümlə nəticələnir. Yaxud sehr, sehrlənmiş adamı həddindən artıq üzür və nəticədə onun ölümünə və ailə üzvlərinin əzab-əziyyətinə səbəb olur. Dünya malına görə edilən bu əməl əsl cinayətdir.

Bu təhlükəli zərərlərə və müxtəlif şər əməllərə görə İslam dini sehrin haramlığını bildirmiş, sehrbazın isə kafir olduğunu və onun cəzasını ölüm hökmü etmişdir.

## Ikinci: Zina (*qeyri qanuni cinsi yaxınlıq*);

Zina böyük günahlardan, fahişə əməllərindən sayılır. O həddindən artıq pis və biabırçı bir əməldir. Allah taala zinanı haram edərək buyurmuşdur:

﴿ وَلَا تَقْرَبُوا۟ ٱلزِّنَىٰٓ ۖ إِنَّهُۥ كَانَ فَٰحِشَةً وَسَآءَ سَبِيلًا ﴿٣٢﴾ ﴾ (الإسراء:٣٢)

**"Zinaya da yaxın düşməyin. Çünki o, çox çirkin bir əməl və pis bir yoldur!" (əl-İsra: 32).**

Zinanın təhlükəsi, böyük zərəri və şərinə görə Allah taala onun haram olduğunu bildirmiş, onu edənə şiddətli əzab vəd etmişdir. Onun üçün həm dünya və həm də axirət cəzası təyin etmişdir. Zinanın zərərləri həddindən artıq çoxdur. Biz onları üç: dini, nəfsi və ictimai qismə bölürük.

### Zinanın dinə vurduğu zərərləri:

**Allah taaladan uzaqlaşmaq**

Allah taala belə əməllərə nifrət etdiyinə görə onları haram etmişdir. Allah taala belə günahları qeyd etdikdən sonra buyurmuşdur:

﴿ كُلُّ ذَٰلِكَ كَانَ سَيِّئُهُۥ عِندَ رَبِّكَ مَكْرُوهًا ﴿٣٨﴾ ﴾(الإسراء:٣٨)

**"Bütün bunlar Rəbbinin dərgahında bəyənilməyən (məkruh), pis şeylərdir." (əl-İsra: 38).**

**Imanın zəifləməsi**

Iman saleh əməllər etməklə artar, günah etməklə azalar. Zina günahların ən böyüyü sayılır. Zina etmək qəlbdən iman nurunu aparır və onu zəiflədir. Zinakar imanını tam itirmə təhlükəsi ilə

qarşılaşa bilər. Əbu Hureyrə ﷺ Peyğəmbərdən ﷺ rəvayət edərək deyir:

عن النبي ﷺ قال: «لا يزني الزاني حين يزني وهو مؤمن». رواه البخاري في صحيحه ومسلم.

***"Zinakar zina etdiyi vaxt mömindir (yəni, qəlbində olan iman tam silinmir)"[1].***

Allah taala buyurur:

﴿ وَٱلَّذِينَ لَا يَدۡعُونَ مَعَ ٱللَّهِ إِلَـٰهًا ءَاخَرَ وَلَا يَقۡتُلُونَ ٱلنَّفۡسَ ٱلَّتِي حَرَّمَ ٱللَّهُ إِلَّا بِٱلۡحَقِّ وَلَا يَزۡنُونَۚ وَمَن يَفۡعَلۡ ذَٰلِكَ يَلۡقَ أَثَامًا ﴿٦٨﴾ يُضَٰعَفۡ لَهُ ٱلۡعَذَابُ يَوۡمَ ٱلۡقِيَٰمَةِ وَيَخۡلُدۡ فِيهِۦ مُهَانًا ﴿٦٩﴾ إِلَّا مَن تَابَ ﴾ (الفرقان:٦٨-٧٠)

**"Onlar Allahla yanaşı başqa bir tanrıya ibadət etməz, Allahın haram buyurduğu cana nahaq yerə qıymaz *(onu öldürməz)*, zina etməzlər. Hər kəs bunu *(bu işləri)* etsə, cəzasını çəkər. Qiyamət günü onun əzabı qat-qat olar və *(o, əzab)* içində zəlil olub əbədi qalar. Ancaq tövbə edənlərdən başqa!..." (əl-Furqan: 68-70).**

## Zinanın ictimai zərərləri:

Onun ictimai zərərləri həddindən artıq çoxdur.

1. Zina, qurulmuş evləri yıxır. Çünki, zinakar kişi öz arvadından soyuyur və onunla yaxınlıq etmək istəmir. Bunu hiss edən arvad ilə ər arasında soyuqluq baş verəcəkdir. Kişi isə arvadının ona əlavə ağır yük, həmçinin hədəflərinə mane olmasını hiss edəcəkdir. Arvad ərinin bu hərəkətini bildikdə qəm-qüssəyə düşür və bununla ailə problemlərinə qapı açılır. Bunun iki həlli vardır: ya kişi etdiyi çirkin əməldən əl çəkməlidir, ya da qurulmuş ailə tamamilə dağılmalıdır.

Əgər zina edən arvad olarsa, bu, həmin ailənin artıq dağılması deməkdir. Çünki qadın mülayimlikdə güclü,

[1] Buxari: 5\ 119\ № 2475. Müslim: 1\ 76-77\ № 57.

müqavimətdə isə zəifdir. Əgər qadın bu əməlini davam etdirərsə, onun ailəsi mütləq dağılar, özü və övladları şərə düçar olarlar.

2. O, vələduzna *(zinadan doğulan)* uşaqların olmasına səbəbdir. Bu isə bir neçə baxımdan böyük təhlükədir.

Birinci: Başqa kişidən hamilə qalmış qadın böyük təhlükə etmişdir. Onun bu əməli ilə ailəyə şər daxil olar. Peyğəmbər ﷺ belə qadına şiddətli əzab vəd edərək buyurmuşdur:

بقوله: ﷺ «أيما امرأة أدخلت على قومٍ رجلاً ليس منهم، فليست من الله في شيء ولا يدخلها الله الجنة» . رواه أبو داود في سننه والنسائي في سننه.

***"Hər hansı qadın yad kişini öz həyatına qatarsa, Allah taalanın yanında dəyərsiz olar və Allah taala onu cənnətə daxil etməz"[1].***

Ikinci: Ərinin olan uşaqdan şübhələnməsi. Belə halda ər həmin arvadla yaşamağa razılıq verər və bu da onun üçün nəfsi sıxıntılar yaradar. Nəticədə isə ya uşaqları, ya arvadı və yaxud da hamısını qətlə yetirər.

Yaxud da ər arvaddan ayrılmağa qərar verər və lənətləşərək ayrılarlar. Beləliklə ailə dağılar və həm qadın, həm də onun ailəsi camaat arasında biabır olarlar.

Üçüncü: Ərdə olmayan zinakar qadının hamilə qalaraq biabır olması. Belə qadın ya uşağı öldürərək haram qan axıdar və nahaq yerə adam öldürənlərin sırasında dayanar. Yaxud uşağı doğub atar və ya özü saxlayar. Hər iki halda həmin uşağın heç bir günahı olmayan bir işə görə qəlbi sınar və hamı tərəfindən ona sıxıntı gələr. Bu, şeytanın fitnəsinə düşərək edilmiş günahın nəticəsidir. Həmin uşaq buna görə əziyyət çəkəcək və ya pis tərbiyə olunduğuna görə o

---

[1] Əbu Davud: 2\ 695, 696\ № 2263. Nəsai: 6\ 490, 491\ № 3481.

da bu yolda olacaqdır. Yalnız Allah taalanın rəhməti və lütfü onu bu çirkin əməldən xilas də bilər.

3. Qadın ərsiz və qısır qalsa belə etdiyi zinanın ona mənfi təsiri və müxtəlif zərəri dəyəcəkdir. Buna misal:

a. Qadının qədir-qiyməti onun həyası və iffətindədir. Etdiyi fahişəlik və iyrənc əməli nəticəsində bunları itirən qadın kişilərin əlində oyuncaq, dəyərsiz və qiymətsiz olar, təhqirlərə məruz qalar. Həyatı çirkinlik və natəmizlik içərisində davam edər. Belə qadın Allah taalaya tövbə edə bilər, lakin bununla belə onun pis xatirəsi kişilərdə qalacaqdır.

b. Qadının zinakarlıq etməsi onun ailəsi üçün rüsvayçılıq və təhqirdir.

c. Qadınla əvvəllər zina etmiş kişilər sonralar onu narahat etməyə cəhd göstərər və yenidən onu istəmədiyi işə sürükləyərlər. Əvvəllər belə işlə məşğul olmuş, sonra Allaha tövbə etmiş, onun əvvəlki vəziyyətindən xəbərsiz olan bir kişiyə ərə getmiş neçə-neçə qadınların əvvəllər etdikləri pis əməllərinə görə ailələri dağılmışdır. Bu sirrin açılmasına səbəb onunla zina etmiş kişilərdir. Onlar həmin qadınları əvvəlki əməllərinə qaytarmaq üçün onun ailəsini dağıtmaq istəyərlər. Belə halda zinakar qadın iki yol ayrıcında qalar. Bu iki yolun ən şirini pisdir. Əgər şirini pisdirsə, gör onun digəri necədir!

4. Subay kişinin zina etməsi onun üçün müxtəlif təhlükələr yaradır. Buna misal:

a. Zina etdiyi qadının ailəsi tərəfindən ona qarşı olan təhlükə.

b. O, etdiyi pis əməlinə görə öz ailəsinə rüsvayçılıq gətirər və hamı belə insana qız verməkdən çəkinər.

c. Onun etdiyi bu zinadan qadının hamilə qalması. Bu onun üçün böyük biabırçılq və rüsvayçılıqdır.

d. Bu işlə məşğul olan kişilər zənnə və fikrə qapanarlar. O, pozğun qadınlardan gördüyü təcrübəyə əsasən öz namuslu və iffətli həyat

yoldaşından şübhələnər. Nəfsini boğan şübhələr ona əzab verər və hər ikisi sıxıntı içərisində yaşayarlar.

5. Cəmiyyətdə olan zinakarlıq kişilərin evlənməkdən yayınmasına səbəbdir. Bunun da bir çox zərərləri vardır:

a. Mehribançılıq və qohumluqdan məhrumiyyət. Çünki evlilik olmayan yerdə ailələrin arasında qohumluq əlaqələri də olmaz. Həmçinin subay qalan insanlar cəmiyyətlə çox az ünsiyyətdə olarlar. Heç kəslə danışmaz və heç kəs də onu danışdırmaz.

b. Nəslin və zürriyyətin kəsilməsi. Çünki zinakar qadın və kişilərin uşaq böyütməyə səbirləri çatmaz. Beləliklə cəmiyyətin üzvləri azalar.

c. Kişilərin evlilikdən üz döndərmələri çoxlu sayda qadınların dul qalmasına səbəb olur. Bu da cəmiyyətdə zinanın çoxalması və s. kimi pis nəticələr verir.

### Zinanın bədənə vurduğu zərərləri:

Zina, pis cinayət, qəbahətli əməldir. Bu əməlin əvəzində Allah taala dünya və axirət cəzası təyin etmişdir. Əslində zinakar çox vaxt məhvedici xəstəliklərdən qurtula bilmir. Bu Allah taala tərəfindən bir cəzadır. Zinanın həqiqətən bir sıra xəstəliklərə səbəb olması aşkarlanmışdır və bu xəstəliklərdən aşağıdakıları demək olar:

1. **SPID xəstəliyi:** Bu xəstəlik insanın bədənini zəiflədir və insan bədənində məhvedici xəstəliklərə şərait yaradır. Bu xəstəlik zina vasitəsi ilə kişidən qadına, qadından da kişiyə keçir.
2. **Sifilis *(yoluxucu zöhrəvi)* xəstəliyi:** Bu kişi və qadınların tənasül orqanlarına və digər orqanlarına düşən mikrobdur. Bu mikrobun bədənə düşməsi nəticəsində dəridə səpgilər əmələ gəlir və bədənin digər yerlərinə də yayılır. Bu xəstəlik dərinləşərək insanın sinir sisteminə təsir edə bilər.
3. Süzənək *(qonoreya)* xəstəliyi: Bu xəstəlik olan insanların tənasül orqanlarından orada baş vermiş iltihablar nəticəsində, irinli maye

axır. Bu həm kişilərə həm də qadınlara yoluxur. Bu xəstəlik dərinləşərək qatı yaralara çevrilər və insanı sonsuz edər.

Sadaladığımız bu xəstəliklər, bəlalar və zərərlərə görə Allah taala insana bir mərhəmət, dini, ictimai, nəfsi və bədəni sağlamlıq nəticəsi və nicat yolu kimi, bu əməli haram etmişdir.

**Üçüncü: Uşaqbazlıq etmək;**

Bu, kişinin kişi ilə cinsi əlaqədə olmasıdır. Bu ən çirkin fahişəlik, insanın fitrətinə zidd olan qəbahətli işdir. Bu, dinin, kişiliyin, əxlaqın, alicənablığın məhvi, eyni zamanda Allah taalanın qəzəbinə düçar olmaq deməkdir. Allah taala Lut peyğəmbərin *(Ona Allahın salamı olsun)* tayfasına başqa tayfalara vermədiyi bir əzab vermişdir. Bu haqda Allah taala buyurur:

﴿ فَلَمَّا جَآءَ أَمۡرُنَا جَعَلۡنَا عَـٰلِيَهَا سَافِلَهَا وَأَمۡطَرۡنَا عَلَيۡهَا حِجَارَةً مِّن سِجِّيلٍ مَّنضُودٍ ٨٢ ﴾ (هود:٨٢)

"***(Lut tayfasının məhvi barəsində)* əmrimiz gəldiyi zaman o yurdun altını üstünə çevirdik və üzərinə odda bişmiş *(bir-birinə bitişik)* bərk daşlar yağdırdıq." (Hud: 82).**

Allah taala, öz fitrətlərini dəyişdiklərinə görə, onları və onların diyarlarını alt-üst etmişdir. Bu əməlin böyük günah və Allahın qəzəbinə səbəb olan iş olması ilə yanaşı onun bir çox təhlükələri vardır:

1. Bu, sağlam fitrəti dəyişməkdir. Bu əməli yalnız fitrəti dəyişmiş və əxlaqı pozulmuş insan edər. O, təmizliyə və paklığa üz tutmaqdansa, gedib natəmizlik və alçaqlığa yönəlmişdir. Allah taala qadınları şəhvət hissini ödəmək, onunla nəsil artırmaq və yer üzündə həyat qurmaq üçün yaratmışdır. Uşaqbazlıq isə bunun əksi olaraq bunu məhv edir. Belə əməllərlə məşğul olanlara iblisin dediyi söz təsdiqdir. Allah taala iblis haqda buyurur:

﴿ وَلَأٓمُرَنَّهُمۡ فَلَيُغَيِّرُنَّ خَلۡقَ ٱللَّهِ ﴾ (النساء:١١٩)

"*(iblis dedi:)* **Onlara Allahın yaratdıqlarını dəyişdirməyi əmr edəcəyəm!" (ən-Nisa: 119).**

2. Uşaqbazlıq, edilən kişinin kişiliyini öldürür. O, cəmiyyət üçün xeyirli bir üzv, dininə xidmət edən şəxs olmaq əvəzinə, zəlil, alçaq, əxlaqsız və həyasız bir insana çevrilər. Allah taala bizləri belə çirkin əməllərdən qorusun...Amin!!!
3. Bu, uşaqbazlıq edən adamın insanlar tərəfindən təhqir olunmasına, ona nifrət edilməsinə və ondan iyrənilmələrinə səbəb olan əməldir. Belə işlərlə məşğul olan adam cəmiyyətdə qiymətsiz və dəyərsiz olarlar. Hamı onlardan qaçar və onlara alçaq gözlə baxar.
4. Uşaqbazlıq etmək spid xəstəliyinin əsas səbəblrindəndir. Bu günə qədər müalicəsi tapılmayan bu xəstəlik belə əməllərlə məşğul olanların axırına çıxır. Şəkk yoxdur ki, bu Allah taala tərəfindən şər insanlara qarşı bir cəzadır. Uşaqbaz öz şəhvətini haram və qəbahətli yolla ödədiyindən Allah taala onun cəzasını elə bu şəhvətin və pis əməlin özündə etmişdir. Bu xəstəliyə yoluxmuş adam əməlinin cəzası olaraq cəmiyyətdə qiymətsiz və dəyərsiz həyat sürər. Onun ölümü heç kəsi təəssüfləndirməz. Tibbi araşdırmalar nəticəsində məlum olmuşdur ki, bu xəstəliyə yoluxanların 95 % -i kişilərdir. 25-45 yaş arasında olanların 75-80 %-i uşaqbazlıqla məşğul olanlar, 17%-i isə narkotik maddələr qəbul edənlər təşkil edir. Beynəlxalq sağlamlıq mərkəzinin araşdırmalarına görə spid vəbası 2000-ci ildə yalnız Afrikada təxminən 1.800.000. adamın məhvinə səbəb olmuşdur. Həmçinin bu xəstəliyin ilkin yayılmasından 2000-ci ilə qədər vaxtda 11.000.000 adam həlak olmuşdur. İndi isə bu ədəd ikiqat artmış və 22.000.000-na çatmışdır.

**Dördüncü: Açıq-saçıqlıq:** bu, qadının öz zinət yerlərini açması və camaat arasında belə dolaşmasıdır.

Məlumdur ki, Allah taala qadına öz zinətini yad kişilərə göstərməsini haram etmiş və buyurmuşdur:

﴿ وَلَا يُبۡدِينَ زِينَتَهُنَّ إِلَّا لِبُعُولَتِهِنَّ أَوۡ ءَابَآئِهِنَّ.......﴾ (النور:٣١)

**"Zinət yerlərini ərlərindən, yaxud öz atalarından ..... başqasına göstərməsinlər;..." (ən-Nur: 31).**

﴿ وَلَا تَبَرَّجۡنَ تَبَرُّجَ ٱلۡجَٰهِلِيَّةِ ٱلۡأُولَىٰ ﴾ (الأحزاب:٣٣)

**"İlkin Cahiliyyət dövründəki kimi açıq-saçıq olmayın.** ***(Bər-bəzəyinizi taxaraq evdən çıxıb özünüzü, gözəlliyinizi yad kişilərə göstərməyin!)*** **" (əl-Əhzab: 33).**

Açıq-saçıqlıq aşağıda deyilənlərə əsasən təhlükə və zərər olduğuna görə haram edilmişdir:

1. Açıq-saçıq geyinib bəzənmək kişiləri məftun edir. Kişinin məftun olması ona ziyandır. Bu, ac insana yemək göstərmək, sonra isə ona həmin yeməyi verməməyə bənzəyir. Həmçinin bəzənmiş və açıq-saçıq geyinmiş qadını görən kişi o qadına bağlanar, amma əli ona çatmaz. Bu da kişinin dininə, nəfsinə və düşüncələrinə ziyandır. Qadının hicab bağlaması isə kişi üçün salamatlıq və rahatlıqdır.
2. Açıq-saçıq geyinən qadın özü hiss etməsə də kişilərə “gəl” deyir. Onun belə geyinməsi namus və şərəfinə təcavüz olunmağa səbəbdir.
3. Açıq-saçıqlıq müsəlman qadından tələb olunan iffətə ziddir. Çünki açıq-saçıqlığın, öz gözəlliyini yad kişilərə nümayiş etdirməkdən, gözəl üzünü və qəddi-qamətini onlara göstərməkdən başqa heç bir məqsədi yoxdur.
4. Açıq-saçıqlıq zinaya səbəb olan əsas amildir. Yuxarıda zinanın təhlükəsi və böyük günah olması haqda söz açmışdıq. Açıq-saçıqlıq isə ona aparan yoldur. Hansı qadın zinadan qurtulmaq və iffətli

qalmaq istəyirsə, açıq-saçıq geyinməsin. Peyğəmbər ﷺ öz kəlamlarının birində açıq-saçıqlığı zina adlandıraraq buyurmuşdur:

«إذا خرجت المرأة متعطرة فهي زانية» رواه أبو داود في سننه والترمذي في سننه والنسائي في سننه، وقال الترمذي: حديث حسن صحيح.

***"Öz evindən ətirlənib çıxan qadın - zinakardır"[1].***

Onun bu əməlinə görə Peyğəmbər ﷺ ona zinakar demişdir. Çünki belə halda qadın ya zinakar qadınların etdikləri kimi, kişiləri özünə baxmağa çağırır, yaxud da bu əməlinə görə zinaya düşə bilər. Hamıya məlumdur ki, qadın yad kişilər tərəfindən daima istək mənbəyidir. Ona görə də qadının evindən bəzənib açıq-saçıq çıxdıqda qəlbləri xəstə olan kişilərin onlarla iki vəziyyəti ola bilər:

Birinci vəziyyət: Həmin yad kişi ona baxmaqdan ləzzət alar və şəhvətini bacardığı bu yolla ödəyər.

Ikinci vəziyyət: Yaxud bundan daha artığını, zina etmək və ya əl ilə toxunmaq üçün səy göstərməsi. Heç iffətli qadın razı olarmı ki, yad kişilərin ona baxaraq öz şəhvətlərini ödəmələri üçün mənbə olsun? Iffətli müsəlman qadın belə əməllərdə diqqətli olmalıdır.

**Beşinci: Yad kişi və qadınların ünsiyyəti:**

Yad kişi və qadınların ünsiyyətdə olmaları kafirlərin həyat tərzidir. İslam isə kişilərin həyatını ayrı, qadınların da həyatını tam ayrı etmişdir. Qadınların həyatına yalnız bəzi yollar vasitəsi ilə daxil olmaq mümkündür. Bu yollar: Məhrəm sayılan qohumluq, kürəkənlik və ya evlilikdir. İslam şəriəti, başqa yol ilə qadınların həyatına müdaxilə etməyi haram etmişdir. Yalnız zəruriyyət və məcburiyyət hallarını müstəsna etmişdir. Peyğəmbər ﷺ buyurmuşdur:

---

[1] Əbu Davud: 4\ 400, 401\ № 4173. Tirmizi: 5\ 98, 99\ № 2786. Nəsai: 8\ 532\ № 5141. Titmizi hədisin həsənun səhih olduğunu demişdir.

«لا يخلونَّ رجل بامرأة إلا مع ذي محرم» رواه البخاري في صحيحه ومسلم

***"Yad kişi və qadının tənha qalması üçün onların yanlarında mütləq (qadının) məhrəmlərindən olmalıdır"[1]***

«ما خلا رجل بامرأة إلا كان الشيطان ثالثهما» رواه الترمذي في سننه معلقا .

***"Yad kişi ilə qadın ikisi tənha qalarlarsa şeytan onların üçüncüsü olar"[2].***

İslam yad kişi və qadınların ünsiyyətini müəyyən səbəblərə görə haram etmişdir və bu səbəblərdən aşağıdakıları demək olar:

1. Allah taala zinanı haram etmişdir. Ona görə də zinaya aparan yolların bağlanması hikmət və mərhəmətdəndir. Yad kişi və qadınların ünsiyyəti zina üçün açıq-aşkar bir şəraitdir.
2. Yad kişi və qadınların ünsiyyəti qurulmuş evləri dağıdır. Çünki bu ünsiyyət vasitəsi ilə qadın digər kişidən daha çox xoşlanarsa, ona yetişmək üçün ailəsinin dağılmasına da razı olar. Əgər bu qadın subay olarsa, bu onun üçün evlənənə qədər zinaya düşmək təhlükəsidir.
3. Yad kişi və qadınların ünsiyyətdə olması hər ikisinin şəhvətlərini oyadır. Onlar öz gözəlliklərini bir-birlərinə nümayiş etdirərlər. Bununla onların hər ikisi əqli, əməli və maddi qüvvələrinin çoxusunu itirərlər. Onların işi-gücü birinin digərinin diqqətini çəkmək olar.

Əl-Musavvir qəzeti 30.05.1956-cı il tarixli nəşrində Misir universitetinin tələbələri ilə apardıqları sorğunun nəticəsini qeyd etmişdilər. Onların 65 %-i deyir: digər cins haqda fikirləşmək bizim tədrisimizə mənfi təsir göstərir. Beləliklə də bizim istirahət vaxtımızın dörddə üç hissəsi məhəbbət axtarışına sərf olunur.

[1] Buxari: 9\ 330, 331\ № 5233. Müslim: 2\ 978\ № 1342.
[2] Tirmizi: 3\ 474\ № 1171.

**Altıncı: Sələm:**

Sələmin lüğəti mənası artmaq və çoxalmaqdır. Istilahi mənası isə: Alış-veriş olmadan malın əvəzsiz yerə çoxalması. Sələmin iki növü vardır:

**Fəzl sələmi:** o, eyni cinsdən olan malların birini digəri ilə alıb-satmaqdır. Məsələn: qızıl ilə qızılı, gümüş ilə gümüşü, xurma ilə xurmanı və s.

**Nəsiə sələmi:** o, borcun üzərinə əlavə gətirməkdir. Bu iki növ, sələmin daha geniş yayılmış növləridir. Allah taala bu iki növü qətiyyətlə haram edərək buyurur:

﴿ ٱلَّذِينَ يَأۡكُلُونَ ٱلرِّبَوٰاْ لَا يَقُومُونَ إِلَّا كَمَا يَقُومُ ٱلَّذِي يَتَخَبَّطُهُ ٱلشَّيۡطَٰنُ مِنَ ٱلۡمَسِّۚ ذَٰلِكَ بِأَنَّهُمۡ قَالُوٓاْ إِنَّمَا ٱلۡبَيۡعُ مِثۡلُ ٱلرِّبَوٰاْۗ وَأَحَلَّ ٱللَّهُ ٱلۡبَيۡعَ وَحَرَّمَ ٱلرِّبَوٰاْۚ فَمَن جَآءَهُۥ مَوۡعِظَةٞ مِّن رَّبِّهِۦ فَٱنتَهَىٰ فَلَهُۥ مَا سَلَفَ وَأَمۡرُهُۥٓ إِلَى ٱللَّهِۖ وَمَنۡ عَادَ فَأُوْلَٰٓئِكَ أَصۡحَٰبُ ٱلنَّارِۖ هُمۡ فِيهَا خَٰلِدُونَ ٢٧٥ ﴾ (البقرة:٢٧٥)

**"Sələm *(müamilə, faiz)* yeyənlər *(qiyamət günü)* qəbirlərindən ancaq Şeytan toxunmuş *(cin vurmuş dəli)* kimi qalxarlar. Bunların belə olmaları: "Alış-veriş də sələm kimi bir şeydir!" – dedikləri üzündəndir. Halbuki, Allah alış-verişi halal, sələm *(faiz)* almağı isə haram *(qadağan)* etmişdir. İndi hər kəs Rəbbi tərəfindən gələn nəsihəti qəbul etməklə *(bu işə)* son qoyarsa, keçmişdə aldığı *(sələmlər)* onundur *(ona bağışlanar)*. Onun işi Allaha aiddir. Amma *(yenidən sələmçiliyə)* qayıdanlar cəhənnəmlikdirlər və orada həmişəlik qalacaqlar!" (əl-Bəqərə: 275).**

﴿ يَٰٓأَيُّهَا ٱلَّذِينَ ءَامَنُواْ ٱتَّقُواْ ٱللَّهَ وَذَرُواْ مَا بَقِيَ مِنَ ٱلرِّبَوٰٓاْ إِن كُنتُم مُّؤۡمِنِينَ ٢٧٨ فَإِن لَّمۡ تَفۡعَلُواْ فَأۡذَنُواْ بِحَرۡبٖ مِّنَ ٱللَّهِ وَرَسُولِهِۦۖ وَإِن تُبۡتُمۡ فَلَكُمۡ رُءُوسُ أَمۡوَٰلِكُمۡ لَا تَظۡلِمُونَ وَلَا تُظۡلَمُونَ ٢٧٩ ﴾ (البقرة:٢٧٨-٢٧٩)

**"Ey möminlər! Əgər, doğrudan da, iman gətirmişsinizsə, Allahdan qorxub sələmdən qalan məbləğdən (faizdən) vaz keçin! (Onu borclulardan almayın!) Əgər belə etməsəniz, o zaman Allaha və Onun Peyğəmbərinə (ona Allahın salavatı və salamı olsun!) qarşı müharibəyə girişdiyinizi bilin! Yox, əgər tövbə etsəniz, sərmayəniz (mayanız) sizindir. Beləliklə, nə siz zülm edərsiniz, nə də sizə zülm olunar!" (əl-Bəqərə: 278, 279).**

Cabir Ibn Abdullahın hədisində deyilir:

«لعن رسول الله ﷺ آكل الربا وموكله وكاتبه وشاهديه وقال: هم سواء». رواه مسلم.

Peyğəmbər ﷺ: *"sələm yeyəni (alanı), onu yedizdirəni, yazanı və ona şahidlik edənləri lənətləyərək demişdir: onların hamısı bu günahda eynidirlər"*[1].

Əbu Hureyrənin hədisində Peyğəmbərin ﷺ belə dediyi rəvayət olunur:

عن النبي ﷺ قال: «اجتنبوا السبع الموبقات قالوا: وما هن يا رسول الله قال: الشرك بالله والسحر وقتل النفس التي حرم الله إلا بالحق وأكل الربا ». أخرجه البخاري في صحيحه ومسلم.

***"Yeddi böyük günahdan çəkinin! Dedilər: Ey Allahın Elçisi, onlar hansılardır? O, dedi: "Allah taalaya şərik qoşmaq, sehr, Allahın haram etdiyi canı haqsız yerə öldürmək, sələm yemək ..."[2].***

---

[1] Müslim: 3\ 1219\ № 1598.
[2] Buxari: 5\ 293\ № 2766. Müslim: 1\ 92\ № 89.

Sələmçilik bütün dünyada geniş yayılmışdır. Bütün banklar, hətta beynəlxalq maddi əlaqələrin bünövrəsi sələm üzərində qurulmuşdur. Bunu qərarlaşdıran varlı dövlətlərdir. Onların nümunəsi bir ölkədə mövcud olan varlı tacirdir. Insanların ona olan ehtiyacını bilərək, o tacir öz qanunlarını orada hakim edir ki, onun var-dövləti, səltənəti həmişəlik olsun və o heç bir halda ziyan görməsin.

Dünyada mövcud vəziyyətin gerçəkliyi də belədir. Çünki varlı yəhudi və xaçpərəst ölkələri öz dövlətlərinin daima varlı yaşaması və digərlərinin onlara möhtac olması üçün sələmçilik qayda-qanununu bütün dünyaya yaymışlar.

Allah taala sələmi qəti olaraq haram etmişdir və bütün müsəlmanlar sələmin haram olmasını yekdilliklə təsdiq edirlər. Allah taala yalnız insana zərər olan şeyləri haram etmişdir. Lakin şeytan və maddi maraqları olanlar pis işi insanların gözündə gözəlləşdirər və onun adını dəyişmək və guya faydalı olduğunu iddia etməklə onu insanlara sırıyırlar. Spirtli içkiləri və narkotik maddələri satanlar da belə iddialar edirlər. Amma həqiqətdə isə bunun zərərindən başqa bir nəticəsi yoxdur.

Sələmin bir çox zərərləri vardır və bunlardan aşağıdakıları sadalamaq olar:

1. Allaha və Onun Peyğəmbərinə ﷺ qarşı şavaşa çıxmaq. Sələmçiliklə məşğul olan adam bacarmadığı bir savaşa girişmişdir. Bu savaş, Allah taala və Onun Peyğəmbərinə ﷺ qarşıdır. Bu da Allahın qəzəbinə düçar olmaq deməkdir. Allaha və Peyğəmbərinə ﷺ qarşı savaşa səbəb olan əməlləri edən adamdan bir gün intiqam alınacaq, bildiyi və bilmədiyi yerdən ona qəm-kədər gələcəkdir. Dünyada zahirən bu intiqamdan canını qurtaran adamı qarşıda çətin imtahan, şiddətli əzab gözləyir. O, gün peşmançılığın və üzrxahlığın heç bir faydası olmayacaqdır.

2. Sələmçiliyin ümməti məhv etmə təhlükəsi vardır və bunlardan aşağıdakıları demək olar:

a. Sələmçilik edən adam daş qəlbli, paxıl, pis fürsətlərdən istifadə edəndir. Çünki o, borc alan adamın kəskin ehtiyacını bilib onu sıxışdırır. Ehtiyaclı adam həmin pulla kiməsə kömək etmək istəyir, yaxud ticarət işi ilə məşğul olmaq və ruzi qazanmaq istəyir. Lakin onun çəkdiyi əziyyətləri sələm sorur, borcunu artırır hətta sərmayəsini *(mayasını)* də yeməyə məcbur edir.

b. Sələmlə borc alan adam qəm-qüssə içərisində olur. Bu fikir onun canını sıxır, gecəsi ilə gündüzünü ayıra bilmir. Bəzi hallarda bu ölümlə də nəticələnə bilir.

c. Sələmçilik baş alıb gedən cəmiyyətdə mərhəmət, məhəbbət, ülfət və birlik mənasız sözlərə çevrilər. Əksinə intiqam almaq, tamahkarlıq, fürsətdən istifadə etmək və əlaqələri kəsmək kimi pis əxlaq hökm sürər. Çünki sələmçilik varlıların kasıb insanların maddi ehtiyaclarından sui-istifadə etməsidir. Varlılar istəyərlər ki, sələmə verdiyi mal çoxalsın və ondan istifadə etsin. Bu isə həmin cəmiyyətin zərər çəkməsi və insanların kasıb yaşaması deməkdir.

d. Sərmayənin müəyyən insanların, sələmçilərin əlində cəmlənməsi. Sələmçinin malı heç vaxt itmir. Çünki o, sələmə verdiyi malın gəlirini əvvəlcədən təyin edir. Beləliklə, mal-dövlət müəyyən təbəqəyə malik insanların əlində cəmlənir. Onlar da insanları istədikləri kimi öz məqsədləri üçün istifadə etməyə şərait yaradırlar. Bu fərdi və beynəlxalq şəkildə olur. Bəzi dövlətləri varlı sələmçi insanlar idarə edirlər. Böyük və varlı dövlətlər də kasıb dövlətləri sələmçilik yolu ilə idarə edirlər. Çünki kasıb dövlət ona borclu və möhtacdır.

e. Sələmçiliyə görə istehsalat azalır. Çünki sələmçilik ilə qazanmaq heç bir xərc tələb etmir. Həmçinin malı uduzmaq təhlükəsi də yoxdur. Insanlar sələmlə qazanmaq üçün mal-dövlətini banklarda yatırırlar. Onlar bu məbləği qazanmaqda heç də əziyyət çəkmirlər.

f. Sələmçilik qiymətlərin artmasına təsir edir. Çünki sələm pul ilə iş yeri açmış istehsalçı borcunun faizini qarşılamaq üçün malın qiymətini artırır. Sələmin faizi isə dayanmır. Qərb dövlətlərinin qarşısına çıxan problem də budur. Onlar bunu inflyasiya adlandırırlar.
g. Sələm böyük şirkətlərin və zavodların dağılmasına səbəb olur. Çünki şirkətlər öz işlərini qurmaq üçün banklardan sələm *(faiz)* alırlar. Bu sələm mürəkkəb borc sayılır. Belə şirkətlərin sərmayəsi az olduğundan banklardan borc alırlar və nəticədə şirkətin bir hissəsi sahibinin digər qalan hissəsi isə bankın olur. Hansısa səbəbə görə ziyana uğrayan şirkət iflas olduğunu elan edir. Çünki pul ödənişi gecikdikcə borc çoxalır. Həmin borcların çoxalmasını görüb ödəməyə aciz olan şirkət müflis olduğunu deyir. Belə halda həmin şirkəti bank borcun əvəzində ala bilir.
h. Sələm dövlətlərin dağılmasına və ya onların arasında ayrıseçkiliyə səbəb olur. Inkişaf etməkdə olan borclu dövlətlər istehsalatının güclü olmasına baxmayaraq heç vaxt öz xalqının güzəranını yaxşılaşdıra bilmir. Çünki onun gəlirlərinin iki axını vardır:

**Birinci axın** dövlətin və camaatın zəruri ehtiyaclarını qarşılamaq.

**Ikinci axın** isə şişməkdə və çoxalmaqda olan borcları ödəmək. Çünki ödəniş gecikdikcə borc da çoxalır. Ona görə də dövlət həmişə borc ödəmək məcburiyyətində qalır. Bu borcu örtmək üçün vergiləri artırmağa, pul vahidini və xidmətləri ucuzlaşdırmağa, istehsal olunan məhsulların qiymətini yüksəltməyə məcbur olur. Borcu verən sərt ürəkli, çox güclü, hiyləgər və pis təbiətlidir. Ona görə də kasıb dövlətlərin daha da kasıblaşmasının, varlı dövlətlərin daha da varlanmasının şahidi oluruq.

Bu və digər zərərlərə görə bir çox şirkətlərin iflasa uğradığını, bir çox dövlətlərin borc içərisində boğulmasını görürük. Bütün

bunlara görə Allah taala sələmçiliyi haram etmişdir. Bəndə bunları bildikdən sonra Allah taalanın ona olan mərhəməti və lütfünü dərk edir. Çünki Allah taala Öz bəndələrinə sələmçiliyi haram etmişdir. Sələm yeyən adam insanların qanını sormaqdan və mallarını yeməkdən doymayandır. Belə insan rəhm etməyən daş qəlbli insandır. Buradan görünür ki, sələmin haram edilməsi İslam dininin böyük gözəlliklərindən və hədsiz mərhəmətindəndir.

**Yeddinci: Sərxoşedici maddələr;**

O, ağlı sərxoş edən və örtən, yemək, içmək, narkotiklər kimi qoxu və iynə yolu ilə qəbul edilən hər bir maddədir.

Sərxoşedici maddələr bütün pisliklərin anasıdır. Allah taala Qurani Kərimdə onu haram edərək buyurur:

﴿ يَٰٓأَيُّهَا ٱلَّذِينَ ءَامَنُوٓاْ إِنَّمَا ٱلۡخَمۡرُ وَٱلۡمَيۡسِرُ وَٱلۡأَنصَابُ وَٱلۡأَزۡلَٰمُ رِجۡسٞ مِّنۡ عَمَلِ ٱلشَّيۡطَٰنِ فَٱجۡتَنِبُوهُ لَعَلَّكُمۡ تُفۡلِحُونَ ٩٠ ﴾ (المائدة:٩٠)

**"Ey iman gətirənlər! Şərab da** *(sərxoşedicilər də)*, **qumar da, bütlər də, fal oxları da Şeytan əməlindən olan murdar bir şeydir. Bunlardan çəkinin ki, bəlkə, nicat tapasınız!" (əl-Maidə: 90).**

Peyğəmbər ﷺ hədislərin birində buyurur:

«ما أسكر كثيره فقليله حرام» رواه أبو داود في سننه والترمذي في سننه وابن ماجة، وهو حديث صحيح.

***"Çox miqdarı sərxoş edənin (maddənin və s.) azı da haramdır"***[1]***.***

Sərxoşedici təhlükəli dərdlərdəndir. Onun dini, maddi, cismani və s. zərərləri vardır. Bunlardan aşağıdakıları göstərmək olar:

---

[1] Əbu Davud: 4\ 87\ № 3681. Tirmizi: 4\ 258\ № 1865. Ibn Macə: 2\1125\ № 3393. Hədis səhihdir.

**Birinci: Dini zərərləri;**

1. Bu işlərlə məşğul olanlar Allah taaladan uzaqdırlar. Onlar Allahın qəzəbinə düşmüş insanlardır. Peyğəmbər ﷺ buyurur:

قال عليه الصلاة والسلام «لا يزني الزاني حين يزني وهو مؤمن، ولا يشرب الخمر حين يشربها وهو مؤمن، ولا يسرق السارق حين يسرق وهو مؤمن» سبق تخريجه.

***"Zinakar zina etdiyi zaman mömindir, şərab (sərxoşedici) içən onu içdiyi zaman mömindir, oğurluq edən onu etdiyi vaxt mömindir (yəni, qəlbində olan iman tam silinmir)"[1].***

قال عليه الصلاة والسلام «من مات وهو يشرب الخمر كان حقاً على الله أن يسقيه من طينة الخبال عصارة أهل النار» رواه مسلم

***"Kim şərab (sərxoşedici) içərək ölərsə, Allah taala ona cəhənnəm sakinlərinin içkisi olan irin içirdər"[2].***

2. O, namaz qılmağa mane olur. Çünki şərab içən adam ağlını itirmiş və yaxud zehni zəifləmiş olur və onun belə halda namaz qılması doğru deyildir. Əslində onun ağlı bunu qavramır. Bu haqda Allah taala buyurur:

﴿ يَٰٓأَيُّهَا ٱلَّذِينَ ءَامَنُواْ لَا تَقْرَبُواْ ٱلصَّلَوٰةَ وَأَنتُمْ سُكَٰرَىٰ حَتَّىٰ تَعْلَمُواْ مَا تَقُولُونَ ﴾ (النساء:٤٣)

**"Ey iman gətirənlər! Sərxoş ikən nə dediyinizi anlamayana qədər namaza *(namaz qılınan yerə)* yaxınlaşmayın..." (ən-Nisa: 43).**

**Ikinci: Maddi zərərləri;**

---

[1] Buxari: 5\ 119\ № 2475. Müslim: 1\ 76-77\ № 57.
[2] Müslim: 3\ 1587\ № 2002.

Içki və ya hər-hansı sərxoşedici maddə faydalı qidalardan deyildir. O pis və şər məhsul sayılır. Ona pul xərcləmək malını havaya sovurmaq və israfçılıqdır.

**Üçüncü: Cismani zərərləri;**

Əvvəldə dediyimiz kimi, şərab bir dərd və zəhərdir. Onu qəbul etmək bir çox cismani, əqli və ruhi xəstəliklərə səbəb olur. Belə xəstəliklərdən aşağıdakıları demək olar:

1. Sərxoşediçi maddə böyrəkləri tələf edir. Içki içən adamların böyrəkləri içməyənlərə nisbətən daha böyük olur. Bu nisbət (6\1 və ya 8\1) kimi ölçülür. Həmçinin içki qanın tərkibində xolestirolun çoxalmasına səbəb olur. Onun həmçinin beyinə və sinir sisteminə göstərdiyi mənfi təsir açıq-aşkar görünür. Onu içən öz hərəkətlərini və danışığını idarə edə bilmir. Kim içkini uzun müddət çox içərsə, onun əzaları öz tarazlığını itirər və bu onun üçün davamlı xəstəliyə çevrilər. Nəticədə tarazlığını və sərbəst nitq qabiliyyətini itirər və s. kimi xəstəliklərə düçar olar. Bəzi tədqiqatlar göstərir ki, Avropa xəstəxanalarında hər üç çarpayıdan birində içkiyə görə xəstəliyə düşənlər yatırlar. Yəni, xəstələrin 3\1 hissəsi alkaqoldan xəstələniblər. Həmçinin ağlını itirmiş xəstələrin yarısını alkaqoliklər təşkil edir. Kaliforniya universitetinin tibbi elmi araşdırmalar mərkəzinin verdiyi məlumata görə ABŞ-ın ştatlarında içki *(sərxişedicilər)* siqaretdən sonra ikinci qatil sayılır. Uyuşdurucu maddələr hər il 100.000. adamın ölümünə səbəb olur. Həmçinin yol qəza hadisələrinin yarısı da içkiyə *(sərxoşediciyə)* görədir.

Britaniyada çap olunan Lafest jurnalı yazır: “Hər il Britaniyada 200.000. adam sərxoşedicələrdən ölür. Içkidən dəymiş tibbi xəsarətlər hər il 1.000.000. cüneyhə bərabərdir. Ümumiyyətlə sərxoşedicilərdən istifadə zamanı dəyən xəsarətin bir illik zərəri isə 20.000.000. cüneyh miqdarındadır.

**Dördüncü: Ictimaiyyətə və əmin-əmanlığa dəyən ziyanları;**

Içki, insanın əlindən onu digər canlılardan fərqləndirən ağılı alır. Insan içkini içdikdə onun ağlı qapanır və etdiyi hərəkətlərin qaydasını itirir. Onun nə ağlı, nə də hissiyyatı qalır. Ona görə də içki boşanmalara, ailəyə və uşaqlara əziyyət verməyə əsas olan amillərdəndir. Belə insan özü də bilmədən ailəsini döyər, onlara xətər yetirər. Onun ağlı başında olmadığına görə etdiyi hərəkətlərin fərqinə varmaz. Həmçinin içki müxtəlif cinayətlərin səbəbkarıdır. Bəziləri sərxoş olarkən öz ailəsini və uşaqlarını öldürmək həddinə gəlib çatır. Belə halda hətta özünü də öldürə bilər. Çünki içki onun ağlını əlindən almışdır.

Içkili adam öz ailəsini ruhi xəstəliklərə doğru sürükləyir. O, içkili olduğu halda övladlarının onunla davranışları onlara mənfi təsir göstərir.

"Safe Food" kitabında deyilir: Britaniyada baş verən cinayətlərin yarısını sərxoşlar edir. Yol qəza hadisələrinin 3\1, uşaqlara qarşı zorakılıq hallarının 5\1, ev hadisələrində ölənlərin və 3\1 yanğınlarda ölənlərin yarı hissəsi içkiyə görə baş verir. Bu lənətlənmiş içki nə qədər bədbəxtçiliklərə səbəb olmuş, nə qədər mal-dövləti tələf etmişdir!

**Beşinci: Iqtisadi zərərləri;**

Içkinin iqtisadiyyata da mənfi təsiri vardır. Şərab zavodlarının sahibkarları içkinin satışından faydalansalar da, digər orqanlar: səhiyyə, ümumi və xüsusi yardım mərkəzləri, sığorta şirkətləri, fərdlər və s. hamı bundan zərər çəkir. Onlar, içkinin verdiyi ziyanların qarşısını almaq üçün külli miqdarda pul xərcləyirlər. Həmçinin bu səbəblə zərər çəkənlərə də çox zərər dəyir. Britaniyada nəşr olunan jurnalların birində deyilir: Içkidən dəyən birillik tibbi ziyan 640.000.000. funt-sterlinqə bərabərdir. Ümumən sərxoşedicilərdən dəyən birillik ziyan isə 20.000.000. funt-sterlinqə bərabərdir.

Amerikanın təbabəti haqda yazılan kitabların birində deyilir: Sərxoşedicilərdən Səhiyyəyə dəyən illik ziyan 136.000.000. dollardır.

Içkiyə görə istehsalın azalması nəticəsində Amerikanın iqtisadiyyatına ildə 71.000.000. dollar zərər dəyir.

Bu, murdar içkinin dünya xalqlarına vurduğu ziyandır. Ağıllı insan dərk edir ki, hikmət və elm Sahibi olan Allah içkini öz məxluqatına mərhəmət olaraq haram etmişdir.

**Səkkizinci: Qumar;**

O, hər bir oyun və ya müsabiqədə təyin edilmiş qazancdır. Allah taala onu bu kəlamları ilə haram etmişdir:

﴿ يَٰٓأَيُّهَا ٱلَّذِينَ ءَامَنُوٓاْ إِنَّمَا ٱلۡخَمۡرُ وَٱلۡمَيۡسِرُ وَٱلۡأَنصَابُ وَٱلۡأَزۡلَٰمُ رِجۡسٞ مِّنۡ عَمَلِ ٱلشَّيۡطَٰنِ فَٱجۡتَنِبُوهُ لَعَلَّكُمۡ تُفۡلِحُونَ ﴿٩٠﴾ إِنَّمَا يُرِيدُ ٱلشَّيۡطَٰنُ أَن يُوقِعَ بَيۡنَكُمُ ٱلۡعَدَٰوَةَ وَٱلۡبَغۡضَآءَ فِي ٱلۡخَمۡرِ وَٱلۡمَيۡسِرِ وَيَصُدَّكُمۡ عَن ذِكۡرِ ٱللَّهِ وَعَنِ ٱلصَّلَوٰةِۖ فَهَلۡ أَنتُم مُّنتَهُونَ ﴿٩١﴾ ﴾ (المائدة: ٩٠-٩١)

**"Ey iman gətirənlər! Şərab da *(içki də)*, qumar da, bütlər də, fal oxları da şeytan əməlindən olan murdar bir şeydir. Bunlardan çəkinin ki, bəlkə, nicat tapasınız! Şübhəsiz ki, şeytan içki və qumarla aranıza ədavət və kin salmaqla sizi zikr etməkdən və namaz qılmaqdan ayırmaq istər. Artıq bu işə son qoyacaqsınızmı?" (əl-Maidə: 90, 91).**

Qumarın zərərləri çoxdur. Onlardan bəzilərini sadalayaq:

1. O, insanı Uca Allahı zikr etməkdən yayındırır. Bu haqda keçən ayədə buyurulmuşdur ki, qumar oynayan adam oyuna pul qoyduğu üçün həmin oyunda ya udar, ya da uduzar. Ona görə də bütün fikrini və diqqətini oyuna cəmləşdirdiyi üçün namaz və s. ibadətlər yadından çıxar.
2. O, insanlar arasında kin-küdurətə və düşmənçiliyə səbəb olur. Çünki qumara pul qoyub uduzmuş adam udana paxıllıq və

düşmənçilik edir. Bu hətta onu öldürmək dərəcəsinə də gətirə bilər. O, uduzduğunu düşündükcə həmin adama düşmənçiliyi daha da artar.

3. O, evləri dağıdır, varlıları zəlil, kasıb, hətta dilənçi də edir. Çox varlıların qumarda var-dövlətini uduzduğunun şahidi oluruq. Uduzmaq azmış kimi, hələ onlara borclu qalanlar da olur. Qumarbazlar onun izinə düşərək ondan qalan borclarını da istəyərlər. Belələri haqda gündəlik qəzetlərdə çox yazılır. Belə halda onları dilənçi, ondan-bundan pul istəyən kimi də görmək mümkündür. Allah taalaya, bizi belə pis əməllərdən qoruduğuna görə şükr edirik!

4. Qumarbazın arvadı, uşaqları və ailəsi ən pis güzəranlı və bədbəxt ailədir. Çünki qumarbaz evində olanların hamısını qumara qoyar və ailəsini bədbəxt edər. Onların gözləri önündə mallarını əllərindən alıb faydasız bir oyuna xərclədiyini görərlər.

5. Qumarbazın qan təzyiqi yüksələr, qəlbi xəstəliklərə düçar olar. Hisslərini boğaraq, öz malını qorumaq, digər qumarbazın malını udmaq arzusu ilə gecələri oyaq qalmaq onun üçün bir xəstəlikdir. Çünki bütün bu əziyyətlərdən sonra uduzarsa bu qəlb xəstəliyi və ya qan laxtalanmasına səbəb ola bilər. Hətta yaşlı qumarbazların çoxu, oyun vaxtı səhhətlərini yoxlamaq üçün özləri ilə həkim də gətirirlər. Buna baxmayaraq onların əksəriyyəti həyatını qumar masası arxasında itirirlər. Bunu hamı bilir və hamıya məlumdur. Bəziləri oyundan sonra özlərini intihar edirlər. Avstraliyanın Melburn şəhərində qumar oynamaq üçün məşhur yer vardır. Bu yerin yaxınlığında dənizin üzərindən keçən böyük bir körpü vardır. Bir neçə etibarlı adam mənə deyib ki, qumarda uduzanların çoxu buraya gəlib intihar edirlər. Allah taala bizi belə əməllərdən saxlasın! Belə pis nəticəsi olan işin, nəyi gözəldir?!

6. Qumar iqtisadiyyatı məhv edir və istehsalatı zəiflədir. Çünki qumarda istehsalsız qazanc vardır. Bu nə sənayedir, nə də əkinçilik. Bu baxımdan da iqtisadiyyata zərər dəyir.
7. Qumar, qumarbazı şirnikləndirir və o, son ana qədər ya udmağa ya da uduzmağa məcbur olur. Bu gün udan, mütləq sabah uduzacaqdır. Hətta bəzi Avropa dövlətlərində qumara olan şirnikləndirici həvəsi müalicə etmək üçün xəstəxanalar da açılmışdır.

Deyilən bu haram və iyrənc əməllər və onların sadalanan zərərləri, İslamın onları haram etdiyinə görə bizə onun gözəlliyini və mükəmməlliyini göstərir. Allah taala bu əməlləri bəndələrinə mərhəmət olaraq, dünya xoşbəxtliyi və daimi axirət səadətinə qovuşmaq üçün, haram etmişdir.

Allah taala hər bir şeyi onun pisliyi və zərərinə görə haram etmişdir. Lakin belə məqamda bunların hamısını xatırlatmaq mümkün deyildir. Deyilənlərdə ağıl sahibləri üçün kifayət qədər xəbərdarlıq vardır. Allah taala istədiyinə hidayət verər və ona doğru yolu bəxş edər.

# Beşinci fəsil: İslamın, cinayətlərə qarşı təyin etdiyi cəza tədbirlərində gözəllikləri:

Heç şübhəsiz ki, İslam şəriətinin qoyduğu qayda-qanunlar özündə hikmət və özəlliklərə malikdir. Bu qanunlar insanlar üçün faydalıdır. Bunu hamı və ya müəyyən adamlar yaxşı bilirlər. İslam şəriətinin əmr etdiyi hər bir işi ağıl və dərrakə ilə araşdırdıqda onun faydalı və qənaətbəxş olduğunu görərik. Həmçinin qadağan etdiklərini də belə araşdırdıqda bu işlərin doğrudan da bəşəriyyət üçün təhlükəli və zərərli olduğunun açıq-aşkar şahidi oluruq. Lakin bunları dərk etmək üçün ağıl və dərrakə nəfsi istəklərdən və kor-koranə təqliddən uzaq olmalıdır. İslam şəriətinin hikmətli şəriət qaydalarından biri də hökm və qisasdır. Bu məsələnin açıqlaması belədir:

**Birinci:** Hökmün tərifi və cəza tələb edən cinayətlər;

Hökm - şəriətin təyin etdiyi cəza tədbirləridir. Onlar, Allah taalanın iradəsinə qarşı törədilən cinayətin cəzasıdır.

Hökmün tətbiq edildiyi cinayətlər məhduddur. Məsələn, mürtədlik, zina, böhtan, içki içmək və s.

**Ikinci:** Qisas və digər şəriət hökmlərinin tətbiqində İslam gözəlliklərinin bir hissəsinin sadalanması;

Mühakimə edilmə və qisas, cinayətlərin qorxuducu cəzasıdır. Bu hökm və qisaslar bəndələrə bir mərhəmət olaraq şəriət qanunu edilmişdir. Çünki bu cəzalar cinayətkarları qorxudur və fitnə-fəsadın qarşısını alır. Bunun bir çox gözəllikləri vardır və bunlardan aşağıdakıları demək olar:

1. İslam şəriətinin buyurduğu hökmlər insan ağlının məhsulu deyil. Bu bir ilahi rəhmətdir. Allah taalaya iman gətirən hər bir bəndənin qəlbində bu ehkamlara xüsusi məhəbbət vardır. Onlar bu ehkamları

tətbiq etməklə savab qazanmağa çalışırlar. Bu da cinayətlərin daha asanlıqla aşkar edilməsinə zəmin yaradır. Buna açıq-aşkar dəlil, cinayət edənlərin öz cinayətlərini etiraf etməsidir. Onlar, özlərini etdikləri cinayətdən təmizləmək üçün, Allahın hökmünün tətbiq edilməsini tələb edirlər.

2. Bu insan fitrətinə uyğun gəlir. Çünki bu qanunlar aləmlərin Rəbbi Allah taala tərəfindən nazil olmuşdur. Allah taala bütün məxluqatın, eləcə də insanın Xaliqidir. Ona görə də O, insana fayda və zərər verən, onu qorxudan və həvəsləndirən nə varsa hamısını billəndir. Bu səbəbdən də Allah taala insana uyğun olan qanunlar təyin etmişdir.

3. Bu qanunlar istənilən zaman və məkanda bütün cəmiyyətlərə aiddir. Hakimiyyətin və ya xalqların dəyişməsi onlara təsir etməz. Çünki bu qanunlar hər bir incəlikləri, keçmişi və gələcəyi bilən Allah taala tərəfindən nazil edilmişdir. Ona görə də bu qanunların digər qanunlar kimi təkmilləşdirilməyə ehtiyacı yoxdur. Amma insanların ixtira etdikləri qanunların dəyişikliyə, təkmilləşdirilməyə və yeniliyə möhtacdır. Çünki insanların ağılları nöqsanlı və qeyri-kamildir. Ona görə də Allah taala insanların əmin-amanlıqda yaşamaları üçün sabit və dəyişməz qanunlar buyurmuşdur ki, cinayətkarlar öz cəzalarını bilsinlər və həzər etsinlər.

4. O, Allah taalanın elçilərinin çağırdıqları gözəl əxlaqı və onun yayılmasını təmin edir. Bununla nəfslər tərbiyələnir və nəsillərin əsası qoyulur. Amma bəşər övladının ixtira etdiyi qanunlar isə çox vaxt bunun tam əksini həyata keçirir. Yəni, gözəl əxlaq, mənəvi tərbiyə, qiymətli nəsillər yetişdirmək və s. bu kimi cəhətlərə fikir vermir. Bu qanunlara əsasən yalnız başqasına ziyan vurulduqda həmin əxlaqi normalara fikir verilir. Məs, içki içib sərxoşluq edən adama cəza yalnız başqalarına ziyan vurduğu halda tətbiq olunur. Əks halda, yəni başqalarına ziyan vurmadıqda, ona heç bir qadağa qoyulmur. Həmçinin bu qanunlara əsasən, zinakarlığa *(kəbinsiz cinsi*

*yaxınlığa)* iki tərəfin razılığı olduqda, xüsusən də yetkinlik yaşına çatandan sonra, qadağa qoyulmur.

5. Bu şəxsi cinayətdir və buna görə də məsuliyyət başqalarının deyil, cinayətkarın üzərinə düşür. Allah taala buyurur:

﴿وَلَا تَكْسِبُ كُلُّ نَفْسٍ إِلَّا عَلَيْهَا ۚ وَلَا تَزِرُ وَازِرَةٌ وِزْرَ أُخْرَىٰ﴾ (الأنعام:١٦٤)

**"Hər kəsin qazandığı günah ancaq özünə aiddir. Heç bir günahkar başqasının günahını daşımaz...." (əl-Ənam: 164).**

Cəza yalnız cinayətkara verilir. Bu cəza cinayətlə əlaqəsi olmayanlara tətbiq edilə bilməz. Bəzi hallarda cinayətkarın yaxınları zərər çəkə bilərlər. Məsələn, cinayətkarın cəzalanması nəticəsində onun ailəsi həmin adamdan uzaq düşdüklərinə görə müəyyən qədər cəzalanırlar. Lakin həmin cəza bu hökmün tətbiqi ilə nəticələnir. Bu, hökmün əsas məqsədində qəsd edilmir.

6. Bu cəzalar hər kəs üçün eynidir. Cəzaların tətbiqində, varlı ilə kasıb, şərəfli ilə sıravi, ağ ilə qara, hakim ilə camaat arasında heç bir fərq yoxdur. Hər kəs cinayətinə uyğun cəzasını alır və bu zaman onların heç bir üstün cəhətləri nəzərə alınmır. Şəriətin təyin etdiyi cəza tədbirləri yalnız həmin cinayətkara tətbiq edilməlidir. Həmçinin cinayətkarın ictimaiyyət arasında olan nüfuzu da buna təsir edə bilməz. Imam Buxari və Müslim "Səhih" adlı kitablarında Aişədən ﵂ rəvayət etdikləri hədisdə deyilir:

أن قريشا أهمهم شأن المرأة المخزومية التي سرقت، فقالوا: ومن يكلم فيها رسول الله ﷺ ؟ فقالوا: ومن يجترئ عليه إلا أسامة بن زيد، حب رسول الله ﷺ ؟ فكلمه أسامة، فقال رسول الله ﷺ: «أتشفع في حد من حدود الله ثم قام فاختطب ثم قال: أيها الناس إنما أهلك الذين قبلكم، أنهم كانوا إذا سرق فيهم الشريف تركوه، وإذا سرق فيهم

***"Qüreyşlilər əl-Məxzum qəbiləsindən olub, oğurluq edən bir qadını müdafiə edirdilər. Onlar dedilər: Kim Peyğəmbərin ﷺ yanına gedib ondan bu qadının bağışlanması üçün üzr istəyər. Orada olanlar: Bunu, Peyğəmbərin ﷺ sevimlisi olan, Usamə ibn Zeyddən başqa kim bacarar, dedilər! Usamə Peyğəmbərin ﷺ yanına gəlib bu haqda ona danışdı. Peyğəmbər ﷺ buyurdu: "Sən Allahın təyin etdiyi bir cəza haqda üzrxahlıqmı edirsən?" Bundan sonra Peyğəmbər ﷺ insanlara xütbə verdi və buyurdu: "Ey insanlar! Sizdən əvvəlki ümmətlərin həlak olma səbəbi budur: onlar adlı-sanlı adam oğurluq edəndə onu azad edər, zəif insan oğurluq etdikdə isə ona oğruluğun cəzasını tətbiq edərdilər. Allaha and olsun! Əgər Məhəmmədin qızı Fatimə oğurluq etsəydi, onun da əlini kəsərdim!".[1]"***

7. İslam şəriəti bunları buyurmaqda ədalət və insafa əsaslanır. Hər iki tərəfə: cinayətkar və zərərçəkənə - heç bir zülm olunmaz. Cinayətkarın cəzası şişirdilərək ağırlaşdırılmaz, həmçinin cinayətkarın cəzası lazımı dərəcədən aşağı salınaraq zərərçəkənə zülm olunmaz. Hər cinayətin öz cəzası təyin edilər. Zalımdan zülmün haqqı alınar. Məsələn, əgər cinayətkar günahsız adamın həyatına son qoyubsa, etdiyi cinayətin növünə uyğun olaraq onun da həyatına son qoyulmalıdır. Çünki cəza əməlin növündən olmalıdır.

Allah taala buyurur:

﴿ وَلَا تَقۡتُلُواْ ٱلنَّفۡسَ ٱلَّتِي حَرَّمَ ٱللَّهُ إِلَّا بِٱلۡحَقِّۗ وَمَن قُتِلَ مَظۡلُومٗا فَقَدۡ جَعَلۡنَا لِوَلِيِّهِۦ سُلۡطَٰنٗا فَلَا يُسۡرِف فِّي ٱلۡقَتۡلِۖ إِنَّهُۥ كَانَ مَنصُورٗا ٣٣ ﴾ (الإسراء: ٣٣)

[1] Buxari: 6\ 513\ № 3475. Müslim: 3\ 1315\ № 1688.

**"Allahın haram buyurduğu cana haqsız yerə qəsd etməyin.** ***(Onu yalnız və yalnız böyük bir günah işlədikdə, məsələn, iman gətirdikdən sonra küfrə düşdükdə, yaxud zinakarlıq etdikdə öldürmək olar).*** **Haqsız yerə öldürülən məzlum bir şəxsin sahibinə** ***(və ya varisinə qatil barəsində)*** **bir ixtiyar verdik** ***(istəsə, qatildən qisas alar, istəsə, bağışlayar və ya qanbahası tələb edər).*** **Lakin o da qətl etməkdə ifrata varmasın** ***(qisas almalı olsa, yalnız qatili öldürməklə kifayətlənsin)*****! Çünki** ***(şəriətin bu hökmləri ilə)*** **ona artıq kömək olunmuşdur." (əl-İsra: 33).**

8. İslam şəriətinin bu qanunları və cəza tədbirlərini təyin etməklə mötəbər zəruri məsələləri qorumaq üçün çalışır. Biz insanların zəruri işlərini saysaq, onların beş əsasa döndüyünü görərik və onlar: dinin qorunması, nəfsin qorunması, ağlın qorunması, namus və nəslin qorunması, mal-dövlətin qorunmasıdır. Şübhə yoxdur ki, insan həyatı bu xüsusiyyətləri qorumağın əsasında bərqərar olmuşdur. Çünki gözəl insan həyatı bu mühüm qaydaların olması ilə mümkündür. Bunların hər hansına düşmənçilik etmək çox böyük cinayətdir. Ona görə də bu düşmənçilikdən çəkindirmək üçün güclü və qorxulu cəza tədbirləri lazımdır.

Bu məntiqlə İslam belə cəza tədbirlərini şəriətin qaydalarından etmişdir. Məsələn, insanları Allahın dinindən çəkindirdiyinə görə, mürtədin öldürülməsini vacib etmişdir. Insan nəfsinə düşmənçilik etmək və öldürmək kimi təhlükələrin qarşısını almaq üçün qisası bir qanun etmişdir. Ağılı qorumaq və mühafizə etmək üçün, sərxoşedici maddələri və uyuşdurucuları haram etmiş, sərxoşluğun cəzasını da təyin etmişdir. Nəsil və namusu qorumaq üçün zinakarlığı *(kəbinsiz cinsi yaxınlığı)* və iffətli qadınlara böhtan atmağı haram etmiş, zina və böhtanın cəzalarını bildirmişdir. Var-dövləti qorumaq üçün isə, ona oğurluq və soyğunçuluq vasitəsilə düşmənçilik etməyi haram etmiş, oğurluq və soyğunçuluğa qarşı cəzalar təyin etmişdir.

Ona görə də İslam dini bu zəruri qaydaları himayə edir. Qisası və müəyyən cəzaları təyin etməklə bu düşmənçiliyin qarşısını alır. Bununla da insanlar gözəl və firavan həyat qururlar.

9. İslam şəriəti cinayətkarı bir neçə baxımdan nəzərə alır:

a. Cinayətkarın cinayət etməsinin isbatı və cəzaya layiq görülməsinin təsdiqi: İslam şəriəti, cinayətkarın cinayətinin isbat edilməsində çox ciddi şərtlər qoymuşdur. Məsələn, şərtlərdən biri, cinayətkarın bu cinayəti öz istəyi ilə, heç bir təzyiq olmadan və zərurət olmadan etməsidir. Həmçinin cinayətkar yetkinlik yaşına çatmalı, ağıl sahibi olmalı, etdiyi əməlin - cinayətin qadağan olmasını və cəzasını bilməlidir. Əgər cinayətkar cinayətini zorla, zərurət üzündən edərsə, yaxud azyaşlı olarsa, etdiyi cinayətin qadağan olmasını və onun cəzasını İslamı yeni qəbul etdiyinə və ya başqa səbəblərə görə bilməzsə, ona cəza tətbiq edilməz. Bu halda o, üzrlü hesab edilər.

b. Cəza, təyin edilməsi baxımından isə, belədir: Zinanın cəzasına nəzər saldıqda görürük ki, əgər zinakar evlidirsə onun cəzası daşqalaqdır. Əgər zinakar evli deyilsə, onda onun cəzası ölümlə nəticələndirilmir. Həmçinin qatilin cəzası da belədir. Əgər qatil qəsdən öldürübsə ondan qisas alınmalıdır. Əgər xəta edərək öldürübsə, ondan qisas deyil, qanbahası *(qanpulu)* alınır və onun yaxınlarına təqdim edilir.

c. Cəzanı həyata keçirmək baxımından isə belədir: İslam şəriəti, ölüm cəzası üçün həddi-buluğa çatmamış cinayətkarın halını nəzərə alır. Məsələn, əgər cinayətkar sağalmaq ümidi olan xəstəlik daşıyarsa, yaxud hamilə və ya nifaslı qadın olarsa, belə halda ona cəzanın tətbiq edilməsi ilə həlak olma təhlükəsi ehtimal edilərsə, onda cəza cinayətkar sağalandan sonra həyata keçirilir. Çünki cəza tədbiri cinayətkarı həlak etmək üçün deyil, onu etdiyi əməlindən çəkindirmək üçün tətbiq edilir.

d. Cəza tətbiq olunan adamın şərəfinin qorunması: Onu cəza tətbiq edilən vaxt və ya sonra söymək, lənətləmək qadağandır. Əgər onun cəzası ölümlə nəticələnərsə onun üçün cənazə namazı qılınır, dua edilir və rəhmət oxunur.

10. Xəbərdarlıq edilmiş cinayətlərin cəzasının şiddətli olması: İslam şəriəti yalnız dünyada gözə dəyən və sübut edilə biləcək cinayətlərin cəzasını həyata keçirir. Cinayət çox gözə dəydikcə cəzası da bir o qədər şiddətli edilmişdir. Əgər cinayətkar cəzasız buraxılsaydı onda cəmiyyətdə fitnə-fəsad tüğyan edər və cəmiyyət korlanardı.

Çox vaxt ələ düşmüş cinayətkar əvvəllər də başqa cinayətlərin səbəbkarı olur. Ona görə də tətbiq edilən cəza sadəcə indiki cinayətinin deyil, əvvəlki cinayətlərinin də cəzası olur. Məsələn, təsəvvür edin ki, zina edən adamı dörd nəfər şahid görmüşdür. Bu dəlil deyil mi ki, həmin adam artıq dəfələrlə belə cinayət etmiş və indi bunu gizlidə deyil, aşkarda etməkdən belə çəkinmir?!

Ona görə də cinayəti aşkarda edənin cəzasının daha da şiddətli olmasını qanuniləşdirmək İslam şəriətinin bir gözəlliyidir. Kim başqalarının namusunu tapdalayar və cinayəti aşkara çıxarsa, onun cəzası etdiyi əməlin miqdarına yetişər. Bu dünyada aşkar edilməyən cinayət Allah taala tərəfindən gizli saxlanar.

Dediklərimiz, cinayətlərlə bağlı qanunlarda İslam şəriətinin bəzi gözəllikləri idi. Şübhə yoxdur ki, İslam şəriətinin buyurduğu qanunlar bəşər övladının bildiyi ən gözəl qanun və qaydalardır. O, bütün insanların hüquqlarını qorumağa və cinayətkarın cəzasını verməyə qadirdir.

Buna ən gözəl misal ərəblərin İslamdan əvvəl və sonrakı vəziyyətlərini göstərmək olar. Onlar İslamdan əvvəl bir-birlərinə qarşı düşmən, qatil, zalım, soyğunçu, zinakar, sərxoş və s. bu kimi cinayətlərin sahibləri idilər. Lakin İslamdan sonra onlar, bir-birlərinə

qarşı mehriban, doğma, təmiz qəlbli, nəvazişli, ədalətli, əmin və s. gözəl əxlaqlı oldular...

Bunun üçün çox uzağa getmək lazım deyil. Bu gün İslam şəriətini tətbiq etməyən, qisas və cəzaları həyata keçirməyən dünya dövlətlərinə nəzər salsaq görərik ki, orada insan ruhu və namusu alış-veriş obyekti kimi bir vasitəyə çevrilmişdir. Ona görə də orada müəyyən məbləğ pula görə kimdənsə qisas almaq məqsədi ilə qatı cinayətkarlıq, soyğunçuluq, terror, qətl, yanğın və s. cinayətlər baş verir. Bu cinayətlər hər gün təkrarlanır və beləliklə, cəmiyyətdə narahatçılıq, hay-küy, özbaşınalıq və s. bu kimi narahatçılıqlar yaradır. Bütün bunların səbəbi, mövcud olan cəza tədbirlərinin lazımi səviyyədə qorxuducu və islahedici olmamağıdır.

Bunun əksi olaraq, İslam şəriəti ilə hökm verən, Allah taalanın əmr etdiyi qaydada qisas və cəza tədbirlərini tətbiq edən, Səudiyyə Ərəbistanı krallığında belə hallar, insanların ruhları, malları və namusları ilə alış veriş etmək və s. bu kimi hadisələr baş vermir. Əksinə ölkənin hər tərəfində əmin-amanlıq müşahidə olunur. Bunun lütfü Allahın şəriətini tətbiq etdiklərinə görədir.

**Üçüncü:** Cəzaların növləri, onların şəriətdən olan əsasları, hər cəzanın İslam şəriətinin gözəlliyinə dəlil olan özəlliklərinin qeydi;

***<u>Birinci:</u>*** **Mürtəd olmağın cəzası;**

Mürtəd olmaq, İslamı qəbul etdikdən sonra ondan üz döndərmək və küfrə qayıtmaqdır. Yaxud, şəriətdə üzrlü sayılmayan və yekdilliklə qəbul edilmiş küfr işlətməkdir. Mürtədliyin cəzası ölümdür.

Bu cəzaya dəlil Peyğəmbərin ﷺ bir neçə hədisidir və bunlardan:

Ibn Abbas ؓ Peyğəmbərin ﷺ belə buyurduğunu rəvayət edir:

قال رسول الله ﷺ: «من بدل دينه فاقتلوه». أخرجه البخاري في صحيحه

***"Kim dinini (qəbul etdiyi İslamı) dəyişərsə onu öldürün"[1].***

Ibn Məsud ﷺ Peyğəmbərin *(Sallallahu aleyhi və alə alihi və səlləm)* belə buyurduğunu deyir:

قال رسول الله ﷺ: «لا يحل دم امرئ مسلم، يشهد أن لا إله إلا الله وأني رسول الله، إلا بإحدى ثلاث: النفس بالنفس، والثيب الزاني، والمفارق لدينه التارك للجماعة». أخرجه البخاري في صحيحه ومسلم

***""Lə iləhə illəllah Məhəmmədən rəsuləllah" kəlməsinə şəhadət verən müsəlmanın qanı, üç hal müstəsna olmaqla, haramdır: nəfsə nəfs olaraq qisas alma, zina edən evli adam və camaatı tərk edib dinindən üz çevirən adam"[2].***

**Mürtədlik cəzasının qanunilәşdirilməsində hikmət:**

1. Heç şübhəsiz ki, əsas məqsəd yalnız Allah taalaya ibadət etməkdir. Bu məqsədlə Allah taala məxluqatı yaratmış, elçilər göndərmiş, kitablar nazil etmiş və şəriətlər buyurmuşdur. Ibadətin doğru olması və Allah taalaya tam mütilik üçün Onun Elçisi Məhəmmədə ﷺ nazil etdiyi və onun vasitəsi ilə bizə çatdırdığı şəriətə tam itaət etmək lazımdır. Ona görə də onun şəriətindən möhkəm tutmaq lazımdır. Çünki bu şəriət bütün gözəlliklərin əsasıdır. Ondan uzaqlaşmaq isə bütün rəzillikləri qazanmaqdır. Ona görə də bu dindən çıxmamaq üçün qorxuducu cəza lazımdır ki, insan belə rəzilliyə düşməsin.
2. İslam şəriəti heç kəsi bu dini qəbul etməyə məcbur etməmişdir. Əksinə hər kəsin önünə azad seçim qoymuşdur. Onlar istədikləri dini və əqidəni seçib ona riayət edə bilərlər. Allah taala buyurur:

---

[1] Buxari: 12\ 267\ № 6922.

[2] Buxari: 12\ 201\ № 6878. Müslim: 3\ 1302\ № 1676.

﴿ وَلَوۡ شَآءَ رَبُّكَ لَأٓمَنَ مَن فِي ٱلۡأَرۡضِ كُلُّهُمۡ جَمِيعًاۚ أَفَأَنتَ تُكۡرِهُ ٱلنَّاسَ حَتَّىٰ يَكُونُواْ مُؤۡمِنِينَ ٩٩ ﴾ (يونس: ٩٩)

**"Əgər Rəbbin istəsəydi, yer üzündə olanların hamısı iman gətirərdi. İnsanları iman gətirməyə sənmi məcbur edəcəksən?! (Bu sənin işin deyildir. Sənin vəzifən ancaq İslamı təbliğ etməkdir)." (Yunus: 99).**

﴿ لَآ إِكۡرَاهَ فِي ٱلدِّينِ ﴾ (البقرة: ٢٥٦)

**"Dində məcburiyyət (zorakılıq) yoxdur...." (əl-Bəqərə: 256).**

Əgər insan İslamı xoşluqla və öz seçimi ilə qəbul etmişsə, onda İslamın qanunları ilə də razılaşmalı və bütün bunları qəbul etməlidir. Belə şəriət qanunlarından biri də mürtədin cəzasıdır.

3. Mürtədlər dini pis qələmə verir, digər insanları da dindən uzaqlaşdırırlar. Onların İslama qarşı çıxışları və tənələri İslam haqda xəbərsiz olanlara təsir edir və nəticədə həmin adamlar İslam və müsəlmanlara nifrətlə yanaşırlar. Mürtədlər haqda verilən cəza, onların bu dərəcədə təhlükəli olmalarına uyğundur.

Mürtədlik cəzası dini və onun axarını qorumaq üçün təyin edilmişdir. Həmçinin bu cəza, İslama ləkə salmaq məqsədi ilə onu qəbul edib, məqsədlərini həyata keçirəndən sonra küfrə dönmək istəyənlərə ciddi xəbərdarlıq üçündür. Bu cəza ilə cəmiyyətdə mövcud olan münafiq və din alverçiləri təmizlənir və müsəlman dövlət və cəmiyyət üçün əmin-amanlığa zəmin yaradılır.

***Ikinci:*** **Zinanın *(kəbinsiz cinsi yaxınlığın)* cəzası;**

Heç şübhəsiz zina etmək təhlükəli cinayətdir. Onun fəsadları həddindən artıq çoxdur. Ona görə də İslam şəriəti zina etməyi haram buyurmuş və onun üçün ciddi cəza təyin etmişdir.

Allah taala buyurur:

﴿ ٱلزَّانِيَةُ وَٱلزَّانِي فَٱجۡلِدُواْ كُلَّ وَٰحِدٖ مِّنۡهُمَا مِاْئَةَ جَلۡدَةٖۖ وَلَا تَأۡخُذۡكُم بِهِمَا رَأۡفَةٞ فِي دِينِ ٱللَّهِ إِن كُنتُمۡ تُؤۡمِنُونَ بِٱللَّهِ وَٱلۡيَوۡمِ ٱلۡأٓخِرِۖ وَلۡيَشۡهَدۡ عَذَابَهُمَا طَآئِفَةٞ مِّنَ ٱلۡمُؤۡمِنِينَ ٢ ﴾ (النور:٢)

**"Zinakar kişiyə və zinakar qadına yüz çubuq vurun. Allaha və axirət gününə inanırsınızsa, Allahın dini barəsində (bu işin icrasında) ürəyiniz onlara yumşalmasın və möminlərdən bir dəstə də onların əzabına şahid olsun. (Bu, subay kişiyə və ərsiz qadına aiddir. Evli kişi və qadın zina etdikdə isə onların cəzası daşqalaq edilməkdir)." (ən-Nur: 2).**

Ibn Məsud ﵁ Peyğəmbərin ﷺ belə buyurduğunu deyir:

قال رسول الله ﷺ: «لا يحل دم امرئ مسلم، يشهد أن لا إله إلا الله وأني رسول الله، إلا بإحدى ثلاث: النفس بالنفس، والثيب الزاني، والمفارق لدينه التارك للجماعة». أخرجه البخاري في صحيحه ومسلم

***"Lə iləhə illəllah Məhəmmədən rəsuləllah" kəlməsinə şəhadət verən müsəlmanın qanı, üç hal müstəsna olmaqla, haramdır: nəfsə nəfs olaraq qisas, zina edən evli adam və camaatı tərk edib dinindən üz çevirən adam"[1].***

Əbu Hüreyrə və Zeyd ibn Xalid əl-Cuhəni ﵄ deyirlər ki, ərəblərdən *(bədəvi ərəblərdən)* bir kişi Peyğəmbərin ﷺ yanına gəldi və dedi:

[1] Buxari: 12\ 201\ № 6878. Müslim: 3\ 1302\ № 1676.

إن رجلا من الأعراب أتى رسول الله ﷺ فقال: يا رسول الله ! أنشدك الله إلا قضيت لي بكتاب الله. فقال الخصم الآخر – وهو أفقه منه –: نعم، فاقض بيننا بكتاب الله، وائذن لي. فقال رسول الله ﷺ: «قل» . قال: إن ابني كان عسيفا على هذا، فزنى بامرأته، وإني أخبرت أن على ابني الرجم، فافتديت منه بمائة شاة ووليدة، فسألت أهل العلم فأخبروني: أنما على ابني جلد مائة وتغريب عام، وأن على امرأة هذا الرجم. فقال رسول الله ﷺ: «والذي نفسي بيده لأقضين بينكما بكتاب الله، الوليدة والغنم رد، وعلى ابنك جلد مائة وتغريب عام، اغد يا أنيس إلى امرأة هذا، فإن اعترفت فارجمها» . قال: فغدا عليها فاعترفت، فأمر بها رسول الله ﷺ فرجمت. أخرجه البخاري في صحيحه ومسلم

***"Ey Allah Elçisi! Səni Allaha and verirəm! Mənə Allahın kitabı ilə hökm ver! Onun yanında olan digər şikayətçi adam da dedi: Bəli, bizə Allahın kitabı ilə hökm ver! deyərək danışmağa izn istədi. Peyğəmbər ﷺ dedi: "De!". O, dedi: Mənim oğlum bunun yanında muzdlu işləyirdi və oğlum bunun arvadı ilə zina etmişdir. Mənə dedilər ki, sənin oğlun daşqalaq edilməlidir. Mən bunun əvəzinə həmin adama 100 qoyun və bir qadın kölə vermişəm. Sonra elmli insanlardan bu haqda soruşduqda dedilər ki: sənin oğluna yüz çubuq vurulmalı və bir il müddətinə yaşadığı yerdən uzaqlaşdırılmalıdır. Bunun arvadı isə daşqalaq olunmalıdır. Peyğəmbər ﷺ buyurdu: "Nəfsim əlində olana and olsun! Sizin aranızda Allahın kitabı ilə hökm kəsəcəyəm! Qadın kölə və qoyunlar***

***qaytarılmalı, sənin oğluna yüz çubuq vurulmalı və bir il müddətinə yaşadığı yerdən uzaqlaşdırılmalıdır." Sonra Peyğəmbər ﷺ buyurdu: "Ey Uneys! Bu adamın arvadının yanına get və əgər zina etdiyini etiraf etsə onu daşqalaq et!". Rəvayətçi deyir: Uneys o qadının yanına getdi və həmin qadın zina etdiyini etiraf etdi. Sonra Peyğəmbər ﷺ onu daşqalaq etməyi əmr etdi[1].***

**Zinanın cəzasının təyin edilməsində hikmət:**

1. Insanın şəhvət *(ehtiras)* hissləri onu cinsi yaxınlığa məcbur edir. Ona görə şəhvətini *(ehtiras hisslərini)* şəriətə zidd yolla ödəmək istəyənlərə qarşı ciddi və qorxuducu cəza təyin edilməlidir. Əks halda cəmiyyətdə güclü fitnə-fəsad olar, insanların namus-qeyrətləri tapdalanar. Bu səbəbdən zinanın qarşısını almaq üçün kəskin cəza təyin edilməlidir.
2. İslam şəriəti öz adilliyinə görə evli ilə subayın zina etmə cəzasını fərqli etmişdir. Əgər zina edən adam subaydırsa onun cəzası həlakedici olmaz. Ona yüz çubuq vurular və bir illik yaşadığı yerdən uzaqlaşdırılar ki, şallağın, tənhalığın, vətəndən və ailədən ayrı düşməyin dadını bilsin və bir daha zina etməyə qayıtmasın. Əgər zina edən adam evlidirsə, o bu əməli ilə özünün cəmiyyətə layiq olmadığını isbatlayır və onun cəzası da daşqalaqdır.

Bu cəza zahirən şiddətli görsənsə də rəhmət və mərhəmət onun içərisindədir. Dörd nəfər şahid necə şahidlik edə bilərlər ki, onlar kiminsə zina etdiyini görüblər. İslam cəzanı şiddətli etməklə yanaşı, məsələnin tətbiqinə ehtiyatlı yanaşmışdır.

İslam şəriətinin təyin etdiyi zina cəzası cəmiyyət üçün xeyirlidir. Çünki belə halda hər kəs öz ailəsinə xəyanət edilməyəcəyinə əmin olar. Beləliklə, cəmiyyəti mehribançılıq və ülfət bürüyər.

***<u>Üçüncü:</u>*** **Qəzfin** *(zina isnad etməklə böhtan atanların)* **cəzası;**

---

[1] Buxari: 5\ 323-324\ № 2724. Müslim: 3\ 1324-1325\ № 1697.

Qəzf: Namuslu qadına zina etməyi isnad edərək ona böhtan atmaqdır. Allah taala bu əməli haram edərək buyurur:

﴿ وَٱلَّذِينَ يَرۡمُونَ ٱلۡمُحۡصَنَٰتِ ثُمَّ لَمۡ يَأۡتُواْ بِأَرۡبَعَةِ شُهَدَآءَ فَٱجۡلِدُوهُمۡ ثَمَٰنِينَ جَلۡدَةً وَلَا تَقۡبَلُواْ لَهُمۡ شَهَٰدَةً أَبَدًاۚ وَأُوْلَٰٓئِكَ هُمُ ٱلۡفَٰسِقُونَ ۝٤ إِلَّا ٱلَّذِينَ تَابُواْ مِنۢ بَعۡدِ ذَٰلِكَ وَأَصۡلَحُواْ فَإِنَّ ٱللَّهَ غَفُورٞ رَّحِيمٞ ۝٥ ﴾ (النور: ٤-٥)

**"İsmətli qadınlara zina isnad edib, sonra *(dediklərini təsdiqləyəcək)* dörd şahid gətirə bilməyən şəxslərə səksən çubuq vurun və onların şəhadətini heç vaxt qəbul etməyin. Onlar sözsüz ki, *(Allahın itaətindən çıxmış)* əsl fasiqlərdir. Bundan *(namuslu qadınlara atdığı böhtandan)* sonra tövbə edib özlərini islah edənlər istisna olmaqla. Çünki Allah *(tövbə edənləri)* bağışlayandır, rəhmlidir!" (ən-Nur: 4-5).**

Əbu Hureyrə ﷺ Peyğəmbərin ﷺ belə buyurduğunu deyir:

عن النبي ﷺ قال: «اجتنبوا السبع الموبقات» . قالوا: يا رسول الله ما هن؟ قال: «الشرك بالله، والسحر، وقتل النفس التي حرم الله إلا بالحق، وأكل الربا، وأكل مال اليتيم، والتولي يوم الزحف، وقذف المحصنات المؤمنات الغافلات» . سبق تخريجه

*"Yeddi böyük günahdan çəkinin!" Səhabələr soruşdular: Ey Allahın Elçisi! Onlar hansılardır? Peyğəmbər ﷺ buyurdu: "Allaha şərik qoşmaq, sehr, haqsız yerə Allahın haram buyurduğu insanı öldürmək, sələm yemək, yetimin malını yemək, qızğın döyüş meydanından qaçmaq, namuslu, iffətli və zinadan bixəbər mömin qadınlara böhtan atmaq"[1].*

[1] Buxari: 5\ 293\ № 2766. Müslim: 1\ 92\ № 89.

Peyğəmbər ﷺ möminlərin anası Aişəyə ﵂ atılan böhtana görə, qəzf etməyin cəzasını tətbiq etmişdir. O, bu böhtanda iştirak edənləri çubuqlatdırmışdı.

Iffətli və namuslu qadınlara zina isnad edib böhtan atmaq onlara, ailələrinə, atalarına, qardaşlarına və qəbilələrinə əziyyət verdiyindən və başlarını aşağı saldığından haram edilmişdir. Əslində bu böhtan yalan bir iftiradır. Bu böyük və təhlükəli yalan olduğuna görə onun cəzası da qorxuducu və çəkindirici olmalıdır ki, şərəfsiz insanlar belə əməllərdən çəkinsinlər.

***Dördüncü:*** **Oğurluğun cəzası;**

Oğurluq: başqasının malını bağlı yerdən, zülmlə götürməkdir.

Allah taala oğurluq üçün cəza təyin edərək buyurmuşdur:

﴿وَٱلسَّارِقُ وَٱلسَّارِقَةُ فَٱقْطَعُوٓاْ أَيْدِيَهُمَا جَزَآءَۢ بِمَا كَسَبَا نَكَٰلٗا مِّنَ ٱللَّهِۗ وَٱللَّهُ عَزِيزٌ حَكِيمٞ ٣٨﴾(المائدة:٣٨)

**"Oğru kişi ilə oğru qadının gördükləri işin əvəzi kimi Allahdan cəza olaraq (sağ) əllərini kəsin. Allah yenilməz qüvvət sahibi, hikmət sahibidir!" (əl-Maidə: 38).**

عائشة –رضي الله عنها– قالت: كان رسول الله ﷺ يقطع السارق في ربع دينار فصاعدا. أخرجه البخاري في صحيحه ومسلم

Möminlərin anası Aişə ﵂ deyir: ***Peyğəmbər ﷺ dinarın dörddə biri və ondan çox məbləğə görə oğrunun əlini kəsərdi[1].***

**Oğurluğun cəzasının təyin edilməsində hikmət:**

[1] Buxari: 12\ 96\ № 6789. Müslim: 3\ 1312\ № 1684.

Heç şübhəsiz oğurluğun çox böyük zərəri vardır. Çünki o, oğurluq edəni şərəfli işlər görməkdən və halal ruzi qazanmaqdan yayındırır. Insanı hər zaman alçaldıcı işlər görməyə sövq etdirir.

Oğurluq edən adam etdiyi əməlinin cəzasını bildikdə oğurluqdan əl çəkər, doğru və halal yol ilə öz ruzisini qazanmaq haqda düşünür.

İslam şəriəti oğurluğun cəzasını təyin etməklə insanların var-dövlətini mühafizə edir, ölkədə əmin-amanlığı bərqərar edir, fərdi və ya toplum üçün halal qazanc və ruzi yollarını rahatlaşdırır. Beləliklə, hər kəs öz əlinin əməli ilə gözəl və xoşbəxt yaşayar.

***<u>Beşinci:</u>*** **Içki içməyin cəzası;**

İslam şəriəti içkini haram etmiş və onu içənlər üçün cəza təyin etmişdir. Bu haqda bir neçə hədis rəvayət edilir. Bu hədislər içki içən adama fiziki cəza təyin edilməsini bildirir. Bu cəzanın miqdarı, necəliyi haqda bir neçə rəvayət vardır. Həmçinin raşidi xəlifələr də içki içənlərin cəzasını belə təyin edərdilər.

فعن أنس بن مالك أن النبي ﷺ أتي برجل قد شرب الخمر فجلده بجريدتين نحو أربعين وفعله أبو بكر. فلما كان عمر استشار الناس فقال عبد الرحمن: أخف الحدود ثمانين. فأمر به عمر. أخرجه مسلم.

Ənəs ﷺ deyir: ***Peyğəmbərin ﷺ yanına içki içən bir kişini gətirdilər. O, həmin kişiyə xurma ağacının iki budağı ilə qırxa yaxın çubuq vurdurdu. Əbu Bəkr ﷺ də öz xilafəti dövründə belə edirdi. Ömər ﷺ xilafəti dövründə insanlarla müşavirə etdi. Əbdür Rəhman dedi: Ən az cəza miqdarı səksən çubuqdur. Sonra Ömər ﷺ belə***

***etməyi əmr etdi[1]. Əli ibn Əbu Talib dedi: Peyğəmbər ﷺ ilə Əbu Bəkr qırx çubuq vurmuşlar, Ömər isə səksən. Bunların hamısı sünnədir[2].***

**Içki içənin cəzasının təyin edilməsində hikmət:**

Içki və sərxoşedicilərin zərərləri haqda düşündükdə bunların həqiqətən də fərdi və toplum şəklində insanlara zərər verməsi müşahidə olunur. Bu da cəmiyyətə və ailəyə mənfi təsir göstərir.

Belə zərərləri olan bir cinayətə qarşı qəti cəza təyin edilməsi zəruridir. Allah taala Öz hikmətli şəriətində insanlar üçün həm dünya və həm də axirət səadətini gerçəkləşdirmək üçün içkini, sərxoşedici maddələri haram etmiş və onları qəbul edənlərə qarşı ciddi və çəkindirici cəzalar təyin etmişdir.

***<u>Altıncı:</u>* Soyğunçuluğun və quldurluğun cəzası;**

Allah taala yolkəsən quldurları Allaha və Onun Peyğəmbərinə qarşı savaşanlar və yer üzündə fəsad törədənlər adlandırmışdır. Belələrinin cəzasını bu ayələrdə təyin etmiş və buyurmuşdur:

﴿ إِنَّمَا جَزَٰٓؤُاْ ٱلَّذِينَ يُحَارِبُونَ ٱللَّهَ وَرَسُولَهُۥ وَيَسۡعَوۡنَ فِي ٱلۡأَرۡضِ فَسَادًا أَن يُقَتَّلُوٓاْ أَوۡ يُصَلَّبُوٓاْ أَوۡ تُقَطَّعَ أَيۡدِيهِمۡ وَأَرۡجُلُهُم مِّنۡ خِلَٰفٍ أَوۡ يُنفَوۡاْ مِنَ ٱلۡأَرۡضِۚ ذَٰلِكَ لَهُمۡ خِزۡيٞ فِي ٱلدُّنۡيَاۖ وَلَهُمۡ فِي ٱلۡأٓخِرَةِ عَذَابٌ عَظِيمٌ ٣٣ إِلَّا ٱلَّذِينَ تَابُواْ مِن قَبۡلِ أَن تَقۡدِرُواْ عَلَيۡهِمۡۖ فَٱعۡلَمُوٓاْ أَنَّ ٱللَّهَ غَفُورٞ رَّحِيمٞ ٣٤ ﴾ (المائدة: ٣٣-٣٤)

**"Allaha və Peyğəmbərinə qarşı vuruşanların, yer üzündə fitnə-fəsad salmağa çalışanların cəzası ancaq öldürülmək, çarmıxa çəkilmək, ya da əl-ayaqlarının çarpazvari (sağ əllərilə sol ayaqlarını) kəsilməsi, yaxud da yaşadıqları yerdən sürgün olunmalıdırlar. Bu (cəza) onlar üçün dünyada bir rüsvayçılıqdır.**

---

[1] Müslim: 3\ 1330\ № 1706.
[2] Müslim: 3\ 1332\ № 1707.

**Axirətdə isə onları böyük bir əzab gözləyir. Sizin əlinizə keçməmişdən əvvəl tövbə edənlər müstəsnadır. Bilin ki, Allah bağışlayandır, rəhm edəndir!" (əl-Maidə: 33-34).**

**Soyğunçuluğun cəzasının təyin edilməsində hikmət;**

Soyğunçuluq və quldurluq cəmiyyətə qarşı ən təhlükəli cinayətdir. Gizli halda başqasının malını mənimsəmək oğurluq etmək səviyyəsindədir. Zinakarlığın da cəzası təyin edilmişdir. Qətlin cəzası da müəyyən edilmiş və bu məsələdə bağışlamaq qapısı da açılmışdır. Əgər cinayətkar zorla insanların malını mənimsəyir, zorla zinakarlıq edirsə *(zorlayırsa)*, yaxud quldurluq edərək yol kəsir, qarşısına çıxanı öldürür, insanları silah gücü ilə vahiməyə salırsa, yer üzündə fitnə-fəsad törədirsə beləsinin cinayəti və cəzası da digər cinayətlərdən daha şiddətlidir. Ona görə də beləsinin cəzasının daha da şiddətli və qorxuducu olması hikmətə uyğundur.

Həmçinin soyğunçuluq hadisələrinin müxtəlif hallarda və formalarda baş verməsi ilə əlaqədar olaraq şəriət bu cinayət üçün dörd növ cəza tədbiri təyin etmiş və bu cəzaların tətbiqini hakimin və ya onun köməkçisinin öhdəsinə buraxmışdır. Belə halda onun cəzası etdiyi cinayətinin miqdarında, ədalətli və qorxuducu olur. Bu cəza nəticəsində cinayətlər azalır, günahkarlar cəzalandırılır, cəmiyyət gözəl və əmin-amanlıq şəraitində yaşayırlar.

**Dördüncü: Qisas;**

Şəriətdə Qisasın mənası, cinayət ilə cəzanı bərabər tutmaqdır. Allah taala buyurur:

﴿يَٰٓأَيُّهَا ٱلَّذِينَ ءَامَنُوا۟ كُتِبَ عَلَيْكُمُ ٱلْقِصَاصُ فِى ٱلْقَتْلَى ۖ ٱلْحُرُّ بِٱلْحُرِّ وَٱلْعَبْدُ بِٱلْعَبْدِ وَٱلْأُنثَىٰ بِٱلْأُنثَىٰ ۚ فَمَنْ عُفِىَ لَهُۥ مِنْ أَخِيهِ شَىْءٌ فَٱتِّبَاعٌۢ بِٱلْمَعْرُوفِ وَأَدَآءٌ إِلَيْهِ بِإِحْسَٰنٍ ۗ ذَٰلِكَ تَخْفِيفٌ مِّن رَّبِّكُمْ وَرَحْمَةٌ ۗ فَمَنِ ٱعْتَدَىٰ بَعْدَ ذَٰلِكَ فَلَهُۥ عَذَابٌ

أَلِيمٌ ﴿١٧٨﴾ وَلَكُمْ فِي ٱلْقِصَاصِ حَيَوٰةٌ يَٰٓأُوْلِي ٱلْأَلْبَٰبِ لَعَلَّكُمْ تَتَّقُونَ ﴿١٧٩﴾ ﴾(البقـــرة: ١٧٨-١٧٩)

**"Ey iman gətirənlər! *(Qəsdən)* öldürülən şəxsdən sizin üçün qisas almaq hökmü qərara alındı *(vacib oldu)*. Azad şəxsi azad şəxsin, qulu qulun, qadını qadının əvəzində *(öldürə bilərsiniz)*. *(Öldürülən şəxsin)* qardaşı *(varisi)* tərəfindən *(müəyyən bir şey, qanbahası əvəzində)* bağışlanmış *(qatil)* ilə adətə görə *(yaxşı)* rəftar edilməlidir. Bağışlanmış *(qatil də)* yaxşılıqla *(qan sahiblərinə)* "diyə" *(qanbahası)* verməlidir. Bu, *(qisası qanbahası ilə əvəz etmək hökmü)* Rəbbiniz tərəfindən sizin üçün bir yüngüllük və mərhəmətdir. Bundan *(diyə əvəzində bağışlamaqdan)* sonra təcavüzkarlıq edən *(qatili öldürən və ya onun qohum-qardaşı ilə düşmənçilik edən)* kimsəni *(qiyamətdə)* şıddətli əzab gözləyir! Ey ağıl sahibləri, bu qisas *(qisas hökmü)* sizin üçün həyat deməkdir. Ola bilsin ki, *(bununla)* pis əməldən *(qətldən)* çəkinəsiniz." (əl-Bəqərə: 178-179).**

Ibn Məsud ﷺ Peyğəmbərin ﷺ belə buyurduğunu deyir:

قال رسول الله ﷺ: «لا يحل دم امرئ مسلم، يشهد أن لا إله إلا الله وأني رسول الله، إلا بإحدى ثلاث: النفس بالنفس، والثيب الزاني، والمفارق لدينه التارك للجماعة». أخرجه البخاري في صحيحه ومسلم

*"Lə iləhə illəllah Məhəmmədən rəsuləllah" kəlməsinə şəhadət verən müsəlmanın qanı, üç hal müstəsna olmaqla, haramdır: nəfsə nəfs olaraq qisas, zina edən evli adam və camaatı tərk edib dinindən üz çevirən adam"[1].*

**Qisasın təyin edilməsində hikmət:**

[1] Buxari: 12\ 201\ № 6878. Müslim: 3\ 1302\ № 1676.

1. Həqiqətən İslam şəriəti bütün bəşəriyyət üçün nazil edilmişdir. Bu şəriət insanların bəzilərini digərlərindən mühafizə edir. Xüsusən də zəifi güclünün zülmündən qoruyur. Məzlumun haqqını zalımdan alır... həmçinin başqa insanı haqsız yerə öldürməyi və ona qarşı düşmənçilik etməyi qadağan edərək onun hörmət və şərəfini qoruyur. Allah taala buyurur:

﴿وَلَا تَقْتُلُوا۟ ٱلنَّفْسَ ٱلَّتِى حَرَّمَ ٱللَّهُ إِلَّا بِٱلْحَقِّ﴾ (الأنعام: ١٥١) و(الإسراء: ٣٣)

**"Allahın haram buyurduğu cana haqsız yerə qəsd etməyin. (Onu yalnız və yalnız böyük bir günah işlətdikdə, məsələn, iman gətirdikdən sonra küfrə düşdükdə, yaxud zinakarlıq etdikdə öldürmək olar)..." (əl-İsra: 33).**

Nəfsinin istəklərinə uyaraq başqasına qəsd edib onu öldürməklə zərər yetirənin həm dünyada həm də axirətdə şiddətli cəzası vardır. Allah taala buyurur:

﴿كُتِبَ عَلَيْكُمُ ٱلْقِصَاصُ فِى ٱلْقَتْلَى ....﴾ (البقرة:١٧٨)

**"Ey iman gətirənlər! (Qəsdən) öldürülən şəxsdən sizin üçün qisas almaq hökmü qərara alındı (vacib oldu)..." (əl-Bəqərə: 178).**

﴿وَمَن يَقْتُلْ مُؤْمِنًا مُّتَعَمِّدًا فَجَزَآؤُهُۥ جَهَنَّمُ خَٰلِدًا فِيهَا وَغَضِبَ ٱللَّهُ عَلَيْهِ وَلَعَنَهُۥ وَأَعَدَّ لَهُۥ عَذَابًا عَظِيمًا ﴿٩٣﴾﴾ (النساء: ٩٣)

**"Hər kəs bir mömin şəxsi qəsdən öldürərsə, onun cəzası əbədi qalacağı Cəhənnəmdir. Allah ona qəzəb və lənət edər, (axirətdə) onun üçün böyük əzab hazırlar!" (ən-Nisa: 93).**

2. Qisas almaq hökmü yalnız İslam şəriətində deyil, bütün peyğəmbərlərin və elçilərin şəriətidir. Allah taala, qardaşını öldürmüş Adəm övladları haqda danışdıqdan sonra buyurur:

﴿ مِنۡ أَجۡلِ ذَٰلِكَ كَتَبۡنَا عَلَىٰ بَنِيٓ إِسۡرَٰٓءِيلَ أَنَّهُۥ مَن قَتَلَ نَفۡسَۢا بِغَيۡرِ نَفۡسٍ أَوۡ فَسَادٖ فِي ٱلۡأَرۡضِ فَكَأَنَّمَا قَتَلَ ٱلنَّاسَ جَمِيعٗا وَمَنۡ أَحۡيَاهَا فَكَأَنَّمَآ أَحۡيَا ٱلنَّاسَ جَمِيعٗاۚ وَلَقَدۡ جَآءَتۡهُمۡ رُسُلُنَا بِٱلۡبَيِّنَٰتِ ثُمَّ إِنَّ كَثِيرٗا مِّنۡهُم بَعۡدَ ذَٰلِكَ فِي ٱلۡأَرۡضِ لَمُسۡرِفُونَ ٣٢ ﴾ (المائدة: ٣٢)

**"Buna görə də İsrail oğullarına *(Tövratda)* yazıb hökm etdik ki, hər kəs bir kimsəni öldürməmiş *(bununla da özündən qisas alınmağa yer qoymamış)* və yer üzündə fitnə-fəsad törətməmiş bir şəxsi öldürsə, o, bütün insanları öldürmüş kimi olur. Hər kəs belə bir kimsəni diriltsə *(ölümdən qurtarsa)*, o, bütün insanları diriltmiş kimi olur. Bizim peyğəmbərlərimiz onlara *(İsrail oğullarına)* açıq möcüzələr gətirmişdilər. Bundan *(bu möcüzələrdən)* sonra da onların bir çoxu yer üzündə *(küfr, qətl və cinayət etməklə)* həddi aşdılar." (əl-Maidə: 32).**

Həmçinin Allah taala Tövrat şəriətini bəyan edərək buyurur:

﴿ وَكَتَبۡنَا عَلَيۡهِمۡ فِيهَآ أَنَّ ٱلنَّفۡسَ بِٱلنَّفۡسِ وَٱلۡعَيۡنَ بِٱلۡعَيۡنِ وَٱلۡأَنفَ بِٱلۡأَنفِ وَٱلۡأُذُنَ بِٱلۡأُذُنِ وَٱلسِّنَّ بِٱلسِّنِّ وَٱلۡجُرُوحَ قِصَاصٞۚ فَمَن تَصَدَّقَ بِهِۦ فَهُوَ كَفَّارَةٞ لَّهُۥۚ وَمَن لَّمۡ يَحۡكُم بِمَآ أَنزَلَ ٱللَّهُ فَأُوْلَٰٓئِكَ هُمُ ٱلظَّٰلِمُونَ ٤٥ ﴾ (المائدة: ٤٥)

**"Biz *(Tövratda İsrail oğullarına)* yazıb hökm etdik ki, canın qisası can, gözün qisası göz, burununku burun, qulağınkı qulaq, dişinki diş və yaralarınkı yaralardır. Lakin hər kəs *(qisası)* bağışlasa, bu onun üçün bir kəffarədir *(Allah onun günahlarının üstünü örtüb bağışlar. Və ya zərərdidə qisası bağışlasa, bu, cani üçün bir kəffarədir. Haqq sahibi haqqından vaz keçib onu tələb etməsə, Allah da cinayətkarı cəzalandırmaz)*. Allahın nazil etdiyi *(kitab və şəriət)* ilə hökm etməyənlər, əlbəttə, zalımdırlar!" (əl-Maidə: 45).**

3. Qisas, cinayətkarın törətdiyi qətlin cəzası olaraq eyni ilə belə cəzalanacağını xatırladaraq onun nəfsinə qorxu salır. Qisas onun nəfsinə qorxu salmaq üçün zamindir. Çünki qatil mütləq cəzalanacağını bilir, qaçmağın və ya gizlənməyin mənasız olduğunu, haqq və ədalətli cəzanın, boynu üzərində qoyulacaq qılıncın bir gün ona yetişəcəyini dərk edir. Insanın bu hissiyyatı güclü olduqca o, cinayətdən uzaq olar. Beləliklə, öldürüləcək adam ölümdən, qatil isə qisasdan xilas olar. Bu isə həm qatil, həm də öldürülən üçün həyat deməkdir.
4. Qisas qətl cinayətinə uyğun cəzadır. Çünki qətl nəfsə qarşı qəsd edilən düşmənçilikdir. Ona görə də qatilin etdiyi əmələ uyğun cəzanın təyin edilməsi ədalətə uyğundur. Atanın öz oğlunun qatilini yer üzündə rahat gəzib dolaşmasını görməsi heç ağıla sığışmaz bir işdir. Axı ata gözünün işığı olan oğlunu itirməklə bu ləzzətdən məhrum edilmişdir. Həmçinin bir gözünü itirmiş adamın onun gözünü çıxarmış adamın rahat şəkildə insanlar arasında dolaşmasını, iki gözə sahib olduğunu görməsi də ağıla sığan bir şey deyildir.
5. Qisas cəzasının tətbiq edilməsi fitnə-fəsadı yerindəcə yatırmaq, cinayətlərin qarşısını dərhal almaqdır. Çünki cinayətkarı cəzalandırmaq həm onun üçün, həm də digərləri üçün xəbərdarlıqdır. Insanları qırmaq, qanlarını axıtmaq üçün plan cızanlar cinayətkarlara qarşı tətbiq edilən qisas cəzasını gördükdə öz çirkin əməllərindən əl çəkərlər. Çünki onların da aqibətinin belə bitəcəyi əvvəlcədən onlara bəllidir.
6. Qisas az bir müddətdə kin-küdurətə və düşmənçiliyə son qoyur. Çünki qətlin kin-küdurəti və nifrətinin ən gözəl şəfası ədalətli qisasdadır. Qətlin acısını heç bir cəza, həbs, qovulma və ya dustaqlıq kimi cəzalar ödəyə bilməz. Hətta bu cəzaların müddəti uzadılsa yenə də fayda verməz. Yalnız bir halda, qatilin törətdiyi qətl formasında cəzalandırılması, yaxud qatili ələ keçirib ondan

ya qisas almaq və ya onu bağışlamaq buna dərman ola bilər. Zərərçəkənin kin-küdurətinin aradan qaldırılması çox əhəmiyyətlidir. Əks halda ölüm və düşmənçilik çox davam edə bilər. Çünki qana görə qəzəblənmək və qisas almaq insanın fitrətindəndir. İslam şəriəti bunları dərk etmiş və qisası qanuniləşdirmişdir. Bununla o, nəfslərdə olan nifrətləri sağaltmış, düşmənçilik və vəhşi intiqamın qarşısını almış, qəlbləri zülmdən, ədavətdən və nifrətdən təmizləmişdir. Həmçinin cəmiyyətdə tez-tez qətllərin baş verməsinin qarşısını almışdır.

7. Qisas təkcə zərərçəkənlər üçün deyil bütün insanlar üçün faydalıdır. Çünki qisas olmazsa havayı qan axıdılar, şər insanlar cəmiyyətdə hakimlik edər, güclü zəifi yeyər, əmin-amanlıq itər, cəmiyyəti fitnə-fəsad bürüyər, yollar kəsilər və ticarət əlaqələri məhv olar, istehsalat və inkişaf dayanar və insanların hərtərəfli mənfəətləri puç olar. Əgər qisas tətbiq edildikdə isə cinayətkar cəzasını tapar və onun cəzası etdiyi cinayətin növündən olarsa belə halda fitnə-fəsad bitər, cinayətlər kəsilər, insanlar xoşbəxt və əmin-aman həyat sürərlər.
8. İslam ədalət və mərhəmət dinidir. O, qatildən qisas almadan ölmüş insanın qanının boş yerə axıdılmasını istəmir. Bu ədalətin tam özüdür. Həmçinin İslam şəriəti daima qan axıdılmasını da istəmir. Qatilin qanının axıdılmasının qarşısını almaq üçün də diyəni *(qanbahasını)* qanuniləşdirmişdir. Bu çox böyük mərhəmət və mülayimlikdir. Lakin qisasın diyə *(qanbahası)* ilə əvəz edilməsinin təyini qan sahibinə, yaxud ölənin ailəsinə məxsusdur. Bu hökmün hikmətlərinin çoxluğunu Allah daha yaxşı bilir. Indi isə biz bəzilərini qeyd edəcəyik:

a. Diyə *(qanbahası)* şəriət qanunlarının təyinindən sonra qan sahiblərinin ürəklərində yumşaqlıq yaradır.

b. Diyə *(qanbahası)* insanları dolayısı ilə sülhə və barışığa səsləyir. Bu İslam şəriətinin əsas prinsiplərindəndir.

c. Diyə *(qanbahası)* sınmış iradələri düzəldir və hər tərəf üçün ixtiyari qapılar açır. Beləliklə cəza İslam şəriətinin ümumi tədbirləri ilə həyata keçirilir. Həmin ümumi tədbirlər isə bir hökmdə müxtəlif seçimlərin olmasıdır.

d. Diyə *(qanbahası)* müasir qanunların edamı ləğv etməyə can atdıqları hədəfləri əməli və orta yol ilə həyata keçirir. Bu yolla o, edamı tam ləğv etmir. Nəfsi və ictimai istəklərin əsasında işlərin məcrasını orta yolla həll edir. Bu yol doğru yol olduğu üçün özündən sonra zərərdən əsər-əlamət saxlamır.

9. İslam zərərçəkən tərəfə qisas almaq, bağışlamaq və ya diyə götürməkdə ixtiyar vermişdir. Bu İslam şəriətinin orta mövqeli şəriət olmasına dəlildir. Tövrat camaatına yalnız qətl verilmişdi. Incil camaatına isə yalnız bağışlamaq verilmişdi. Onların qisas və ya diyə almaqda payları yox idi. Lakin Allah taala bu ümmətə asanlıq yaradaraq zərərçəkənə ixtiyar vermişdir. Istəsə qisas alar, yaxud bağışlayıb diyə götürər və ya tam bağışlayar, heç diyə də götürməz.  Allah taala buyurur:

﴿ فَمَنْ عُفِيَ لَهُۥ مِنْ أَخِيهِ شَيْءٌ فَٱتِّبَاعٌۢ بِٱلْمَعْرُوفِ وَأَدَآءٌ إِلَيْهِ بِإِحْسَٰنٍ ۗ ذَٰلِكَ تَخْفِيفٌ مِّن رَّبِّكُمْ وَرَحْمَةٌ ﴾ (البقرة: ١٧٨)

**"(Öldürülən şəxsin) qardaşı (varisi) tərəfindən (müəyyən bir şey, qanbahası əvəzində) bağışlanmış (qatil) ilə adətə görə (yaxşı) rəftar edilməlidir. Bağışlanmış (qatil də) yaxşılıqla (qan sahiblərinə) "diyə" (qanbahası) verməlidir. Bu, (qisası qanbahası ilə əvəz etmək hökmü) Rəbbiniz tərəfindən sizin üçün bir yüngüllük və mərhəmətdir...." (əl-Bəqərə: 178).**

# Altıncı fəsil:
# Rəhbər ilə camaat arasında olan əlaqələrdə İslamın gözəllikləri;

Müsəlman rəhbərin mövcudluğu dinin ən əhəmiyyətli hissəsidir. Ona görə də müsəlmanların İslam dinini yaşadan, məzlumlara kömək edən, qanunları tətbiq edən bir rəhbəri olmalıdır. Bu məsələ öz əksini Quran, Sünnə, icma və şəriət qaydalarında tapır.

Allah taala buyurur:

﴿ يَٰٓأَيُّهَا ٱلَّذِينَ ءَامَنُوٓاْ أَطِيعُواْ ٱللَّهَ وَأَطِيعُواْ ٱلرَّسُولَ وَأُوْلِي ٱلۡأَمۡرِ مِنكُمۡ ﴾ (النساء:٥٩)

**"Ey iman gətirənlər! Allaha, Peyğəmbərə və özünüzdən olan ixtiyar (əmr) sahiblərinə itaət edin!..." (ən-Nisa: 59).**

Allah taala müsəlmanlara öz aralarından olan əmirlərə, rəhbərlərə itaət etməyi vacib etmişdir. Itaətin vacibliyi rəhbərin mövcud olmasının vacibliyini bildirir. Çünki Allah taala mövcud olmayana itaəti vacib etməz. Həmçinin əhəmiyyəti olmayana itaəti də fərz etməz. Itaətin əmr edilməsi rəhbərin mövcudluğunun vacibliyini bildirir. Deməli müsəlmanların üzərində rəhbərin olması vacibdir.

Sünnədə isə rəhbərin mövcudluğunun zəruriliyi haqda hədislər çoxdur. Misal olaraq bu hədisi demək olar:

Peyğəmbər ﷺ buyurmuşdur:

قول رسول الله ﷺ: «لا يحل لثلاثة يكونون بفلاة من الأرض إلا أمَّروا أحدهم» رواه الإمام أحمد في مسنده من حديث عبد الله بن عمرو -رضي الله عنهما- وله شاهد من حديث أبي سعيد الخدري رضي الله عنه، وحديث أبي هريرة رضي الله عنه، رواهما أبو داود في سننه.

***"Üç nəfər hər hansı bir yerdə olarlarsa, öz aralarından birini başçı seçmələri vacib sayılır"[1].***

Alimlərdən biri deyir: "Əgər az bir topluma öz aralarından birini başçı seçmək vacib edilmişdirsə, deməli çoxluğun arasından birini başçı seçmək daha vacibdir".

Həmçinin alimlər yekdilliklə bu məsələni dəstəkləyirlər. Onların biri deyir: "Müsəlmanlara öz aralarından bir nəfəri xəlifə *(rəhbər)* seçmək vacibdir".

Başqa bir alim isə deyir: "Rəhbər seçmək vacibdir. Səhabə və tabiinlərin rəhbər seçməyin vacibliyi haqda yekdil rəydə olmaları bu məsələnin şəriətdə vacib olmasına dəlildir. Çünki Peyğəmbərin ﷺ səhabələri onun ölümündən sonra dərhal Əbu Bəkri ﵁ xəlifə seçməyə üz tutdular və ona beyət etdilər. Bu əsrlər boyu belə olmuşdur. Məsələnin bu gedişatı onun vacibliyinə açıq-aşkar dəlildir".

Həmçinin rəhbər seçməyin vacibliyini şəriət qaydaları da təsdiqləyir. Məsələn, şəriət qaydalarının birində deyilir: "**Vacib əməlin tamamlanması üçün lazım olan əməl də vacib sayılır**".

Əli ibn Əbu Talib ﵁ bu məsələni təsdiqləyərək deyir: ***"Insanlar üçün yaxşı və ya pis olmasından asılı olmayaraq mütləq bir rəhbər lazımdır." Orada olanlar dedilər: Ey Möminlərin Əmiri! Yaxşı rəhbərin necəliyini bildik. Bəs pis rəhbər necə olur? Əli ﵁ dedi: "O, qanunları həyata keçirən, yollarda əmin-amanlıq yaradan, düşmənə qarşı cihad edən və qəniməti böləndir".***

Rəhbər seçməyin vacibliyini bildirən daha bir amil də vardır. Rəhbərin seçilməsi ilə fitnə-fəsadın və özbaşınalığın qarşısı alınır. Çünki, rəhbər təyin edilməmiş bir məmləkətdə hədsiz fitnə-fəsad və özbaşınalıq olar. Şəriətə görə zəruri sayılan beş amilin: din, nəfs, namus, mal və ağılın qorunması vacibdir. Şəriətin məqsədlərindən biri də bunları mühafizə etməkdir. Deyilən mühafizənin olması üçün

[1] Əhməd: 2\ 177. Əbu Davud: 3\ 81\ № 2608, 2609.

mütləq rəhbər lazımdır. Alimlərin biri deyir: "Rəhbər olmayan yerdə fitnə insanlara hökmranlıq edər".

Digər alim isə deyir: "Əgər rəhbərlər olmasaydı biz yolda əmin-amanlıqla gəzə bilməzdik. Bizim zəiflərimiz qüvvətlilərimizin hədəfi olardılar".

Şair deyir:

Özbaşınalıq insanları islah etməz, səadət verməz
Cahillər onlara ağalıq etsələr xoşbəxtlik olmaz!

Hər bir toplum öz istəklərinə nail olmaq üçün əmr edənlə əmr edilənin, rəhbərlə camaatın arasında əlaqə qurmalıdır. Hər kəs öz boynuna düşən vacib əməli, daşıdığı əmanəti yerinə yetirməlidir.

Rəhbər insanlar üzərində rəbb deyildir ki, insanlarla əlaqəsi olmadan yaşasın və ya Allah Elçisi deyil ki, onun işi yalnız Allah ilə insanlar arasında vasitəçilik olsun. Əslində rəhbər ilə camaat bir-birindən asılıdırlar. Ona görə də onlar din və dünya işlərini birgə yerinə yetirməlidirlər. Bir qafilə başçısı olub yol göstərən adam kimi, rəhbərin onlara kömək etməsi, camaatın da ona tabeçiliyi vacibdir. Yol göstərən qafilə başçısı yolunu düz getdikdə orada olanlar sakitcə onun ardınca gedər, yolu səhv getdikdə isə ona göstərişlər verməklə bir-birlərinə kömək edərlər. Qarşılarına çıxan çətinlikləri də birgə aşarlar.

Ona görə də həm rəhbərin həm də camaatın özünəməxsus vacib haqları vardır və onları gözləmək vacibdir.

**Birinci: Rəhbərlərin haqları;**

Rəhbərliyin böyük qayələri, alicənab məqsədləri vardır və bunlar aşağıdakı bəndlərdə öz əksini tapır:

1. Dini təbliğ etmək və ona çağırmaq:

Bu, rəhbərliyin ən əsas vəzifələrindəndir. Bu məqsədi həyata keçirmək üçün müsəlmanların rəhbəri Məhəmməd ﷺ ona peyğəmbərlik verildikdən sonra Allahın buyuruğu ilə dini təbliğ

etməyə başladı. Allah taala onu yer üzündə bərqərar etdikdən sonra o, digər ölkə və qəbilələrə Allahın dininə, haqq yola çağırış üçün elçilər göndərdi. Qonşu ölkələrin rəhbərlərini və tanınmış şəxsiyyətləri İslam dininə dəvət etmək üçün onlara məktublar yazdı. Ömrünün son nəfəsinə qədər Allahın dinini yaymaq üçün qoşunları səfərbər etdi. Ondan sonra gələn raşidi xəlifələr və Allahın müvəffəq etdiyi müsəlman rəhbərlər də onun bu yolunu davam etdirdilər.

2. Şübhələrin, bidətlərin və batil fikirlərin qarşısını almaq və onlara qarşı mübarizə aparmaq:

Bu rəhbərin boynuna düşən əsas məsuliyyətlərdən biridir. O, dinə zərər verəcək və ya ona ləkə gətirəcək hər bir amilin qarşısını almalıdır. Alimlərdən biri deyir: "Rəhbər dini özündən əvvəl yaşamış sələfin qaydalarına əsasən qorumalıdır. Dinə şübhə edəni başa salmalı, doğrunu ona çatdırmalıdır. Bunun üçün lazımi tədbirləri görməlidir ki, dində boşluqlar, cəmiyyətdə isə peşmançılıq yaranmasın".

Dini qoruma yollarından biri, bidətlərə qarşı savaş, İslam düşmənlərinin təbliğ etdikləri şübhə və iftiraları dəf etmək, batil fikirlərə qarşı çıxmaqdır. Cəmiyyəti qorumaq üçün dağıdıcı fikirlərə qarşı müxtəlif vasitələrlə mübarizə aparmaqdır.

Dəvət edən bidət və dağıdıcı fikirlər müxtəlifdir. Həmçinin bu işlə məşğul olanlar da fərqli şəraitlərdə yaşayırlar. Belə hallara qarşı mübarizəni bəzən təlim-tərbiyə, bəzən isə dəlillərlə qarşı tərəfi susdurmaq və onların şübhələrini dəf etməklə aparmaq lazım gəlir. Əli ibn Əbu Talib ﵁ xəvariclərlə belə etmişdir. O, Abdullah ibn Abbası ﵁ xəvariclərlə söhbət etmək üçün göndərmişdi. Bəzən isə bu mübarizə zor gücü ilə olur. Bir vaxtlar Ömər ﵁ Səbiğ adlı bir nəfəri tərbiyələndirmək üçün onu zorla öz yaşadığı yerdən qərib bir diyara sürgün etmişdi. Həmçinin Əli ﵁ haqqa qarşı inadkarlıq edən xəvariclərə qarşı savaşmışdı.

Ümumiyyətlə belə bidət və fikirlərə qarşı aparılan mübarizə zərərin dərəcəsinə görə zaman və məkana münasib edilməlidir.

3. Müsəlmanları və dövlət sərhədlərini qorumaq:

Rəhbər insanlar üçün əmin-amanlıq şəraiti yaratmalıdır. Bu əmin-amanlıq bütün sahələrdə, fikir, mədəniyyət və cəmiyyətdə olmalıdır ki, insanlar öz dinlərinə, ruhlarına, namusları və mallarına təminat veriləcəyinə əmin olsunlar.

4. Cəza tədbirlərini həyata keçirmək:

Bu iş rəhbərin və onun təyin etdiyi hakimlərin məsuliyyətidir. Alimlərdən biri deyir: "Cəza tədbirlərini həyata keçirmək rəhbərlərə vacibdir. Bu cəzalar vacib işləri tərk etdikdə və ya haram işləri etdikdə təyin edilir".

Rəhbərin cəza tədbirlərini həyata keçirməsi vacibdir. Şəriət qanunlarını tətbiq etmək məsələsinə zəkatı toplamaq, qəniməti bölmək, İslam dinini təbliğ etmək üçün qoşunları səfərbər etmək, insanlardan Allahın buyurduğu qayda-qanunlara riayət etmələrini tələb etmək, Onun əmrlərinə itaət etmək kimi məsələləri də daxildir.

5. Ədalətli olmaq və zülmün qarşısını almaq:

Ədalətli olmaq və zülm etməmək hər bir insanın borcudur. Bu təkcə rəhbərlərə aid deyildir. Bu haqda şəriətdə sübutlar çoxdur. Lakin biz yalnız rəhbərlərə aid olan hissəyə toxunacağıq.

Belə dəlillərdən: Bir hədisdə Peyğəmbər ﷺ buyurmuşdur:

"السبعة الذين يظلهم الله يوم لا ظل إلا ظلّه وذكر منهم إمام عادل..." صحيح البخاري مع الفتح (١٢/١١٢) برقم (٦٨٠٦) ومسلم: ٢/٧١٥ برقم (١٠٣١) .

***"Yeddi qisim insanlar qiyamət günü heç bir kölgənin olmadığı halda, Allah taalanın kölgəsi altında kölgələnəcəklər. onlardan biri də ədalətli rəhbərdir..."[1].***

Digər hədisdə isə Peyğəmbər ﷺ buyurmuşdur:

---

1 Buxari: 12\ 112\ № 6806. Müslim: 2\ 715\ № 1031.

قوله ﷺ: «ليس من وال أمة قلّت أو كثرت لا يعدل فيها إلا كبه الله تبارك وتعالى على وجهه في النار» رواه الإمام أحمد في مسند

*"Az və ya çox insan üzərində rəhbərlik edib ədalətli olmayan rəhbəri Allah taala üzü üstə cəhənnəmə atar"[1].*

Başqa hədisdə isə buyurmuşdur:

وقوله ﷺ: «المقسطون على منابر من نور عن يمين الرحمن وكلتا يديه يمين، هم الذين يعدلون في حكمهم وأهلهم وما ولوا» رواه مسلم

*"Hökm verməkdə, öz ailələrində və məsuliyyət daşıdıqları yerlərdə ədalətli olanlar nurdan olan minbərlərin üzərində Rəhmanın sağ tərəfində olacaqlar. Allah taalanın hər iki əli sağ əldir"[2].*

Allah taala zülm etməkdən çəkindirmiş və zalımlara əzab vəd edərək buyurmuşdur:

﴿ فَوَيْلٌ لِّلَّذِينَ ظَلَمُواْ مِنْ عَذَابِ يَوْمٍ أَلِيمٍ ﴾ (الزخرف:٦٥)

**"Acı bir günün *(qiyamət gününün)* əzabından vay o zülm edənlərin halına!" (əz-Zuxruf: 65).**

Digər bir hədisdə isə buyurmuşdur:

وقال ﷺ: «إن الله ليملي للظالم حتى إذا أخذه لم يفلته» رواه البخاري في صحيحه ومسلم

*"Allah taala zalıma möhlət verər. Cəza vaxtı gəldikdə isə onu buraxmaz"[3].*

---

[1] Əhməd: 5\ 25.
[2] Müslim: 3\ 1453\ № 1827.
[3] Buxari: 8\ 354. Müslim: 4\ 583\ № 1997.

Zülm əvvəlki ümmətlərin həlak olmasında əsas səbəblərdəndir. Zülmkarlığın geniş yayıldığı hər hansı dövlət dağılar və öz layiqli cəzasına yetişər. Allah taala buyurur:

﴿ وَكَذَٰلِكَ أَخۡذُ رَبِّكَ إِذَآ أَخَذَ ٱلۡقُرَىٰ وَهِيَ ظَٰلِمَةٌۚ إِنَّ أَخۡذَهُۥٓ أَلِيمٞ شَدِيدٌ ١٠٢ ﴾ (هود:١٠٢)

**"Rəbbin zülmkar məmləkətləri əzabla yaxalayanda belə yaxalayar. Onun cəzası, doğrudan da, ağrılı-acılıdır, şıddətlidir!" (Hud: 102).**

Alimlərdən biri deyir: "Ədalət hər işin idarəedicisidir. Əgər axirətlə heç bir əlaqəsi olmayan və sırf maddi niyyətlə hansısa dünya işi ədalət üzərində qurularsa o gerçəkləşər. Əks halda, işi görən adam mömin olsa belə o iş gerçəkləşməz".

Ən böyük ədalət Allah taalanın şəriətini tətbiq etmək, Onun buyurduğu qanunları həyata keçirmək və haqq sahiblərinə haqlarını yetişdirməkdir. Ən böyük zülm isə Allahın şəriətinə əhəmiyyət verməmək və həyatdan onu ayırmaqdır. Allah taala buyurur:

﴿ أَفَحُكۡمَ ٱلۡجَٰهِلِيَّةِ يَبۡغُونَ ﴾ (المائدة:٥٠)

**"Onlar Cahillik dövrünün hökmünümü istəyirlər?..." (əl-Maidə: 50).**

6. Birlik yaratmaq, parçalanmamaq:

Rəhbərin məsuliyyətlərindən bir də insanların fikrini toplamaq və onları parçalanmaqdan qorumaqdır. Bir olmaq İslam şəriətinin əsas qayələrindəndir. Allah taala buyurur:

﴿ وَٱعۡتَصِمُواْ بِحَبۡلِ ٱللَّهِ جَمِيعٗا وَلَا تَفَرَّقُواْ ﴾ (آل عمران:١٠٣)

**"Hamılıqla Allahın ipinə (dininə, Qurana) möhkəm sarılın və (firqələrə bölünüb bir-birinizdən) ayrılmayın!..." (Ali İmran: 103).**

7. Camaatla mülayim davranmaq və onları xeyirli işlərə yönəltmək.

Rəhbərin məsuliyyətlərindən biri də camaata qarşı mülayim olmaq və onlara xeyirli işləri məsləhət görməkdir.
Hədislərin birində buyurulur:

«اللهم من ولي من أمر أمتي شيئاً فشق عليهم فأشقق عليه، ومن ولي من أمر أمتي شيئاً فرفق بهم فارفق به» رواه مسلم

***"Ey Allahım! Ümmətimə rəhbərlik edən adam onların işini çətinləşdirsə Sən də onun işini çətinləşdir. Onların işini rahat edərsə, Sən də onun işini rahat et!"[1].***

Bəzi alimlər deyirlər: "Bu hədis insanların işini çətinləşdirməmək, rahatlaşdırmaq üçün gözəl xəbərdarlıqdır. Bu mənada hədislər həddindən artıq çoxdur".

Peyğəmbər ﷺ digər hədisdə buyurur:

«ما من عبد يسترعيه الله رعية من المسلمين فيموت وهو غاش لهم إلاّ حرم الله عليه الجنّة» رواه البخاري في صحيحه

***"Allah taalanın müsəlmanlar üzərində hakim etdiyi bir bəndə öz hakimiyyəti zamanı onları aldadarsa, Allah taala ona cənnəti haram edər"[2].***

Namaz qılan, cəzaları tətbiq edən və insanların haqlarını qoruyan saleh rəhbər ümmətin və ölkələrin islah edilməsi üçün əsas səbəbdir. Öz camaatını islah etməyə səy göstərən rəhbər zəmanəsinin ən yaxşı insanı və Allah taala yolunda döyüşən ən fəzilətlisi olar.

---

[1] Müslim: 3\ 1458\ № 1828.
[2] Buxari: 13\ 126.

Dediklərimiz İslam şəriətinin camaat üçün rəhbərlərə vacib etdiyi haqlardır.

**Ikinci: Camaata vacib edilən haqlar;**

Rəhbərin öz işini layiqincə yerinə yetirməsi üçün camaat rəhbərə qarşı olan münasibətlərini lazımi səviyyədə yerinə yetirməlidirlər. Çünki camaat bu işdə rəhbərlə ortaqdırlar. Kəab Əhbar demişdir: "İslamın, rəhbərin və camaatın misalı, çadır, dirək, ip və paya misalındadır. Çadır misalı İslam, dirək rəhbər, ip və payalar isə insanlarıdır. Bunların biri digərini tamamlayır".

Camaatın boynuna düşən haqlar bunlardır:

1. Eşitmək və itaət etmək:

Itaət etmək İslam şəriətində hökmün dayağı, onun qanunlarının əsasından biridir. İslam dininə görə rəhbərsiz camaat, itaətsiz isə rəhbər olmaz. Allah taala buyurur:

﴿ يَـٰٓأَيُّهَا ٱلَّذِينَ ءَامَنُوٓاْ أَطِيعُواْ ٱللَّهَ وَأَطِيعُواْ ٱلرَّسُولَ وَأُوْلِى ٱلْأَمْرِ مِنكُمْ ﴾ (النساء:٥٩)

**"Ey iman gətirənlər! Allaha, Peyğəmbərə və özünüzdən olan ixtiyar (əmr) sahiblərinə itaət edin! ..." (ən-Nisa: 59).**

Bu ayədə əmr sahiblərinə, rəhbərlərə itaətin vacibliyi vurğulanır, lakin bu itaətin keyfiyyəti açıqlanmır. Bunun açıqlaması hədislərdə qeyd edilir və deyilir ki, itaət yalnız qeyri asiliklərdə olur.

Ibn Əmər ﵁ Peyğəmbərin ﷺ belə buyurduğunu deyir:

«على المرء المسلم السمع والطاعة فيما أحب وكره إلا أن يؤمر بمعصية فإن أمر بمعصية فلا سمع ولا طاعة» رواه البخاري في صحيحه

*"Müsəlman bəndə sevdiyi və ya sevmədiyi işlərdə itaət etməlidir. Yalnız günah iş müstəsnadır. Günah olan bir iş[1] əmr edildikdə ona itaət etməməlidir"[1].*

---

[1] Əxlaqsızlıq, günahkarlıq, qiyam, üsyan. F.S.

Əbu Hureyrə رضي الله عنه Peyğəmbərin ﷺ belə buyurduğunu deyir:

«من أطاعني فقد أطاع الله، ومن عصاني فقد عصى الله، ومن أطاع الأمير فقد أطاعني، ومن يعص الأمير فقد عصاني» رواه البخاري في صحيحه ومسلم

***"Mənə itaət edən Allaha itaət edər, mənə asilik edən isə Allaha asilik edər. Əmirə (rəhbərə) itaət edən mənə itaət etmiş olar, əmirə (rəhbərə) asi olan mənə asi olar"[2].***

Hədis rəhbərlərə qeyri-asilikdə *(günah olmayan işlərdə)* itaət etməyin vacibliyini vurğulayır. Rəhbərlərə itaət etmək Allaha və rəsuluna itaət etməkdir. Bu məsələ əhli Sünnə və camaatın əqidəsinə görə vacibdir. Deyilən əqidə onları digər bidətçi firqələrdən fərqləndirən əsas cəhətdir.

Alimlərdən biri deyir: "Hədisdə rəhbərlərə itaət etməyin vacibliyi vurğulanır. Bu itaət asiliyi əmr etdikdə müstəsna sayılır. Rəhbərlərə itaət etməyin vacib edilməsində hikmət, camaatın sözünün bir olmasıdır. Çünki ixtilaf və təfriqədə fitnə-fəsad çoxdur".

2. Rəhbərlərin zülmünə qarşı dözmək və səbirli olmaq:

Rəhbər camaata qarşı dünya işlərində zülm etdikdə, yaxud haqlarını tapdaladıqda, öz nəfsini və ya tabeçiliyində olanların hansınınsa haqlarını digər insanlardan üstün tutduqda camaatın mövqeyi səbir etmək və bunun savabını Allahdan diləmək olmalıdır.

عن حذيفة بن اليمان رضي الله عنه قال: قلت: يا رسول الله إنا كنا بشرٍّ فجاء الله بخير، فنحن فيه فهل من وراء هذا الخير شرٌّ؟ قال: «نعم» قلت: هل وراء ذلك الشر خير؟ قال:

---

[1] Buxari: 13\ 121\ № 7144.

[2] Buxari: 13\ 111\ № 7137. Müslim: 3\ 1466\ № 1835.

رواه

مسلم

Huzeyfə Ibn əl-Yəman ﷺ deyir: Mən Peyğəmbərə ﷺ dedim: ***Ey Allahın Elçisi! Biz şər içərisində idik. Allah taala bizə xeyir göndərdi. Hal-hazırda biz o xeyrin içindəyik. Bəs bu xeyirdən sonra şər olacaqmı? Peyğəmbər ﷺ buyurdu: "Bəli". Mən dedim: Bəs o şərdən sonra xeyir olacaqmı? O buyurdu: "Bəli". Mən dedim: Bəs o xeyirdən sonra şər olacaqmı? O buyurdu: "Bəli". Mən dedim: Necə? O buyurdu: "Məndən sonra rəhbərlər olacaqlar. Onlar mənim yolumla getməyəcək, Sünnəmə əməl etməyəcəklər. Onların arasında qəlbi şeytan qəlbi olub insan cildində olan kişilər yetişəcəkdir" Mən dedim: Ey Allahın Elçisi! Mən onları görsəm nə edim? O buyurdu: "Sən Rəhbərin sözünü dinlə və ona itaət et. Hətta səni döyüb malını əlindən alsa da onu dinlə və ona itaət et"[1].***

Bu hədis məsələyə aid ən geniş və açıq hədisidir. Hədisdə Peyğəmbər ﷺ həmin rəhbərləri təsvir etmiş və demişdir ki, onlar mənim yolumla getməz, Sünnəmə əməl etməzlər. Bu əsl zəlalət və fəsad, inadkarlıq və azğınlığın sonudur. Həmin rəhbərlər nə özlərini, ailələrini, nə də tabeçiliyində olan camaatı Peyğəmbərin ﷺ yolu ilə aparmazlar. Bütün bunlara baxmayaraq Peyğəmbər ﷺ onlara, digər

[1] Müslim: 3\ 1476\ № 1847.

hədislərdə deyildiyi kimi, qeyri asilikdə itaət etməyi əmr etmişdir. Hətta onlar insanı döyüb malını əlindən alsalar yenə də onlara itaət etmək vacibdir. Onların bu hərəkətləri səni onlara itaətdən, əmrlərini eşitməkdən yayındırmasın. Çünki etdikləri zülm əməllər özlərinə qarşıdır. Qiyamət günü ona görə sorğu-sual olunacaq və cəzalanacaqlar. Əgər sən öz nəfsinin istəklərinə uyub şəriətin bu hikmətli qanununu başa düşməyib onu qəbul etməyib rəhbərinə qulaq asmasan və itaətsizlik göstərsən onda günah qazanacaqsan. Beləliklə qadağan olunmuş bir iş görəcəksən. Peyğəmbərin ﷺ yuxarıda qeyd edilən sözləri çox hikmətli və ədalətlidir. Əgər hər zərərçəkən insan itaətsizlik etsə onda getdikcə itaətsizlik artar, din və dünya məsləhətləri puça çıxar. Beləliklə, zülm bütün camaata yaxud onların çoxusuna yetişər, məmləkətlərdə ədalətsizlik baş alıb gedər və fitnə-fəsad hökm sürər.

Amma bir nəfərə zülm olunduqda səbir edər, savabını Allah taaladan diləyər, ona edilən zülmün qalxması üçün dua edər, bununla yanaşı rəhbərə itaət edərsə həm dini həm də dünyəvi problemləri yaranar. Ola bilsin Allah taala ona daha xeyirlisini nəsib etsin, yaxud axirətdə onun əvəzini versin. Bu da İslam şəriətinin əsl gözəlliklərindəndir. Çünki şəriət rəhbərlərin adilliklərinə deyil zülmlərinə qarşı itaət etməyi əmr etmişdir. Əgər itaət yalnız adillikdə olsaydı onda dünya hərc-mərcliklə dolardı. Allah taalanın lütfünə görə Ona həmd sənalar olsun.

3. Rəhbərə hörmət bəsləmək və yaxşılıq etmək.

Müaviyyə رضي الله عنه deyir:

لما خرج أبو ذر إلى الربذة لقيه ركب من أهل العراق فقالوا: يا أبا ذر قد بلغنا الذي صنع بك فاعقد لواءً يأتيك رجال ما شئت، قال: مهلاً يا أهل الإسلام فإني سمعت رسول الله ﷺ

السنة لابن أبي عاصم وصححه الألباني في ظلال الجنة

***"Əbu Zərr ﷺ Rəbzə deyilən yerə getdikdə İraqdan olan bir dəstə onun qarşısına çıxdılar və dedilər: Ey Əbu Zərr! Biz sənə qarşı edilənləri eşitmişik. Sən sadəcə olaraq bir çağırış et, istədiyin qədər kişi sənin köməyinə toplanar. Əbu Zərr ﷺ dedi: Ey müsəlmanlar! Tələsməyin, mən Peyğəmbərin ﷺ belə buyurduğunu eşitdim: "Məndən sonra sultan (rəhbər) olacaqdır. Ona hörmət edin. Kim ondan inciyib ona qarşı çıxarsa İslamda yeni cəbhə yaratmış olar. Vəziyyəti əvvəlki halına qaytarmayınca onun tövbəsi qəbul edilməz"[1].***

Əbu Bəkrə ﷺ Peyğəmbərin ﷺ belə buyurduğunu eşitmişdir:

وعن أبي بكرة ﷺ قال سمعت رسول الله ﷺ يقول: «من أكرم سلطان الله تبارك وتعالى في الدنيا أكرمه الله يوم القيامة، ومن أهان سلطان الله تبارك وتعالى في الدنيا أهانه الله يوم القيامة» سنن الترمذي ومسند الإمام أحمد وحسنه الألباني في سلسلة الأحاديث الصحيحة

***"Kim dünyada Allah taalanın sultanına yaxşılıq edərsə, Allah taala ona qiyamət günü yaxşılıq edər. Kim dünyada Allah taalanın sultanını təhqir edərsə, Allah taala də onu qiyamət günü təhqir edər"[2].***

Bu məsələ haqda deyilən dəlillərə baxdıqda görər ki, şəriət rəhbərlərə hörmət bəsləməyi və yaxşılıq etməyi əmr etmiş, onları

---

[1] İbn Əbu Asimin "Sünnə" kitabı: 2\ 499. Albani "Zilalul Cənnə" kitabı səh: 499-da hədisin səhih olduğunu qeyd etmişdir.
[2] Tirmizi: 4\ 535\ № 2224. Əhməd: 5\ 42. Albani "Silsilətus Səhihə" kitabı 5\ 376-da hədisin həsən olduğunu demişdir.

söyməyi və təhqir etməyi isə qadağan etmişdir. Çünki bunun böyük əhəmiyyəti vardır. Çünki böyük və əhəmiyyətli işləri həyata keçirmək üçün camaatın nəfsində rəhbərə qarşı hörmət olmalıdır. Rəhbərlərə qarşı çıxdıqda və ya onları təhqir etdikdə bu xüsusiyyətlər gerçəkləşməz.

Bu məqamda alimlərin biri deyir: "Insanlar rəhbərlərə və alimlərə hörmət etdikcə xeyir içərisində olarlar. Onlar bu iki qisim insanlara hörmət etsələr Allah taala onların həm dünyalarını, həm də axirətlərini islah edər. Onlara qarşı hörmətsizlik etsələr dünya və axirətlərini korlayarlar".

Digər alim rəhbərlərin haqlarını qeyd edərkən deyir: "Dördüncü haqq: ona ən böyük haqqını vermək, Allahın buyurduğuna uyğun olaraq ona hörmət etmək, vacib olan tərzdə hörmət və yaxşılıq etmək. Ona görə də böyük İslam alimləri rəhbərlərə hörmət edir və onların çağırışlarına cavab verirdilər. Bununla bərabər İslam alimləri Allahdan qorxar, zahidlik edər və rəhbərlərin malına göz dikməzdilər. Özlərini zahid hesab edərək rəhbərlərə qarşı hörmətsizlik edənlərin hərəkətləri Sünnəyə ziddir".

4. Müsəlman rəhbərləri söyməyin, onları aldatmağın və onlara nifrət etməyin haram olması.

Ənəs ﷺ deyir: "Bizim böyüklərimiz sayılan Məhəmmədin səhabələri belə deyirdilər: Peyğəmbər ﷺ buyurmuşdur:

«لا تسبوا أمراءكم ولا تغشوهم ولا تبغضوهم، واتقوا الله واصبروا فإن الأمر قريب»

***"Rəhbərlərinizi söyməyin, aldatmayın və onlara nifrət etməyin. Allahdan qorxun və səbir edin. Həqiqətən nicat yaxındadır".***

Qeyri müfəssəl qadağa, harama dəlalət edir. Bu "Üsulu fiqh" elmində bir qaydadır. Alimlərdən biri deyir: "Biz hətta zülmkar rəhbərlərimizə və hakimlərimizə qarşı çıxmağın, onlara qarşı bəd dua etməyin tərəfdarı deyilik. Həmçinin onlara itaətsizlik göstərməyi

də dəstəkləmirik. Onlara itaət etmək Allah taalaya itaətdir. Yalnız bir halda, Allaha asiliyi əmr etsələr o zaman onlara itaət etmirik. Onlar üçün islah edilmə və bağışlanma duaları edirik".

Digər alim bu məsələni təkid edərək deyir: "Bir kəsin rəhbərə qarşı bəd dua etdiyini görsən onun bidətçı olduğunu bil. Bir nəfərin isə rəhbərin islah edilməsi üçün dua etdiyini görsən bil ki o Peyğəmbərin ﷺ Sünnəsinə əməl edəndir, inşallah".

Bəzi alimlər deyirlər: "Əgər mənim dualarım qəbul edilsəydi ancaq rəhbər üçün dua edərdim".

Bizə zülm və haqsızlıq etmələrinə baxmayaraq onlara qarşı deyil, onların islah edilmələri üçün dua etmək əmr edilmişdir. Çünki onların zülm və haqsızlıqları özlərinə və müsəlmanlara yönəlir. Islah olunmaları da özləri və müsəlmanlar üçündür.

Alimlərin birindən rəhbər üçün dua etməkdən imtina edən kimsə haqda soruşulduqda belə demişdir: "Bu həmin adamın cahil və bəsirətsiz olduğundan irəli gəlir. Rəhbər üçün dua etmək Allah taalaya ən gözəl itaət və ibadət, Allah və bəndələri üçün edilən nəsihətdir. Peyğəmbərə ﷺ dovs qəbiləsinin asilik etmələri haqda xəbər verildikdə buyurmuşdur:

«اللهم اهد دوساً وأت بهم، اللهم اهد دوساً وأت بهم»

***"Allahım dovsə hidayət ver və onları gətir, Allahım dovsə hidayət ver və onları gətir!"***

Peyğəmbər ﷺ insanlar üçün xeyirli dua edərdi. Insanların xeyirli duaya ən layiqlisi, rəhbərdir. Çünki rəhbərin islah edilməsi ümmətin islahı deməkdir. Onun üçün dua etmək ən əhəmiyyətli dua və nəsihətdir".

Bəzi alimlər demişlər: "Rəhbəri söymək qırxandır. Bu qırxmaq saçı qırxmaq deyil, dini qırxmaqdır".

Kim rəhbərləri söyməyin və onları alçaltmağın Allahın dinindən, yaxud *(Nəhyun anil munkər)* pis işlərdən çəkindirməkdən

olduğunu zənn edirsə, həqiqətən o zəlalətə düşmüşdür. Belə halda o, Allaha, Onun şəriətinə haqsızlıq etmiş olar. Hətta belə halda o, Quran, Sünnə və ümmətin sələfinə qarşı müxaliflik etmiş olur.

Alimlərdən biri deyir: "Elm, din və fəzilət sahibləri heç kəsə Allahın qadağan etdiyi işlərdə: rəhbərlərə asilik etmək, onları aldatmaq və hər hansı vəchlə onlara qarşı çıxmaq – rüxsət vermir. Bu qədimdə və indi də Sünnə və din sahiblərinin ədəb-ərkanlarından bir nümunədir".

Rəhbərlərin namuslarına toxunmaq, onları söymək və eyiblərini açmaqla məşğul olmaq böyük xəta və iyrənc cinayətdir. Pak şəriət belə əməllərdən çəkindirmiş və edənləri də pisləmişdir.

Belə əməllər rəhbərlərə qarşı çıxmağın toxumlarıdır. Rəhbərlərə qarşı çıxmaq isə din və dünya fəsadının əsası deməkdir.

5. Rəhbərlərə nəsihət etmək:

Rəhbər bəşər olduğu üçün o da digərləri kimi zəiflik, xəta, unutmaq, zülm və s. əməllər edə bilər. Elə bu səbəbdən ona nəsihət etmək və haqqı çatdırmaq onun haqqıdır. Bu haqq, rəhbərin camaat üzərində olan haqlarındandır. Ona görə də nəsihət İslam şəriətinin əsaslarından biridir. Hədislərin birində Peyğəmbər ﷺ buyurmuşdur:

أن النبي ﷺ قال: «الدين النصيحة.....» صحيح مسلم

"Din nəsihətdir..."[1].

Rəhbərlərə nəsihət etmək dini vacibatlardandır. Lakin bunun məsuliyyəti *elmə dərindən yiyələnmiş müdrik alimlərin üzərinə düşür*. Həmçinin bu nəsihət ikisinin, rəhbərlə nəsihət edənin arasında olmalıdır. Belə etmək və onlara qarşı mehriban, mülayim, itaətli və dost olmaq onların haqqı qəbul etmələri üçün daha rahatdır.

Ona görə Peyğəmbərin ﷺ hədisində buyurulur:

---

[1] Müslim: 1\ 74\ № 55.

«من أراد أن ينصح لذي سلطان فلا يبديه علانية، وليأخذ بيده فإن سمع منه فذاك وإلا كان أدّى الذي عليه». السنة لابن أبي عاصم ومسند الإمام أحمد وصححه الألباني في ظلال الجنة

***"Kim rəhbərə nəsihət etmək istəyirsə nəsihətini aşkarda etməsin. Öz nəsihətini sakitcə ona çatdırsın. Əgər ondan qəbul etsə istəyinə çatar, əks halda isə boynuna düşəni yerinə yetirmiş olar"[1].***

Hədis sübut edir ki, rəhbərlərə edilən nəsihət, minbərlərdə, jurnallarda, qəzetlərdə, məclislərdə, məscidlərdə və aşkarlıqda deyil, gizlidə olur. Əks halda bu nəsihət sayılmır. Sən belə nəsihət edənlərlə qürurlanma. Belə nəsihət hətta yaxşı niyyətlə olsa da Sünnəyə müxalif sayılır.

Rəhbərlərə edilən nəsihət onların heybətini qoruyub saxlamalıdır ki, hər adam onlara qarşı cürət etməsin və ya bundan istifadə edib onları alçaltmasın.

Ziyad İbn Kuseyb əl-Ədəvi deyir: Bir dəfə Əbu Bəkrə ﵁ ilə Ibn Amirin minbərinin yanında idim. O minbərin üstündə xütbə verirdi. Onun əynində nazik paltar var idi. Əbu Bilal *(bu adam xəvariclərdən biri idi. Onun adı Mirdas İbn Ədyə idi)* dedi: Bizim əmirimizə baxın, fasiq libası geyinmişdir. Bu zaman Əbu Bəkrə ﵁ dedi: Səsini kəs. Mən Peyğəmbərin ﷺ belə buyurduğunu eşitmişəm:

«من أهان سلطان الله في الأرض أهانه الله». سبق تخريجه

***"Kim (dünyada) Allah taalanın sultanını təhqir edərsə, Allah taala də onu (qiyamət günü) təhqir edər"[2].***

---

[1] İbn Əbi Asimin "Sünnə" kitabı: 2\ 507. Əhməd: 3\ 403. Albani "Zilalul Cənnə" kitabı səh: 507-də hədisin səhih olduğunu qeyd etmişdir.
[2] Tirmizi: 4\ 535\ № 2224. Əhməd: 5\ 42. Albani "Silsilətus Səhihə" kitabı 5\ 376-da hədisin həsən olduğunu demişdir.

Alimlərdən bir demişdir: "Rəhbərlə gizlidə söhbət *(nəsihət)* etmək, açıqda söhbət *(nəsihət)* etməkdən yaxşıdır. Hətta yalnız ikisi olduqları halda gizlində ona nəsihət etməsi daha xoşdur".

Nəsihət zamanı kobud və acıqlı danışıqdan çəkinmək lazımdır. Əslində bu, Qurani Kərim üslubudur. Allah taala Musa və Harunu ən kafir bir insanla danışmağa göndərdikdə belə buyurmuşdur:

﴿ فَقُولَا لَهُۥ قَوۡلٗا لَّيِّنٗا لَّعَلَّهُۥ يَتَذَكَّرُ أَوۡ يَخۡشَىٰ ﴿٤٤﴾ ﴾ (طـه:٤٤)

**"Onunla yumşaq danışın. Bəlkə, öyüd-nəsihət qəbul etsin, yaxud (Rəbbindən) qorxsun!" (Taha: 44).**

Bir kişi xəlifələrin birinə: "Mənə qulaq as gör sənə nə deyirəm!" - dedikdə, xəlifə ona kobudcasına dedi: "Mənim sənin sözünə ehtiyacım yoxdur. Sən Musa və Harundan xeyirli deyilsən. Mən isə Firon kimi kafir deyiləm. Allah taala buyurmuşdur: **"Onunla yumşaq danışın. Bəlkə, öyüd-nəsihət qəbul etsin, yaxud *(Rəbbindən)* qorxsun!" (Taha: 44).**

Alimlərdən biri deyir: "Rəhbərin xəta etdiyini görən adam ona aşkarda deyil, gizlidə nəsihət etməlidir. Hədisdə deyildiyi kimi onun əlindən tutub gizli bir yerdə ona nəsihət versin və Allahın sultanını alçaltmasın. Biz tarix kitabının əvvəlində qeyd etmişdik ki, rəhbərlərin nə dərəcədə zülm etmələrindən asılı olmayaraq onlara qarşı çıxmaq olmaz".

Alimlərdən digər biri deyir: "Sələfin minhəcinə *(metoduna)* görə rəhbərlərin eyiblərini aşkarda demək olmaz. Çünki belə etmək inqilaba, itaətsizliyə, onlara qarşı çıxmağa gətirib çıxarır. Bunların heç biri xeyir gətirən əməllər deyildir. Sələfin minhəcinə *(metoduna)* görə rəhbərlərə gizli şəkildə nəsihət etmək lazımdır. Onlara məktub da yazmaq olar. Yaxud rəhbərlərlə sıx əlaqəsi olan alimlərə öz şikayətini çatdırmaq olar ki, onlar da rəhbərə bu işdə nəsihət etsinlər".

Başqa bir alim deyir: "Allah xətrinə! Rəhbərlərə münasibət haqda sələfin minhəcini başa düşün. Rəhbərin xətalarına görə insanları ona qarşı çıxardıb qəlblərində kin oyatmayın. Bu fəsad törətməyin və insanlar arasına fitnə salmağın lap özüdür".

Alimlərin insanlara etdikləri nəsihət haqda danışmaları şərt deyil. Bu həm alim, həm də rəhbər üçün yaxşı deyildir. Iki səhih kitabda *(Buxari və Müslimdə)* Usamə İbn Zeydə ﵁ deyirlər:

(ألا تدخل على عثمان لتكلمه فقال: أترون أني لا أكلمه إلا أُسمعكم، والله لقد كلمته فيما بيني وبينه) . رواه البخاري في صحيحه ومسلم

***Sən Osmana nəsihət etməyəcəksənmi? Usamə dedi: "Siz deyirsiniz ki, mən hər dəfə ona nəsihət edərkən sizə xəbər verməliyəm? Allaha and olsun mən ona öz aramızda nəsihət etmişəm"[1].***

Bir nəfər alimlərin birinə deyir: "Ey İmam! Allah taala alimlərdən haqqı söyləmələri və davam etdirmələri üçün əhd almışdır. Siz bu rəhbərlərə nəsihət edə bilmirsiniz? Alim ona dedi: Məgər hər dəfə onlara nəsihət etdikdən sonra gəlib bu haqda sizə deməliyəm".

Diqqət yetiriləsi bir mühüm məsələ də vardır. Bilmək lazımdır ki, günümüzdə olan rəhbərlərlə raşidi xəlifələri, Müaviyə, Ömər İbn Əbdül Əziz, Harun ər-Rəşid və ya İslam tarixində hansısa xəlifə ilə bərabər tutmaq düzgün deyil. Hər bir zamanın özünə uyğun dövləti və şəxsiyyətləri olur. Kim əvvəlkilərlə indikilər arasında bir fərq qoymursa ona Əli İbn Əbu Talibin ﵁ hadisəsini xatırlatmaq lazımdır. Bir kişi Əmirəlmöminin Əli Ibn Əbu Talibə ﵁ deyir: Ey Əmirəlmöminin! Nə üçün Əbu Bəkr və Ömərin işləri yaxşı gedirdi. Osman ilə sənin işlərin isə yaxşı getmir? Əli ﵁ ona dedi:

[1] Buxari: 6\ 331\ № 3267. Müslim: 4\ 2290\ № 2989.

"Çünki Əbu Bəkr və Ömərə itaət edənlər mən və Osman idik, mənə və Osmana itaət edənlər isə sən və sənin kimilərdir".

Dəyişiklik yalnız rəhbərlər tərəfindən deyil, camaat tərəfindən də olmalıdır. Ağıllı insan özünə baxsın və özü naqis olduğu halda başqalarından kamillik tələb etməsin. Misal var deyərlər: "öz gözündə çöpü görmür, başqasının gözündə tir axtarır". Rəhbərlərə gizlidə edilən təmiz niyyətli nəsihətlər İslam ümməti üçün xeyirli nəticə verər. Nəsihət inqilab və ya üsyanda deyildir. Belə hərəkətlər İslam ümmətinə deyil, onların düşmənlərinə xidmət edir. Çünki belə vəziyyətlərdə sıravi insanlar zərər çəkir, əmin-amanlıq pozulur və fitnə-fəsad olur.

6. Nəsihəti dinləməyən müsəlman rəhbərə qarşı üsyan etməmək.

Ümmətin rəhbərlərinə qarşı çıxmaq, onlara silah qaldırmaq və hakimiyyət davası aparmaq, qiblə əhlinə qarşı qılınc qaldırmağı halal görən xəvariclər və digər bidət və zəlalət əhlinin əməllərindəndir.

Rəhbərlərin, küfr dərəcəsinə çatmayan günahlar etmələri onlara qarşı çıxmaq üçün əsas deyildir. Ən gözəl yol rəhbərlərə itaət etmək, onlarla çiyin-çiyinə döyüşmək, etdikləri zülmə və haqsızlığa qarşı səbirli olmaqdır. Namaz qılıb, dinin əsaslarını yerinə yetirdikləri bir halda, günahlar işlətsələr və fasiqlik etsələr yenə də onlara itaət edilməlidir. Bu əhli Sünnə və camaatın əsas qaydalarından biridir. Onlar deyirlər: "Asi və ya müti rəhbərə asilik etmək olmaz. Yalnız bir halda, Allaha qarşı asi olmağı tələb etdikdə ona itaət edilmir".

Ibn Abbasdan ﵁ gələn rəvayətdə Peyğəmbərin ﷺ belə buyurduğu deyilir:

«من رأى من أميره شيئاً يكرهه فليصبر عليه فإنه من فارق الجماعة شبراً فمات إلاَّ مات ميتة جاهلية» . رواه البخاري في صحيحه ومسلم

*"Kim öz rəhbərindən xoşagəlməz bir hərəkət görsə, ona qaşı səbr etsin. Həqiqətən kim camaatdan bir qarış aralanıb ölərsə, cahil kimi ölər"[1].*

وعن جنادة بن أبي أمية قال: دخلنا على عبادة بن الصامت ﵁ وهو مريض فقلنا حدثنا أصلحك الله بحديث ينفع الله به سمعته من رسول الله ﷺ فقال: دعانا رسول الله ﷺ فبايعنا فكان فيما أخذ علينا أن بايعنا على السمع والطاعة في منشطنا ومكرهنا وعسرنا ويسرنا، وأثرة علينا، وأن لا ننازع الأمر أهله قال: «إلا أن تروا كفراً بواحاً عندكم من الله فيه برهان» . رواه البخاري في صحيحه ومسلم.

***Cunadə Ibn Əbu Uməyyə deyir: Ubadə İbn əs-Samit ﵁ xəstə olarkən onun yanına daxil olduq və dedik: Allah sənə şəfa versin! Bizə Peyğəmbərdən ﷺ eşitdiyin bir hədis danış, bəlkə Allah taala onunla bizə fayda verər. O dedi: "Peyğəmbər ﷺ bizi çağırdı və biz də ona beyət etdik. Bizə isə bunlar tapşırıldı: rahat və çətin anlarda, haqqımız tapdalandığı halda eşitmək və itaət etmək. Hakimiyyət uğrunda çalışmamaq. Yalnız bir halda, rəhbərdən əlinizdə Allah tərəfindən aydın dəlili olan açıq-aşkar küfr gördüyünüz zaman"[2].***

[1] Buxari: 5\ 13\ № 7054. Müslim: 3\ 1477\ № 1849.
[2] Buxari: 13\ 192\ № 7199. Müslim: 3\ 1470\ № 1709.

Alimlərdən biri deyir: "Hədisin mənasına görə *(küfr olub olmaması)* ehtimal ediləcək əməllərə görə rəhbərə qarşı üsyan etmək olmaz".

Bəzi alimlər deyirlər: "Hədisin mənası: Rəhbərlərlə hakimiyyət uğrunda mübarizə aparmayın, onlara qarşı etiraz etməyin. Yalnız bir halda, onlardan İslam dininin əsaslarına əsasən münkər bir iş görsəniz həmin münkər işi onlara inkar edin və hər zaman haqqı deyin. Onların fasiq və zalımlığından asılı olmayaraq onlara qarşı üsyan etmək və döyüşmək yekdilliklə haramdır. Bu mənada hədislər həddindən artıq çoxdur. Əhli Sünnə alimləri yekdilliklə deyirlər ki, rəhbəri fasiqliyinə görə dəyişmək olmaz".

Ovf Ibn Malik ﷺ Peyğəmbərin ﷺ belə buyurduğunu deyir:

«ألا من ولي عليه وال فرآه يأتي شيئاً من معصية الله فليكره الذي يأتي من معصية الله ولا ينزع يداً من طاعة» . رواه مسلم

***"Kim onlara təyin edilmiş rəhbərin Allaha asilik etdiyini görərsə, onun etdiyi asiliyə ikrah etsin, amma ona itaətdən boyun qaçırmasın"[1].***

Qeyd etdiyimiz bu və digər hədislər rəhbərləri dinləməyi və onlara itaət etməyin vacibliyini bildirir və onlara qarşı çıxmağın haramlığını açıqlayır. Nəsihəti dinləmədikləri halda onlara itaətsizlik etmək olmaz. Əksinə, səbr etmək və bütün çətinliklərə dözmək böyük fitnə-fəsadın, din və dünyanı korlayan fəsadın, üsyanın qarşısını alır.

Alimlərdən digəri isə deyir: "Zalım rəhbərə qarşı döyüşmək və üsyan etmək halal olmaz".

Başqa alim deyir: "Zalım rəhbərə itaət etməyin vacibliyinin səbəbi: onlara qarşı üsyan etməyin zülmlərindən də çox fitnə-fəsada

[1] Müslim: 3\ 1482\ № 1855.

səbəb olmasıdır. Əslində onların zülmünə səbr etmək günahların bağışlanmasına və savabların artmasına səbəbdir. Onların bizim üstümüzdə rəhbər olmaları bizim əməllərimizin fəsadlı olmasından irəli gəlir. Çünki cəza əməlin növündəndir. Ona görə də biz Allah taaladan çoxlu bağışlanma diləməli, Ona tövbə etməli və əməllərimizi islah etməliyik". Allah taala buyurur:

﴿ وَمَآ أَصَـٰبَكُم مِّن مُّصِيبَةٍ فَبِمَا كَسَبَتْ أَيْدِيكُمْ وَيَعْفُواْ عَن كَثِيرٍ ﴿٣٠﴾ ﴾

(الشورى:٣٠)

**"Sizə üz verən hər bir müsibət öz əllərinizlə qazandığınız günahların *(etdiyiniz əməllərin)* ucbatındandır! *(Bütün bunlara baxmayaraq)* Allah *(günahlarınızın)* çoxunu əfv edər." (Əş-Şura: 30).**

﴿ وَكَذَٰلِكَ نُوَلِّى بَعْضَ ٱلظَّـٰلِمِينَ بَعْضًۢا بِمَا كَانُواْ يَكْسِبُونَ ﴿١٢٩﴾ ﴾ (الأنعام:١٢٩)

**"Beləliklə, qazandıqlarına *(qazandıqları günahlara)* görə zalımların bəzisini digərinin arxasına taxaraq *(və ya pis işləri bir yerdə gördükləri üçün qiyamət gününün əzabından onları bir-birinə)* belə yaxınlaşdırarıq." (əl-Ənam: 129).**

Əgər camaat rəhbərin zülmündən xilas olmaq istəyirlərsə özləri zülmdən əl çəkməlidirlər.

Alimlərdən biri deyirdi: "Həccac İbn Yusif Allahın əzabıdır. Allahın əzabını öz əllərinizlə aparmayın. Siz Allaha dua edin və Onun qarşısında əyilin. Çünki Allah taala buyurur:

﴿ وَلَقَدْ أَخَذْنَـٰهُم بِٱلْعَذَابِ فَمَا ٱسْتَكَانُواْ لِرَبِّهِمْ وَمَا يَتَضَرَّعُونَ ﴿٧٦﴾ ﴾ (المؤمنون:٧٦)

**"Biz həqiqətən, onları əzabla yaxaladıq, lakin onlar yenə öz Rəbbinə itaət etmədilər, *(Ona)* yalvarıb-yaxarmadılar *(iman gətirmədilər ki, gətirmədilər)*." (əl-Muminun: 76).**

Alimlərdən digəri bu məsələni təkid edərək buyurur: "Bütün bunlar Peyğəmbərin ﷺ zalım rəhbərlərə qarşı səbr etmək, onlara qarşı üsyan etməmək əmrləri bəndələrin həm dünya, həm də

axirətləri üçün daha xeyirli olduğunu bildirir. Kim buna bilərəkdən və ya səhvən müxalif olarsa öz əməli ilə islah etməz, əksinə fəsad törədər. Ona görə Peyğəmbər ﷺ Həsəni bu sözlərlə tərifləmişdir:

«إن ابني هذا سيد، وسيصلح الله به بين فئتين عظيمتين من المسلمين»

*"Mənim bu oğlum seyiddir. Allah taala onun əli ilə iki böyük müsəlman dəstəni birləşdirəcəkdir".* Peyğəmbər ﷺ heç vaxt rəhbərlərə qarşı üsyan edənləri və fitnə-fəsad çıxararaq döyüşənləri tərifləməmişdir. Heç vaxt itaətsizlik etməyi və camaatdan ayrılmağı bəyənməmişdir. Peyğəmbərdən ﷺ rəvayət olunan bütün səhih hədislər bu məna üzərində təkid edir".

Bəzi alimlər deyirlər: "Əgər münkəri inkar etmək *(pis işdən çəkindirmək)* daha da pis işə, Allaha və Onun Peyğəmbərinə qarşı qəzəbə səbəb olacaqsa, belə halda onu inkar etmək düzgün deyildir. Rəhbərlərin etdikləri pis işləri inkar etməklə onlara qarşı üsyana qalxmaq buna bir misaldır. Üsyan, dünyanın sonuna qədər hər bir şərin və fitnənin əsası olaraq qalmaqdadır. İslam ümmətinin başına gəlmiş kiçik və böyük fitnələrə nəzər salan adam həmin hadisələrin səbəbini deyilən əsasa riayət edilmədiyindən baş verdiyini görər. Pis işlərə qarşı səbirsizlik edərək onu inkar etmək istəyərkən onun nəticəsində ondan da böyük pis iş meydana çıxar".

Münkəri *(pis işi)* daha da pis işlə inkar etmək yol verilməzdir.

Rəhbərlərə qarşı çıxmaq şərdir və onda heç bir xeyir yoxdur. Çünki bunun nəticəsində daha böyük fitnələr, müsəlmanların qanlarını haqsız yerə axıtmaq, onların birliklərini pozmaqla fitnə və şər meydana çıxır.

Aqillər demişlər: "Altmış il zalım sultanla yaşamaq bir gecə sultansız yaşamaqdan xeyirlidir".

İslam tarixi boyu rəhbərlərə qarşı üsyanlar nahaq yerə qan axıtmaq, kin-küdurət yaratmaq, zalımlığı daha da artırmaq, ümməti cihaddan, kafir və münafiq düşmənlərə qarşı mübarizə aparmaqdan

yayındırmaqdan başqa bir nəticə verməmişdir. Bununla yanaşı ümmətin bütün gücünün bu fitnəyə sərf edilməsi, iqtisadiyyatın zəifləməsi kimi digər zərərləri də olur. Xoşbəxt insan başqasının nəsihətini dinləyəndir, bədbəxt isə öz nəfsinə uyandır.

Alimlərdən biri bu məsələni təkid edərək deyir: "Hakimiyyətə sahib olan rəhbərə qarşı çıxanların çoxu öz əməlləri ilə fitnə-fəsaddan başqa bir şeyə nail olmamışlar".

Müsəlman, Allaha asilikdən başqa hər bir əmrdə öz rəhbərini eşitməli və ona itaət etməlidir. Bilmək lazımdır ki, rəhbərlərin zülmünə səbr etmək dinin əsas prinsiplərindən, nəsihətçi alimlərin tövsiyələrindəndir. Həmçinin bilmək lazımdır ki, rəhbərlərə itaət ən gözəl ibadətlərdən və ən əfzəl itaətlərdəndir. Bu rəhbərlərin zalım və ya adil olmalarından asılı deyildir. Əsas odur ki, onlar müsəlman olsunlar. Bu, onlara itaət etmək üçün yetərlidir. Allahın və rəsulunun əmrlərini və qadağalarını buyurduqda onlara itaət edilir. Belə halda Allahdan savab diləyərək, Onun razılığını qazanmaq və əzabından qorunmaq üçün belə etmək lazımdır.

Sözümün sonunda demək istəyirəm ki, rəhbər ilə camaat arasında olan əlaqələr qarşılıqlı əlaqələrdir. İslah etmək və dəyişiklik aparmaq hamıdan tələb olunur. Allah taala buyurur:

﴿إِنَّ ٱللَّهَ لَا يُغَيِّرُ مَا بِقَوۡمٍ حَتَّىٰ يُغَيِّرُواْ مَا بِأَنفُسِهِمۡ﴾ (الرعد: ١١)

**"Hər hansı bir tayfa öz tövrünü (nəfsində olanları) dəyişmədikcə (pozmadıqca), Allah da onun tövrünü (onda olanları, onun əhvalını) dəyişməz..." (ər-Rəd: 11).**

Cəza əməlin cinsindən olduğu üçün, siz necə olsanız, sizin rəhbərləriniz də sizə uyğun olacaqdır.

İnsanlar iki qismə bölünürlər: rəhbərlər və itaət edənlər. Rəhbərlərin haqqı onlara nəsihət etməkdir, itaət edənlərin haqları isə camaatla bir olmaqdır. Çünki onların xeyirləri yalnız birlikdədir.

Onlar heç vaxt zəlalət üzərində birləşməzlər. Onların din və dünya rahatlığı birlikdə və hamılıqla Allahın ipindən sıx tutmaqdadır.

# Yeddinci fəsil: İslamın gözəl əxlaqa çağırışının gözəllikləri;

Bu dinin gözəlliklərindən biri də gözəl əxlaqa, yüksək ədəbə dəvət etməsi, pis əxlaq və xüsusiyyətlərdən isə çəkindirməsidir. Bu din kamil din olduğundan, şəriət və ağıl baxımından bəyənilən hər şeyi özündə cəm etmişdir. Həmçinin fərdlər və toplumlar üçün məsləhətli və xeyirli olanları da özündə toplamışdır. Bu dinə iman gətirib, ehkamlarına riayət edən hər kimsəyə Islam gözəl həyat bəxş edər. Allah taala buyurur:

﴿ مَنْ عَمِلَ صَٰلِحًا مِّن ذَكَرٍ أَوْ أُنثَىٰ وَهُوَ مُؤْمِنٌ فَلَنُحْيِيَنَّهُۥ حَيَوٰةً طَيِّبَةً ۖ وَلَنَجْزِيَنَّهُمْ أَجْرَهُم بِأَحْسَنِ مَا كَانُوا۟ يَعْمَلُونَ ﴿٩٧﴾ ﴾ (النحل:٩٧)

"**Mömin olub yaxşı işlər görən** *(Allaha itaət edən)* **kişi və qadına** *(dünyada və axirətdə)* **xoş həyat nəsib edəcək və etdikləri yaxşı əməllərə görə mükafatlarını verəcəyik.** *(Və ya gördükləri yaxşı işlərin əvəzində onlara daha yaxşı mükafatlarını verəcəyik!)*" **(əh-Nəhl: 97).**

Bu ayədə Allah taala dinə riayət edən kişi və qadınlara dünyada xoş həyat, axirətdə isə etdiyi əməllərin bol savabını vəd edir. Yaxşı həyat hərtərəfli rahatlığı əhatə edir. Gözəl əxlaqa yiyələnmək xoşbəxt həyatın səbəblərindəndir. Hikmətli insanların bildiyinə görə insanın əxlaqı kamilliyə doğru getdikcə onun həyatı daha rahat və ləzzətli olar.

Bu şəriət, müsəlman ictimaiyyətinin bir-birlərinə qarşı mərhəmətli, şəfqətli, mehriban olmalarını öyrətmək, onların bədəninin bir üzvü ağrıyarkən digərinin ona cavab verdiyi bir bədən kimi olduqlarını çatdırmaq, bir-birini möhkəm saxlayan bina divarı kimi olmalarını çatdırmaq üçün gəlmişdir. Bu mənada Qurani Kərimdə belə bir ayə vardır. Allah taala buyurur:

﴿ إِنَّمَا ٱلْمُؤْمِنُونَ إِخْوَةٌ فَأَصْلِحُواْ بَيْنَ أَخَوَيْكُمْ ۚ وَٱتَّقُواْ ٱللَّهَ لَعَلَّكُمْ تُرْحَمُونَ ﴾ (الحجرات: من الآية١٠)

**"Həqiqətən, möminlər *(dində)* qardaşdırlar. Buna görə də *(aralarında bir mübahisə düşsə)* iki qardaşınızın arasını düzəldin və Allahdan qorxun ki, bəlkə, *(əvvəlki günahlarınız bağışlanıb)* rəhm olunasınız!" (əl-Hucurat: 10).**

Həmçinin bu şəriət kasıb, fağır, miskin, yetim, aciz kimi zəiflərə qarşı mərhəmətli olmağı, böyüklərə, fəzilətli və elmli adamlara hörmət etməyi əmr etmişdir. Bu şəriət, müsəlman cəmiyyətlərin gözəl və xoşbəxt həyat yaşamaları üçün, cəmiyyətin hər bir fərdinə nəzər salıb, hüquqlarını onlara bildirməyi əmr edən kamil düsturdur.

Allah taala Peyğəmbəri Məhəmmədi ﷺ təkəbbürlük, zalımlıq, düşmənçilik və yekəxanalıq edən Cahillik dövrü cəmiyyətinə göndərmişdir. O, bu sifətlərin hamısını rədd edib onları gözəl və misli olmayan əxlaqla əvəz etmişdir. Həmçinin onlarda olan bəzi gözəl əxlaq keyfiyyətləri olan qeyrət, hamilik, vəfalılıq kimi xüsusiyyətləri isə tamamlamışdır. Peyğəmbər ﷺ gözəl əxlaqı ən başlıca vəzifə, mühüm qayə edən bir din ilə göndərilmişdir. Onun şəriətinə görə əxlaqı yüksələn insanın imanı da bir o qədər yüksələr. Peyğəmbər ﷺ buyurmuşdur:

«أَكْمَلُ الْمُؤْمِنِينَ إِيمَانًا أَحْسَنُهُمْ خُلُقًا» . رواه أبو داود في سننه والترمذي في سننه وقال: هذا حديث حسن صحيح.

*"Möminlərin ən kamil imanlısı, gözəl əxlaqa sahib olanlarıdır"*[1].

[1] Əbu Davud: 5\ 60\ № 4682. Tirmizi: 3\ 466\ № 1162. Tirmizi, bu hədisin həsənun səhih olduğunu demişdir.

Peyğəmbər ﷺ insanlar arasında ən kamil iman və ən gözəl əxlaqa sahib olandır. Rəbbi onu tərifləyərək buyurmuşdur:

﴿ وَإِنَّكَ لَعَلَىٰ خُلُقٍ عَظِيمٍ ﴾(القلم:٤)

**" Şübhəsiz ki, sən böyük bir əxlaq üzərindəsən!" (əl-Qələm: 4).**

Peyğəmbərin ﷺ belə olmasına səbəb, onun Qurani Kərimdə buyurulan gözəl sifətlərə, xüsusiyyətlərə və fəzilətlərə yiyələnməsi, qadağan edilmiş pis və kobud xüsusiyyətlərdən əl çəkməsi olmuşdur. Ona görə də ona ən yaxın olub, onu gözəl tanıyan zövcəsi Aişədən رضي الله عنها Peyğəmbərin ﷺ əxlaqı haqda soruşulduqda belə demişdir:

(كَانَ خُلُقُهُ الْقُرْآنَ) . رواه مسلم ضمن حديث طويل .

**"Onun əxlaqı Quran idi"**[1]**.**

Yəni, o Quranda buyurulan ədəb-ərkan, əmr və qadağalara riayət edərdi. Peyğəmbərin ﷺ Quranda buyurulan hər hansı bir (digər) peyğəmbərin gözəl əxlaqı xüsusiyyətlərinə, gözəl əxlaqa yiyələnməsi, bütün qadağalardan çəkinməsi məsələni daha da açıqlayır.

İslam ədəbi və əxlaqı özünün orta mövqeyi və ədaləti ilə digərlərindən fərqlənir. O yerində mərhəmət və şəfqəti əmr edir, lazımi məqamlarda, cəza tədbirlərini tətbiq edərkən, Allah yolunda cihad edərkən və s. - vaxtlarda isə qətiyyətli olmağı tələb edir. Nəfsə görə qəzəblənməyi qadağan edir, pis əməllərin şahidi olduğu zaman Allah xatirinə qəzəblənməyi tələb edir. Allahın Öz kitabında və Peyğəmbərinin ﷺ Sünnəsində bizə çatdırdığı bütün işlərdə belə olmaq lazımdır. Allah taala buyurur:

﴿ إِنَّ هَٰذَا ٱلْقُرْءَانَ يَهْدِى لِلَّتِى هِىَ أَقْوَمُ ﴾ (الإسراء:٩)

---

[1] Müslim: 1\ 513\ № 746.

**"Həqiqətən, bu Quran (bütün bəşəriyyəti) ən doğru yola (İslama) yönəldir, ..." (əl-İsra: 9).**

Allah taala Öz kitabı Quranın ən gözəl, adil və doğru yola dəvət etdiyini vurğulayır. Bu, bütün işlərdə, ibadətlərdə, əlaqələrdə, ədəb və əxlaqda öz əksini tapır.

Bu din insanları ən gözəl əxlaqa səsləyir. Elə bir gözəl əxlaq və ya xüsusiyyət yoxdur ki, İslam şəriəti onun yerinə yetirilməsini tələb etməsin. Həmçinin elə bir şər və pis sifət yoxdur ki, İslam şəriəti ondan çəkindirməsin. Hətta bu din ən gözəl əxlaqı imanın əsaslarından biri etmiş və belə əxlaqa yiyələnənin ən kamil iman sahibi və başqalarından daha üstün olduğunu buyurmuşdur. Bu yerdə Peyğəmbər ﷺ buyurmuşdur:

«أَكْمَلُ الْمُؤْمِنِينَ إِيمَانًا أَحْسَنُهُمْ خُلُقًا» . رواه أبو داود في سننه والترمذي في سننه وقال: هذا حديث حسن صحيح.

*"Möminlərin ən kamil imanlısı, gözəl əxlaqa sahib olanlarıdır"*[1].

İndi isə sənə İslamın təşviq etdiyi ən gözəl əxlaq nümunələrindən bəzilərini xatırladaq.

**Doğruluq *(Sidq, sadiqlik)*:**

Doğru olmağı tələb etmək, ona təşviq etmək, doğruları tərifləmək və onlara gözəl aqibət vəd etmək bu dinin gözəlliklərindəndir. Allah taala buyurur:

﴿ يَـٰٓأَيُّهَا ٱلَّذِينَ ءَامَنُوا۟ ٱتَّقُوا۟ ٱللَّهَ وَكُونُوا۟ مَعَ ٱلصَّـٰدِقِينَ ﴾ (التوبة:١١٩)

---

[1] Əbu Davud: 5\ 60\ № 4682. Tirmizi: 3\ 466\ № 1162. Tirmizi, bu hədisin həsənun səhih olduğunu demişdir.

**"Ey iman gətirənlər! Allahdan qorxun və** ***(imanında, sözündə, işində)*** **doğru olanlarla olun!** ***(Peyğəmbər və onun sadiq əshabələri ilə birlikdə olun!)*" (ət-Tövbə: 119).**

Peyğəmbər ﷺ buyurmuşdur:

وقال ﷺ: «عَلَيْكُمْ بِالصِّدْقِ؛ فَإِنَّ الصِّدْقَ يَهْدِي إِلَى الْبِرِّ، وَإِنَّ الْبِرَّ يَهْدِي إِلَى الْجَنَّةِ، وَمَا يَزَالُ الرَّجُلُ يَصْدُقُ وَيَتَحَرَّى الصِّدْقَ حَتَّى يُكْتَبَ عِنْدَ اللَّهِ صِدِّيقًا، وَإِيَّاكُمْ وَالْكَذِبَ؛ فَإِنَّ الْكَذِبَ يَهْدِي إِلَى الْفُجُورِ، وَإِنَّ الْفُجُورَ يَهْدِي إِلَى النَّارِ، وَمَا يَزَالُ الرَّجُلُ يَكْذِبُ وَيَتَحَرَّى الْكَذِبَ حَتَّى يُكْتَبَ عِنْدَ اللَّهِ كَذَّابًا» . رواه البخاري في صحيحه ومسلم.

***"Sadiq olun. Sadiqlik insanı yaxşılığa doğru aparar. Yaxşılıq isə insanı cənnətə aparar. Bir insan sadiqlik etməyə çalışıb onu axtararsa, Allah yanında sadiqlər kimi qeyd olunar. Yalandan çəkinin! Yalan insanı günaha aparır. Günah isə insanı cəhənnəmə aparar. Bir insan yalan danışmağa çalışar və onu axtararsa Allah yanında yalançılar kimi qeyd olunar"[1].***

Toplum və fərdlərin sadiqlik sifətinə yiyələnməsi cəmiyyət üzvləri arasında əmin-amanlığın və etibarın yayılması deməkdir. Çünki insanlar sadiq insana inanır və hər işlərində ona etibar edirlər.

Sadiq insanı hər kəs sevər, onun sözünü dinləyər və onun sözü onların qəlbinə təsir edər.

Sadiqlik insana cəmiyyət arasında izzət, özünə inam, alicənablıq və gözəl şərəf gətirər.

Qarşılıqlı əlaqələrdə sadiqlik etmək ruzinin bol olmasına səbəbdir. Yalan danışmaq isə əksinə.

---

[1] Buxari: 10\ 507\ № 6094. Müslim: 4\ 2012\ № 2607.

**Rəhmət:** Bu dinin əsas xüsusiyyətlərindən biri onun rəhmət dini olmasıdır. O, ona iman gətirənlər üçün rəhmətdir. Çünki o həmin adamı həm dünyada həm də axirətdə sevindirir. İslam dini bütün bəşəriyyət üçün rəhmətdir. Çünki o, zəifə, fağıra, acizə və kiçiyə rəhm etməyi buyurur. O həmçinin bütün məxluqat üçün də rəhmətdir. Məsələn, bu şəriət heyvanlara apara bilməyəcəyini yükləməyi və onlara əzab verməyi qadağan etmişdir. Onları kəsəndə isə rahat kəsilməsini əmr etmişdir.

Bu din rəhmət dinidir. Allah taala onu Rəhman və Rəhim olan rəhmət sifətindən etmişdir. Həmçinin bu dini bizə çatdıran Peyğəmbəri ﷺ də rəhmət və şəfqət sifətləri ilə vəsf edilmişdir. Allah taala buyurur:

﴿لَقَدْ جَآءَكُمْ رَسُولٌ مِّنْ أَنفُسِكُمْ عَزِيزٌ عَلَيْهِ مَا عَنِتُّمْ حَرِيصٌ عَلَيْكُم بِٱلْمُؤْمِنِينَ رَءُوفٌ رَّحِيمٌ ﴿١٢٨﴾﴾ (التوبة:١٢٨)

"***(Ey ümmətim!)*** **Sizə özünüzdən bir peyğəmbər gəldi ki, sizin əziyyətə** ***(məşəqqətə)*** **düşməyiniz ona ağır gəlir, o sizdən** ***(sizin iman gətirməyinizdən)*** **ötrü təşnədir, möminlərlə şəfqətli, mərhəmətlidir!" (ət-Tövbə: 128).**

Rəhmət həmçinin Allahın mömin bəndələrinin simalarındandır. Allah taala buyurur:

﴿مُّحَمَّدٌ رَّسُولُ ٱللَّهِ ۚ وَٱلَّذِينَ مَعَهُۥٓ أَشِدَّآءُ عَلَى ٱلْكُفَّارِ رُحَمَآءُ بَيْنَهُمْ﴾ (الفتح:٢٩)

**"Muhəmməd** ***(əleyhissalam)*** **Allahın Peyğəmbəridir. Onunla birlikdə olanlar** ***(möminlər)*** **kafirlərə qarşı sərt, bir-birinə** ***(öz aralarında)*** **isə mərhəmətlidirlər..." (əl-Fəth: 29).**

Onlar bu sifətləri bir-birlərinə tövsiyə edirlər. Allah taala buyurur:

﴿ ثُمَّ كَانَ مِنَ ٱلَّذِينَ ءَامَنُواْ وَتَوَاصَوۡاْ بِٱلصَّبۡرِ وَتَوَاصَوۡاْ بِٱلۡمَرۡحَمَةِ ﴿١٧﴾ أُوْلَٰٓئِكَ أَصۡحَٰبُ ٱلۡمَيۡمَنَةِ ﴿١٨﴾ ﴾ (البلد: ١٧-١٨)

**"Sonra da iman gətirən və bir-birinə səbirli olmağı tövsiyə edən, mərhəmət tövsiyə edən kimsələrdən olmaqdır! Onlar sağ tərəf sahibləridir!** ***(Əməl dəftərləri sağ əllərinə verilənlərdir!)*** **" (əl-Bələd: 17-18).**

Peyğəmbər ﷺ möminlərin vəziyyətini vəsf edərək buyurmuşdur:

«مَثَلُ الْمُؤْمِنِينَ فِي تَوَادِّهِمْ وَتَرَاحُمِهِمْ وَتَعَاطُفِهِمْ مَثَلُ الْجَسَدِ إِذَا اشْتَكَى مِنْهُ عُضْوٌ تَدَاعَى لَهُ سَائِرُ الْجَسَدِ بِالسَّهَرِ وَالْحُمَّى» . أخرجه البخاري في صحيحه ومسلم.

***"Möminlər öz rəhmət, şəfqət və mehribanlıqlarında bir bədən kimidirlər. Həmin bədənin bir əzası şikayətləndikdə bədənin digər əzaları onun ağrısından təsirlənir və hərarəti artır"[1].***

Peyğəmbər ﷺ buyurmuşdur:

«لَا يَرْحَمُ اللَّهُ مَنْ لَا يَرْحَمُ النَّاسَ» . أخرجه البخاري في صحيحه ومسلم.

***"İnsanlara rəhm etməyənə Allah da rəhm etməz"[2].***

İslam, hətta heyvanlara göstərilən mərhəməti cənnətə aparan səbəb etmişdir. Peyğəmbər ﷺ buyurmuşdur:

«بَيْنَمَا رَجُلٌ يَمْشِي بِطَرِيقٍ اشْتَدَّ عَلَيْهِ الْعَطَشُ فَوَجَدَ بِئْرًا فَنَزَلَ فِيهَا فَشَرِبَ ثُمَّ خَرَجَ فَإِذَا كَلْبٌ يَلْهَثُ يَأْكُلُ الثَّرَى مِنَ الْعَطَشِ، فَقَالَ الرَّجُلُ: لَقَدْ بَلَغَ هَذَا الْكَلْبَ مِنَ الْعَطَشِ مِثْلُ

---

1 Buxari: 10\ 438\ № 6011. Müslim: 4\ 1999-2000\ № 1586.
2 Buxari: 13\ 358\ № 7376. Müslim: 4\ 1809\ № 2319.

***"Bir kişi yol ilə gedərkən yaman susayır. Bu vaxt bir quyu tapır. Quyuya enib su içir. Quyudan çıxdıqdan sonra ləhləyən bir it görür. Həmin it susuzluqdan nəm torpağı yalayırdı. Həmin kişi dedi: Mən necə susamışdımsa bu it də elə susamışdır, deyib quyuya enir və xöffinin (dəridən olan corabın) içərisinə su doldurdu. Xöffü ağzı ilə tutub quyudan çıxdı və itə su verdi. Onun bu əməlinə görə Allah taala onun üçün şükr edib onu bağışladı. Səhabələr dedilər: "Ey Allahın Elçisi, bu heyvanlara görə bizim üçün savab vardır? Peyğəmbər ﷺ buyurdu: hər bir canlıda sizin üçün savab vardır[1]".***

Müsəlman cəmiyyətinin arasında bu sifətin yayılması, onların bir-birlərinə qarşı şəfqətli, mərhəmətli və dayaq olmalarına, başına müsibət gələnlərə kömək edənlərin tapılmasına səbəb olur. Çünki müsəlmanlar öz aralarında bir-birlərinə mərhəmətlidirlər. Həmçinin bu sifət əmin-amanlığın yayılmasına da səbəb olur.

**Səbir:**

Səbir sifətinə təşviq etmək bu şəriətin ali məqamlığından irəli gəlir. Çünki din məfhumu haqqı bilmək və ona əməl etməkdir. Dinə əməl etmək və onu öyrənmək üçün mütləq səbirli olmaq lazım gəlir. Həmçinin insan öz istəyinə yalnız səbirlə yetişə bilər. İbadətlərdə, pis işləri tərk etməkdə, insanlarla davranmaqda, dünya müsibətlərini qarşılamaqda və həyat çətinliklərinə dözməkdə səbrə böyük ehtiyac vardır.

---

[1] Buxari: 1\ 278\ № 17. Müslim: 4\ 1761\ № 2244.

Allah taala Öz kitabında səbri doxsandan çox yerdə xatırlatmışdır. Bu, səbrin əhəmiyyətini və fəzilətini göstərən bir amildir. Belə ayələrdən:

﴿ يَٰٓأَيُّهَا ٱلَّذِينَ ءَامَنُواْ ٱصۡبِرُواْ وَصَابِرُواْ وَرَابِطُواْ وَٱتَّقُواْ ٱللَّهَ لَعَلَّكُمۡ تُفۡلِحُونَ ﴾ (آل عمران:٢٠٠)

**"Ey iman gətirənlər! Səbr edin, dözün, *(sərhəd boyu növbədə durub cihada)* hazır olun və Allahdan qorxun ki, bəlkə, nicat tapasınız!" (Ali İmran: 200).**

﴿ إِنَّمَا يُوَفَّى ٱلصَّٰبِرُونَ أَجۡرَهُم بِغَيۡرِ حِسَابٍ ﴾ (الزمر: ١٠)

**"Yalnız *(dünyada Allah yolunda çətinliklərə)* səbirli olanlara *(axirətdə)* saysız-hesabsız mükafat veriləcəkdir!”" (əz-Zümər: 10).**

Peyğəmbərin ﷺ Sünnəsində də səbir və səbirli olanların fəziləti haqda çoxlu hədislər rəvayət edilmişdir. Peyğəmbər ﷺ buyurmuşdur:

«مَنْ يَصْبِرْ يُصَبِّرْهُ اللَّهُ، وَمَا أُعْطِيَ أَحَدٌ مِنْ عَطَاءٍ خَيْرٌ وَأَوْسَعُ مِنَ الصَّبْرِ» . أخرجه البخاري في صحيحه ومسلم.

***"Kim səbr edərsə Allah taala ona səbr verər. Heç kəsə səbirdən daha xeyirli və geniş pay varilməmişdir"[1].***

Peyğəmbər ﷺ buyurmuşdur:

«الْمُؤْمِنُ الَّذِي يُخَالِطُ النَّاسَ وَيَصْبِرُ عَلَى أَذَاهُمْ أَعْظَمُ أَجْرًا مِنَ الْمُؤْمِنِ الَّذِي لَا يُخَالِطُ النَّاسَ وَلَا يَصْبِرُ عَلَى أَذَاهُمْ» . أخرجه الترمذي في سننه وابن ماجه، وإسناده صحيح.

---

[1] Buxari: 11\ 303\ № 6470. Müslim: 2\ 729\ № 1053.

***"İnsanlarla ünsiyyətdə olub, onların əziyyətlərinə səbirli mömin, insanlarla ünsiyyətdə olmayıb onların əziyyətlərinə də səbirlilik göstərməyən mömindən daha xeyirlidir"[1].***

İnsanın səbirli olmasının bir çox gözəl səmərələri vardır:

Bəndənin saleh əməllərdə davamlı olması, belə əməlləri etməkdən yorulmaması, dünya və axirət istəklərinə nail olması və s. Ümumiyyətlə bunlara yalnız səbirlə nail olmaq mümkündür. Ona görə ikinci raşidi xəlifə Ömər İbn Xəttab ﵁ buyurmuşdur: "Ən gözəl həyata səbrlə nail olmuşuq".

Səbrin faydalarından həmçinin bunları demək olar: qəzəbdən, təlaşdan və axmaqlıqdan qorunmaqla özünü idarə etmək, nəfsi pis işlərə və şəhvətlərə düşməkdən mühafizə etmək və müsibətlər baş verdikdə onu sakit saxlamaq.

**Təvazökarlıq:**

Təvazökarlıq sifəti müsəlmanları digərlərindən fərqləndirən sifətdir. Müsəlmanların təvazökarlıqlarını görməklə neçə-neçə insanlar İslamı qəbul etmişlər. Heç şübhəsiz Peyğəmbərimiz ﷺ digər peyğəmbərlərin seyidi və məxluqatın ən şərəflisi olduğu bir halda çox təvazökar idi.

كانت الأمة من إماء أهل المدينة لتأخذ بيد رسول الله ﷺ فتنطلق به حيث شاءت.

أخرجه البخاري في صحيحه

***Hətta Mədinə şəhərində yaşayan azyaşlı bir qız uşağı Peyğəmbərin ﷺ əlindən tutar və Peyğəmbər ﷺ də onun ardınca istədiyi yerə gedər və onun dilədiyi ehtiyaclarını yerinə yetirərdi[2].***

Peyğəmbər ﷺ belə deyərdi:

---

[1] Tirmizi: 4\ 572\ № 2507. İbn Macə: 2\ 1338\ № 4032. Hədisin isnadı səhihdir.

[2] Buxari: 10\ 489\ № 6072.

«ابْغُونِي فِي ضُعَفَاءِكُمْ فَإِنَّمَا تُرْزَقُونَ وَتُنْصَرُونَ بِضُعَفَائِكُمْ» . أخرجه الترمذي في سننه وأبو داود في سننه والنسائي في سننه، وإسناده صحيح

***"Məni öz zəiflərinizin arasında görün. Həqiqətən siz zəiflərinizə görə ruzi əldə edir və qələbə çalırsınız"[1].***

Bu kəramətli sifət insanların İslamı qəbul etmələrinə və onun ətrafına toplanmalarına səbəb idi. Allah taala buyurur:

﴿ فَبِمَا رَحْمَةٍ مِّنَ ٱللَّهِ لِنتَ لَهُمْ ۖ وَلَوْ كُنتَ فَظًّا غَلِيظَ ٱلْقَلْبِ لَٱنفَضُّوا۟ مِنْ حَوْلِكَ ﴾(آل عمران:١٥٩)

"*(Ya Rəsulum!)* **Allahın mərhəməti səbəbinə sən onlarla yumşaq rəftar etdin. Əgər qaba, sərt ürəkli olsaydın, əlbəttə, onlar sənin ətrafından dağılıb gedərdilər...." (Ali İmran: 159).**

﴿ وَٱخْفِضْ جَنَاحَكَ لِمَنِ ٱتَّبَعَكَ مِنَ ٱلْمُؤْمِنِينَ ٢١٥ ﴾ (الشعراء:٢١٥)

"**Sənə tabe olan möminləri qanadın altına al!** ***(Onlarla yumşaq davran, nəzakətlə rəftar et, köməklərinə çat!)*****" (əş-Şuəra: 215).**

İslam, müsəlmana öz qardaşına qarşı təkəbbürlüyü unutmağı və təvazökar olmağı öyrədir. Müsəlman mülayim, nəvazişli, qardaşları tərəfindən sevilən və dost tutulan kimsə olmalıdır. Çünki o, öz qardaşlarına qarşı təvazökar davranır, Allahın, Peyğəmbərinin ﷺ vasitəsi ilə bizə buyurduqlarını, yerinə yetirir. Peyğəmbər ﷺ buyurur:

«إِنَّ اللهَ أَوْحَى إِلَيَّ أَنْ تَوَاضَعُوا حَتَّى لَا يَفْخَرَ أَحَدٌ عَلَى أَحَدٍ وَلَا يَبْغِ أَحَدٌ عَلَى أَحَدٍ» . أخرجه مسلم

---

[1] Tirmizi: 4\ 179\ № 1702. Əbu Davud: 3\ 73\ № 2594. Nəsai: 6\ 352-353\ № 3179. Isnadı səhihdir.

*"Allah taala, bir-birinizin üzərində fəxr etməyəsiniz və bir-birinizə qarşı zülm etməyəsiniz deyə, mütləq təvazökar olmanızı mənə vəhy etdi"[1].*

İslam təkəbbürlüyə qarşı şiddətli mübarizə aparmışdır. Çünki təkəbbürlü adam digər insanlar tərəfindən sevilməz. Belə adam haqdan azıb nəfsi ilə fəxr edən və haqq ona yetişdikdə ondan üz çevirəndir. Ona görə təkəbbürlü adamın cənnətə daxil olmayacağı vəd edilmişdir. Peyğəmbər ﷺ buyurur:

«لَا يَدْخُلُ الْجَنَّةَ مَنْ كَانَ فِي قَلْبِهِ مِثْقَالُ ذَرَّةٍ مِنْ كِبْرٍ». أخرجه مسلم

*"Qəlbində zərrə qədər təkəbbürlük olan insan cənnətə daxil olmayacaqdır"[2].*

Təvazökarlığın gözəl səmərələrindən biri də, öz sözü və əməli ilə fəxr edən, insanlar tərəfindən sevilməyən təkəbbürlü adamın əksi olaraq təvazökar insanın haqq yoluna yönəlib onunla həmişəlik getməsi və insanlar tərəfindən sevilməsidir.

Təvazökarlığın gözəl səmərələrindən biri də belə insanın cəmiyyət arasında gözəl məqama yetişməsidir. Ona görə Peyğəmbər ﷺ buyurur:

«وَمَا تَوَاضَعَ أَحَدٌ لِلَّهِ إِلَّا رَفَعَهُ اللَّهُ» أخرجه مسلم.

*"Kim Allah üçün təvazökarlıq edərsə, Allah taala onu ucaldar"[3].*

**Salamı yaymaq:**

İslam şəriəti müsəlmanlar arasında mehribançılıq və mülayimlik yarada biləcək hər bir vasitəni buyurmuşdur. Belə

[1] Müslim: 4\ 2199\ № 2865.
[2] Müslim: 1\ 93\ № 91.
[3] Müslim: 4\ 2001\ № 2588.

vasitələrdən biri salam vermək və müsəlmanlar arasında onu yaymaqdır. Həqiqətən müsəlman toplum arasında salamın yayılması həmin cəmiyyətdə məhəbbətin, mehribançılığın və ülfətin yayılmasına hədsiz dərəcədə təsir edir. Salam qəlblərdə olan kin-küdurəti, qəzəb və nifrəti yox edir və qardaşı qardaşa sevdirir. Ona görə Peyğəmbər ﷺ buyurmuşdur:

«لَا تَدْخُلُونَ الْجَنَّةَ حَتَّى تُؤْمِنُوا وَلَا تُؤْمِنُوا حَتَّى تَحَابُّوا أَوَلَا أَدُلُّكُمْ عَلَى شَيْءٍ إِذَا فَعَلْتُمُوهُ تَحَابَبْتُمْ أَفْشُوا السَّلَامَ بَيْنَكُمْ» . أخرجه مسلم.

***"İman gətirməyincəyə qədər cənnətə daxil olan deyilsiniz. Bir-birinizi sevməyincə də iman gətirməyəcəksiniz. Sizə elə bir şey deyimmi ki, onu etsəniz bir-birinizi sevəsiniz?! Öz aranızda salamı yayın"[1].***

Mömin şəxs öz qardaşına salam verdikdə həmin adamın salamı qaytarması vacibdir. Beləliklə, hər iki tərəfdə mehribançılıq və ülfət yaranır. Allah taala buyurur:

﴿ وَإِذَا حُيِّيتُم بِتَحِيَّةٍ فَحَيُّواْ بِأَحْسَنَ مِنْهَآ أَوْ رُدُّوهَآ ۗ إِنَّ ٱللَّهَ كَانَ عَلَىٰ كُلِّ شَيْءٍ حَسِيبًا ﴿٨٦﴾ ﴾ (النساء:٨٦)

"**Sizə salam verildiyi zaman onu daha gözəl alın və ya** ***(eynilə sahibinə)*** **qaytarın! Şübhəsiz, Allah hər şeyi hesaba alandır" (ən-Nisa: 86).**

Salamın faydaları əvvəldə deyilənlər olduğu bir halda müsəlmana hər kəsə tanıdığı və tanımadıqlarına salam vermək əmr edilir. Salam sadəcə tanıyanlara verilmir və bununla müsəlman cəmiyyət bir-birini tanıyır. Bir kişi Peyğəmbərdən ﷺ soruşur:

---

[1] Müslim: 1\ 74\ № 54.

سأل رجل رسول الله ﷺ: أيّ الإسلام خير؟ قال: «تطعم الطعام، وتقرأ السلام على من عرفت ومن لم تعرف» . أخرجه البخاري في صحيحه ومسلم.

***"Hansı İslam daha xeyirlidir?" Peyğəmbər ﷺ buyurur: "Yemək yedizdirmək, tanıdığın və tanımadığın kimsələrə salam vermək"[1].***

Salam möminin şüarı və tutduğu yoldur. O, böyüyə və kiçiyə, tanıdığı və tanımadığı, dostu və düşməninə salam verər. Peyğəmbər ﷺ buyurur:

«لا يحل لمسلم أن يهجر أخاه فوق ثلاث يلتقيان فيصد هذا ويصد هذا، وخيرهما الذي يبدأ بالسلام» أخرجه البخاري في صحيحه ومسلم.

***"Müsəlmana öz qardaşı ilə üç gündən artıq küsülü qalması halal olmaz (qadağandır). Onlar bir-biri ilə qarşılaşdıqda bu üzün o tərəfə, o isə başqa tərəfə çevirir. Onların ən xeyirlisi birinci salam verəndir"[2].*** Hədisdə Peyğəmbər ﷺ küsülü insanları salam verməyə təşviq etmişdir. Çünki salam sülhün əldə edilməsi üçün çox mühüm vasitədir.

**Yaxşı qonşuluq:**

Hər bir müsəlman öz həyatını yaşamaq üçün mütləq haradasa məskunlaşmalı və kiməsə qonşuluq etməlidir. Ona görə İslam şəriəti qonşuluq əlaqələrini də tənzimləmişdir. Qonşu, yaxınlıqda yaşayan insanlar deməkdir. Onlara yaxşılıq etmək əmr olunur. Allah taala buyurur:

---

[1] Buxari: 1\ 55\ № 12. Müslim: 1\ 65\ № 39.
[2] Buxari: 21\ 11\ № 6237. Müslim: 4\ 1984\ № 2560.

﴿وَٱعۡبُدُواْ ٱللَّهَ وَلَا تُشۡرِكُواْ بِهِۦ شَيۡـٔٗاۖ وَبِٱلۡوَٰلِدَيۡنِ إِحۡسَٰنٗا وَبِذِي ٱلۡقُرۡبَىٰ وَٱلۡيَتَٰمَىٰ وَٱلۡمَسَٰكِينِ وَٱلۡجَارِ ذِي ٱلۡقُرۡبَىٰ وَٱلۡجَارِ ٱلۡجُنُبِ وَٱلصَّاحِبِ بِٱلۡجَنۢبِ وَٱبۡنِ ٱلسَّبِيلِ وَمَا مَلَكَتۡ أَيۡمَٰنُكُمۡۗ إِنَّ ٱللَّهَ لَا يُحِبُّ مَن كَانَ مُخۡتَالٗا فَخُورًا ٣٦﴾ (النساء:٣٦)

**"Allaha ibadət edin və Ona heç bir şeyi şərik qoşmayın! Ata-anaya qohum-əqrəbaya, yetimlərə, yoxsullara, yaxın və uzaq qonum-qonşuya, yaxın *(yoldaş və)* dosta, *(pulu qurtarıb yolda qalan)* müsafirə *(yolçulara)*, əlinizin altında olana *(sahib olduğunuz qul və kənizlərə)* yaxşılıq edin! Həqiqətən, Allah özünü bəyənənləri, lovğalıq edənləri sevməz!" (ən-Nisa: 36).**

Bu ayədə Allah taala qohum olan və ya olmayan qonşuya yaxşılıq etməyi əmr etmiş və onun əhəmiyyətini bildirmək üçün onu Özünə edilən ibadətlə birgə xatırlatmışdır. Peyğəmbərin ﷺ sözü deyilənlərə daha da aydınlıq gətirəcəkdir:

«مَنْ كَانَ يُؤْمِنُ بِاللَّهِ وَالْيَوْمِ الآخِرِ فَلْيُحْسِنْ إِلَى جَارِهِ» . أخرجه البخاري في صحيحه ومسلم.

***"Kim Allaha və axirət gününə iman gətirirsə qonşusuna yaxşılıq etsin"[1].***

İslam şəriətinin qonşuya ayırdığı yer çox uca və yüksəkdir. Bunu Peyğəmbərin ﷺ sözü tam açıqlayır:

«مَا زَالَ جِبْرِيلُ يُوصِينِي بِالْجَارِ حَتَّى ظَنَنْتُ أَنَّهُ سَيُوَرِّثُهُ» . أخرجه البخاري في صحيحه ومسلم.

***"Cəbrail mənə o qədər qonşu haqda məsləhətlər verdi ki, hətta mən onun varis olacağını zənn etdim"[2].***

---

[1] Buxari: 10\ 445\ № 6091. Müslim: 1\ 69\ № 48.
[2] Buxari: 10\ 441\ № 6015. Müslim: 4\ 2025\ № 2625.

Qonşuya yaxşılıq etmək haqda olan hədislər sadəcə yaxşılığa təşviq etməklə kifayətlənməmiş və yaxşılığın növlərini də açıqlamışdır. Indi isə bəzi misallar çəkəcəyəm:

Peyğəmbər ﷺ buyurmuşdur:

«لَيسَ الْمُؤْمِنُ الَّذِي يَشْبَعُ وَجَارُهُ جَائِعٌ إِلَى جَنْبِهِ» أخرجه البخاري في الأدب المفرد والطبراني في الكبير من حديث ابن عباس رضي الله عنهما، وصححه الألباني بشواهده في السلسلة الصحيحة.

***"Özünün qarnı tox olub, yanındakı qonşusu ac olan, mömin deyildir"[1].***

Varlı qonşuya özü tox olduğu halda qonşularını ac qoyması haram edilmişdir. Hədisdə qonşunun vəziyyətini öyrənməyə bir işarə vardır.

Peyğəmbər ﷺ buyurmuşdur:

«يَا أَبَا ذَرٍ إِذَا طَبَخْتَ مَرَقَةً فَأَكْثِرْ مَاءَهَا وَتَعَاهَدْ جِيرَانَكَ»، أخرجه مسلم.

***"Ey Əbu Zərr! Sulu yemək bişirəndə suyunu çox et və qonşularını da gör"[2].***

Burada ***"qonşularını da gör"*** ifadəsinin mənası: hətta kasıb olmayan qonşuya mehribançılıq məqsədi ilə yemək vermək mənasını daşıyır.

Peyğəmbər ﷺ buyurmuşdur:

«لاَ يَمْنَعْ أَحَدُكُمْ جَارَهُ أَنْ يَغْرِزَ خَشَبَةً فِي جِدَارِهِ». أخرجه البخاري في صحيحه ومسلم.

***"Biriniz, divarınıza (ev tikmək məqsədi ilə) ağac basdırmaq istəyən qonşusuna bunu qadağan etməsin"[3].***

---

[1] Buxarinin "Ədəbul Mufrəd" kitabı: № 112. Təbərani "Əl Kəbir" kitabı: 3\ 175. Albani "əs-Silsilətus Səhihə" kitabı № 149 -da hədisin səhih olduğunu demişdir.

[2] Müslim: 4\ 2025\ № 2625.

[3] Buxari: 5\ 110\ № 2463. Müslim: 3\ 1230\ № 1609.

Hədisdə divara ağac basdırmaq istəyən qonşuya buna görə qadağa qoymaq yasaq edilir. Çünki iki müsəlmanın evi bir ev kimidir.

İslam alimləri qonşulara veriləcək bir çox haqlar sadalamışlar. Məsələn, səndən kömək istədikdə ona kömək etmək, borc istədikdə borc vermək, möhtac olduqda ona əl tutmaq, xeyir işində ona xeyir-dua vermək, müsibət baş verdikdə başsağlığı vermək, öldükdə cənazəsinin ardınca getmək, evinin yanında ondan icazəsiz evini ucaldıb küləyin qarşısını kəsməmək, evdə bişirilən ətirli yeməklərdən onlara da vermək, meyvə aldıqda onlara da hədiyyə etmək, əgər etməyəcəksənsə onda bunları onlara görsətməmək üçün onları evə gizli şəkildə daxil etmək lazımdır. Atanın aldıqlarını uşağın əlinə götürüb qonşu uşaqlarına acıq verməsi düzgün deyildir.

Müsəlman tərəfindən qonşuya qarşı edilən ədəb-ərkan nümunələri, bizə dinin buyruqlarına əməl edən müsəlman qonşunun necə də böyük nemət olmasını göstərir.

İslam şəriətinin qonşuya olan böyük qayğısı onun cəmiyyəti saflaşdırmaq və islah etmək prinsiplərindən bir nümunədir.

Təsəvvür et ki, bir cəmiyyətdə hər kəs qonşusuna yaxşılıq edir, onun halına acıyır, ehtiyaclarını ödəyir, işlərində ona kömək edir, kiməsə müsibət baş verəndə qonşular onun köməyinə gələr və müsibətinə şərik olmaqla onu sakitləşdirirlər və s. Belə cəmiyyət həqiqətən çox nümunəvi, dünyada tayı-bərabəri olmayan bir toplum olar.

**Valideynlərə yaxşılıq etmək və qohumluq əlaqələrini bərkitmək:**

Bu əzəmətli dinin daha bir gözəlliyi ailə və cəmiyyət əlaqələrini tənzimləməsidir. O, ailənin sonra isə cəmiyyətin bir-birinə bağlanmasına xüsusi diqqət yetirir. Müsəlmana, qohumluq

dərəcəsindən asılı olaraq öz yaxınlarına yaxşılıq etmək və onlarla əlaqələrini bərkitmək əmr olunur. Bu haqda Allah taala buyurur:

﴿ فَـَٔاتِ ذَا ٱلْقُرْبَىٰ حَقَّهُۥ وَٱلْمِسْكِينَ وَٱبْنَ ٱلسَّبِيلِ ۚ ذَٰلِكَ خَيْرٌ لِّلَّذِينَ يُرِيدُونَ وَجْهَ ٱللَّهِ ۖ وَأُو۟لَـٰٓئِكَ هُمُ ٱلْمُفْلِحُونَ ﴿٣٨﴾ ﴾ (الروم:٣٨)

"*(Ya Rəsulum!)* **Yaxın qohuma, yoxsula** *(miskinə), (pulu qurtarıb yolda qalan)* **müsafirə** *(Allahın vacib buyurduğu)* **haqqını ver. Allah rizasını** *(Allahın camalını)* **diləyənlər üçün bu daha xeyirlidir.** *(Axirətdə)* **nicat tapanlar** *(mətləbinə yetişənlər)* **məhz onlardır!" (ər-Rum: 38).**

Peyğəmbər ﷺ hədislərin birində buyurur:

«إِنَّ اللَّهَ يُوصِيكُمْ بِأُمَّهَاتِكُمْ، إِنَّ اللَّهَ يُوصِيكُمْ بِأُمَّهَاتِكُمْ، إِنَّ اللَّهَ يُوصِيكُمْ بِأُمَّهَاتِكُمْ، إِنَّ اللَّهَ يُوصِيكُمْ بِآبَائِكُمْ إِنَّ اللَّهَ يُوصِيكُمْ بِالأَقْرَبِ فَالأَقْرَبِ» . أخرجه أحمد وابن ماجه، وهو حسن بطرقه.

***"Allah taala analarınızı sizə tövsiyə edir. Allah taala analarınızı sizə tövsiyə edir. Allah taala analarınızı sizə tövsiyə edir. Allah taala atalarınızı sizə tövsiyə edir. Allah taala dərəcəsindən asılı olaraq qohumlarınızı sizə tövsiyə edir (yəni, deyilənlərə bu tərtiblə yaxşılıq etmək vacibdir)"[1].***

Peyğəmbər ﷺ buyurur:

«مَنْ أَحَبَّ أَنْ يُبْسَطَ لَهُ فِي رِزْقِهِ وَيُنْسَأَ لَهُ فِي أَثَرِهِ فَلْيَصِلْ رَحِمَهُ» . أخرجه البخاري في صحيحه ومسلم.

***"Kim ruzisinin çoxalmasını və ömrünün uzanmasını istəyirsə qohumluq əlaqələrini bərkitsin"[2].***

İslamda qohumluq əlaqələrini bərkitmək və onlara yaxşılıq etmək mənfəət və məsləhət üçün deyil. Əksinə bu daha əzəmətli və

---

[1] Əhməd: 4\ 132. İbn Macə: 2\ 1207-1208\ № 3661. Hədis həsəndir.
[2] Buxari: 10\ 415\ № 5986. Müslim: 4\ 1982\ № 2557.

şərəfli əməldir. Müsəlman bu əməlini xalis Allah üçün edir. Məqsəd isə Allaha itaət etmək və savab qazanmaqdır. Ona görə hər nə olursa olsun qohumluq əlaqələri qorunub saxlanır. Bir kişi Peyğəmbərin ﷺ yanına gəlib dedi:

جاء رجل إلى رسول الله ﷺ فقال: يَا رَسُولَ اللَّهِ إِنَّ لِي قَرَابَةً أَصِلُهُمْ وَيَقْطَعُونِي وَأُحْسِنُ إِلَيْهِمْ وَيُسِيئُونَ إِلَيَّ وَأَحْلُمُ عَنْهُمْ وَيَجْهَلُونَ عَلَيَّ؟ فَقَالَ: «لَئِنْ كُنْتَ كَمَا قُلْتَ فَكَأَنَّمَا تُسِفُّهُمُ الْمَلَّ وَلَا يَزَالُ مَعَكَ مِنَ اللَّهِ ظَهِيرٌ عَلَيْهِمْ مَا دُمْتَ عَلَى ذَلِكَ»، أخرجه مسلم.

***Ey Allahın Elçisi! Mənim qohumlarım var və mən onlarla əlaqələrimi bərkidirəm, onlar isə mənimlə əlaqəni kəsirlər. Mən onlara yaxşılıq edirəm, onlar isə mssaənə pislik edirlər. Mən onların qayğısına qalıram, onlar isə məni saymırlar? Peyğəmbər ﷺ buyurdu: "Əgər sənin dediyin həqiqətdirsə, onda sanki sən onlara qaynar qum yedizdirirsən. Sən belə davam etdikcə Allah taala səni onlardan üstün edər"[1].***

Bu prinsip İslamda qohumluq əlaqələrini digər kafir millətlərdən fərqləndirir. Onlar qohumluq əlaqələrini maddi məqsədlər və mənfəətlər üçün edirlər. Mənfəət bitdikdə qohumluq əlaqəsi də bitir və kin-küdurət yenidən öz yerini tutur.

İslam valideynlərin haqlarını uca tutmuş və onlara yaxşılıq etməyi əmr etmişdir. Çünki onlar ən yaxın qohumdurlar. Ona görə onların haqları Allahın haqqından sonra birinci edilmişdir. Allah taala buyurur:

﴿ وَقَضَىٰ رَبُّكَ أَلَّا تَعْبُدُوٓاْ إِلَّآ إِيَّاهُ وَبِٱلْوَٰلِدَيْنِ إِحْسَٰنًا ۚ إِمَّا يَبْلُغَنَّ عِندَكَ ٱلْكِبَرَ أَحَدُهُمَآ أَوْ كِلَاهُمَا فَلَا تَقُل لَّهُمَآ أُفٍّ وَلَا تَنْهَرْهُمَا وَقُل لَّهُمَا قَوْلًا كَرِيمًا ﴿٢٣﴾

[1] Müslim: 4\ 1982\ № 2558.

وَٱخۡفِضۡ لَهُمَا جَنَاحَ ٱلذُّلِّ مِنَ ٱلرَّحۡمَةِ وَقُل رَّبِّ ٱرۡحَمۡهُمَا كَمَا رَبَّيَانِي صَغِيرٗا

﴿٢٤﴾ (الإسراء: ٢٣-٢٤)

**"Rəbbin yalnız Ona ibadət etməyi və valideynlərə yaxşılıq etməyi *(onlara yaxşı baxıb gözəl davranmağı)* buyurmuşdur. Əgər onların biri və ya hər ikisi sənin yanında *(yaşayıb)* qocalığın ən düşkün çağına yetərsə, onlara: "Uf!" belə demə, üstlərinə qışqırıb acı söz söyləmə. Onlarla xoş danış! Onların hər ikisinə acıyaraq mərhəmət qanadının altına salıb: "Ey Rəbbim! Onlar məni körpəliyimdən *(nəvazişlə)* tərbiyə edib bəslədikləri kimi, Sən də onlara rəhm et!" – de." (əl-İsra: 23-24).**

Allah taala onlara yaxşılıq etməyi əmr etmişdir. Xüsusən də qocalıb və xəstələnib zəif olan vaxtlarında. Oğul onların keçmiş yaxşılıqlarını xatırlayar, uşaqlıqda verdikləri tərbiyənin nəticəsi olaraq onların bağışlanması üçün dua edər. Allah taala onlara qarşı təvazökar, mərhəmətli və itaətkar olmağı əmr edir. Onların buyruqlarına hirslənməməyi buyurur. Hətta buyruğu yerinə yetirərkən "Uf" belə deməsi qadağan edilmişdir. Dediklərini etsən yenə də "Uf" demək olmaz.

Peyğəmbərin ﷺ Sünnəsində valideynlərin üzünə ağ olmağa yol verilməmiş və belə edənlərə təcili əzab vəd edilmişdir. Peyğəmbər ﷺ buyurur:

«مَا مِنْ ذَنْبٍ أَجْدَرُ أَنْ يُعَجِّلَ اللَّهُ لِصَاحِبِهِ الْعُقُوبَةَ فِي الدُّنْيَا مَعَ مَا يَدَّخِرُ لَهُ فِي الْآخِرَةِ مِنْ الْبَغْيِ وَقَطِيعَةِ الرَّحِمِ» . أخرجه الترمذي في سننه وأبو داود في سننه وابن ماجه في سننه، وهو حديث صحيح.

***"Zülm etmək və qohumluq əlaqələrini kəsmək günahların içərisində bu dünyada Allah taala tərəfindən təcili cəzaya və axirətdə də cəzalanmağa daha layiqdir"[1].***

Valideynlərin vəfatından sonra da onlara yaxşılıq etməyin əmr edilməsi İslamin təəccüb doğuran əmrlərindəndir. Vəfatından sonra onlara edilən yaxşılıq: onlar üçün dua etmək, vəsiyyətlərini yerinə yetirmək, onların dostlarına və sevdiklərinə qarşı mehriban olmaq. Peyğəmbər ﷺ buyurur:

«إِنَّ أَبَرَّ الْبِرِّ صِلَةُ الْوَلَدِ أَهْلَ وُدِّ أَبِيهِ» . أخرجه مسلم.

***"Ən gözəl yaxşılıq - övladın atasının dostları ilə əlaqələri saxlamasıdır"[2].***

Qohumların sıx əlaqələri və yaxınlara yaxşılıq etməyin faydası, İslam cəmiyyətinin bir-birinə bağlanması, qüvvətli və dözümlü olmasıdır.

**Mülayim olmaq və qəzəbdən əl çəkmək:**

İslamın mülayimliyi əmr etməsi onun kamilliyindəndir. Gözəl əxlaq qəzəbi tərk etməkdir. Kim tez qəzəblənərsə pisliklərə dözməz və bir pislik baş verəndə özünü idarə edə bilməz. Beləliklə o gözəl əxlaq və davranışın nə olduğunu bilməz. Ona görə İslam mülayim olmağı və qəzəblənməməyi əmr etmişdir. Allah taala buyurur:

---

[1] Tirmizi: 4\ 573\ № 2511. Əbu Davud: 5\ 208\ № 4902. İbn Macə: 2\ 1408\ № 4211. Hədis səhihdir.

[2] Müslim: 4\ 1979\ № 2552.

﴿وَسَارِعُوٓاْ إِلَىٰ مَغۡفِرَةٖ مِّن رَّبِّكُمۡ وَجَنَّةٍ عَرۡضُهَا ٱلسَّمَٰوَٰتُ وَٱلۡأَرۡضُ أُعِدَّتۡ لِلۡمُتَّقِينَ ١٣٣ ٱلَّذِينَ يُنفِقُونَ فِي ٱلسَّرَّآءِ وَٱلضَّرَّآءِ وَٱلۡكَٰظِمِينَ ٱلۡغَيۡظَ وَٱلۡعَافِينَ عَنِ ٱلنَّاسِۗ وَٱللَّهُ يُحِبُّ ٱلۡمُحۡسِنِينَ ١٣٤﴾ (آل عمران:١٣٣-١٣٤)

**"Rəbbinizin məğfirətinə və genişliyi göylərlə yer üzü qədər olan, müttəqilər üçün hazırlanmış, Cənnətə tələsin. O müttəqilər ki, bolluqda da, qıtlıqda da *(mallarını yoxsullara)* xərcləyər, qəzəblərini udar, insanların günahlarından keçərlər. Allah yaxşılıq edənləri sevər." (Ali İmran: 133-134).**

Peyğəmbər ﷺ mülayimliyin Allah tərəfindən sevilən xasiyyət olduğunu bildirərək səhabələrdən sayılan Abdullah İbn Əşəcc əl-Qeysə ﷺ buyurmuşdur:

«إِنَّ فِيكَ خَصْلَتَيْنِ يُحِبُّهُمَا اللَّهُ الْحِلْمُ وَالأَنَاةُ» . أخرجه مسلم.

***"Səndə, Allah taalanın sevdiyi iki xasiyyət: mülayimlik və səbr vardır"[1].***

Qəzəb bütün şərləri özündə cəm edir. Ağıllı və xeyirxah insan qəzəbli halda ən pis iş və qatı cinayət törədə bilər. Ona görə bir kişi Peyğəmbərin ﷺ yanına gəlib deyir:

جاء رجل إلى النبي ﷺ فقال: أَوْصِنِي، قَالَ: «لا تَغْضَبْ» فَرَدَّدَ مِرَارًا قَالَ: «لا تَغْضَبْ» .

أخرجه البخاري في صحيحه.

***Mənə tövsiyə et! Peyğəmbər ﷺ buyurur: "Qəzəblənmə" həmin adam sualını bir neçə dəfə təkrarladı və Peyğəmbər ﷺ eyni cavabı verdi"[2].***

---

[1] Müslim: 1\ 48\ № 17.
[2] Buxari: 10 \519\ № 6116.

İslam müsəlmana mülayimliyi, geniş qəlbli olmağı və əziyyətə dözməyi öyrədir. Belə halda insanın nəfsi rahat olar. Birinci, qəzəblənən insan təlaş və kədər içərisində olar. Ikinci, mülayim insanı hər kəs sevər. Əgər kimsə ona pislik etsə o buna səbr edər, pislik edən adamın günahından keçər. Bunu görən həmin adam etdiyi pisliyə görə özünü məzəmmət edər və peşman olar.

İslam şəriəti kamil şəriət olduğundan müsəlmanın ehtiyacı olan hər bir iş haqqında danışmışdır. O sadəcə olaraq mülayimliyi əmr, qəzəbi də qadağan etməmişdir. Hətta bunun qarşısını necə almağın yolunu da açıqlamışdır. Qəzəblənən adama Allahın mərhəmətindən qovulmuş şeytanın şərindən sığınmağı:

فأمر الغضبان بأن يستعيذ بالله من الشيطان الرجيم. جاء ذلك في حديث سليمان بن صرد ﷺ الذي أخرجه البخاري في صحيحه ومسلم.

***"Əuzu billəhi minəş şeytanir rəcim" deməyi, - əmr etmişdir[1].***

Çünki qəzəb şeytan şərinin bir növüdür. Həmçinin:

وأمر الغضبان بأن يتوضأ. جاء ذلك في حديث عطية القرظي ﷺ الذي أخرجه أبو داود في سننه وهو حديث حسن.

***"Peyğəmbər ﷺ qəzəblənən adama dəstəmaz almağı əmr etmişdir"[2].***

Çünki su qəzəbin hərarətini soyudur.

***Eləcə də ayaq üstədirsə oturmaq əmr edilmişdir. Əgər qəzəbi getməsə, onda dirsəklənməlidir. Çünki ayaq üstə olan adam hərəkət etmək və həyəcanlanmağa hazır olur. Oturan qəzəblənməkdə ayaq***

---

[1] Bu, Süleyman İbn Sərdin ﷺ hədisində qeyd edilmişdir. Buxari: 10\ 465\ № 6048. Müslim: 4\ 2015\ № 2610.

[2] Bu, Əbu Davudun Utbə əl-Quraziдən ﷺ rəvayət etdiyi hədisdə deyilmişdir. Həmin hədis həsən hədisdir.

***üstə durandan bir pillə aşağıdır. Dirsəklənən isə tamamilə qəzəbdən uzaq olar[1].***

Qəzəbli olarkən peşmançılıq gətirən bir əməli etməmək üçün, bu halda oturmaq və ya dirsəklənmək əmr edilmişdir.

Bəzi hallarda, Allaha asilikdə və haram buyurduqlarının halal edildiyini gördükdə, Allah xatirinə qəzəblənmək yaxşı əməllərdən sayılır. Belə məqamlarda Allah üçün hirslənməyi şəriət təriфləmiş, lakin onun üçün digər şəriət qanunları şərt qoyulmuşdur. Məsələn, dili söyməkdən və ya təhqir etməkdən qorumaq, bu növ qəzəbə səbəb olan – Allaha asilik və s. aradan qalxdığı anda qəzəbin sönməsi şərtdir. Aişənin ﵂ dediyinə görə:

ولم ينتقم الرسول الكريم ﷺ لنفسه قط إلا أن تنتهك حرمة الله عز وجل كما قالت أم المؤمنين عائشة رضي الله عنها . أخرجه البخاري في صحيحه ومسلم.

***Peyğəmbər ﷺ heç vaxt özü üçün qisas almamışdır. Qisası yalnız Allaha asilik edənlərdən almışdır[2].***

**Şükür:**

İslamın möminə nemət verənə şükür etməyi və Onun verdiyini etiraf etməyi, yaxşılıq edənlərlə xoş rəftarı öyrətməsi bu şəriətin gözəlliyindəndir. Bu, həqiqətən gözəl əxlaq nümunələrindən və sifətlərdəndir. Bunun əksi olaraq, verilmiş neməti inkar etmək, yaxşılıq edənlərə kobudluq və ya pislik etmək pis sifətlərdəndir. Belə əməl sahibi özünü heyvanlardan da aşağı səviyyəyə endirir. Çünki əksər heyvanlar edilən yaxşılığı itirmirlər.

İslam, yaxşılığı qorumaq və ona şükür etmək qaydalarını müsəlmana öyrətmişdir. Allah taala buyurur:

---

[1] Bu, Əbu Davudun (5\ 141 \ № 4782) Əbu Zərrdən ﵁ rəvayət etdiyi hədisdə qeyd edilmişdir. Hədis həsəndir.

[2] Buxari: 6\ 566\ № 3560. Müslim: 4\ 1813\ № 2327.

﴿ هَلۡ جَزَآءُ ٱلۡإِحۡسَٰنِ إِلَّا ٱلۡإِحۡسَٰنُ ٦٠ ﴾(الرحمن:٦٠)

**"Yaxşılığın əvəzi ancaq yaxşılıqdır!" (ər-Rəhman: 60).**

Kim yaxşılıq edirsə ona da yaxşılıq edilir. Ona görə Allah taala dünyada yaxşı əməl edənə axirətdə ona yaxşılıq olaraq cənnətə daxil ediləcəyini vəd etmişdir. Allah taala buyurur:

﴿ مَنۡ عَمِلَ صَٰلِحٗا مِّن ذَكَرٍ أَوۡ أُنثَىٰ وَهُوَ مُؤۡمِنٞ فَلَنُحۡيِيَنَّهُۥ حَيَوٰةٗ طَيِّبَةٗۖ وَلَنَجۡزِيَنَّهُمۡ أَجۡرَهُم بِأَحۡسَنِ مَا كَانُواْ يَعۡمَلُونَ ٩٧ ﴾ (النحل:٩٧)

**"Mömin olub yaxşı işlər görən kişi və qadına *(dünyada və axirətdə)* xoş həyat nəsib edəcək və etdikləri yaxşı əməllərə görə mükafatlarını verəcəyik. *(Və ya gördükləri yaxşı işlərin əvəzində onlara daha yaxşı mükafatlarını verəcəyik!)*" (ən-Nəhl: 97).**

Bu böyük əxlaq nümunəsini həyata keçirmək üçün Allah taala Öz bəndələrinə Ona şükür etməyi əmr etmişdir. Çünki onlara ruzi verən və lütfündən bəxş edən Odur. Allah taala buyurur:

﴿ يَٰٓأَيُّهَا ٱلَّذِينَ ءَامَنُواْ كُلُواْ مِن طَيِّبَٰتِ مَا رَزَقۡنَٰكُمۡ وَٱشۡكُرُواْ لِلَّهِ إِن كُنتُمۡ إِيَّاهُ تَعۡبُدُونَ ١٧٢ ﴾(البقرة:١٧٢)

**"Ey iman gətirənlər! Sizə verdiyimiz ruzilərin *(təmiz və)* halalından yeyin! Əgər Allaha ibadət edirsinizsə, *(bu nemətlərə görə)* Ona şükür edin!" (əl-Bəqərə: 172).**

İnsana öz valideynlərinə şükür etmək əmr edilmişdir. Çünki onlar onun həyata gəlməsinə səbəbdirlər. Onlar onun çox əziyyətini çəkmiş və ona yaxşılıqlar etmişlər. Məsələn, anası onu hamilə olan zaman gəzdirmiş, hər ikisi onu tərbiyələndirmiş, xərcini çəkmiş və s. yaxşılıqlar etmişlər. Allah taala buyurur:

﴿ وَوَصَّيْنَا ٱلْإِنسَـٰنَ بِوَٰلِدَيْهِ حَمَلَتْهُ أُمُّهُۥ وَهْنًا عَلَىٰ وَهْنٍ وَفِصَـٰلُهُۥ فِى عَامَيْنِ أَنِ ٱشْكُرْ لِى وَلِوَٰلِدَيْكَ إِلَىَّ ٱلْمَصِيرُ ﴿١٤﴾ ﴾ (لقمان:١٤)

**"Biz insana ata-anasına** ***(yaxşılıq etməyi, valideyninə yaxşı baxmağı, onlarla gözəl davranmağı)*** **tövsiyə etdik. Anası onu** ***(bətnində)*** **çox zəif bir halda daşımışdı.** ***(Uşağın süddən)*** **kəsilməsi isə iki il ərzində olur.** ***(Biz insana buyurduq:*** **"Mənə və ata-anana şükür et. Axır dönüş Mənədir!" (Loğman: 14).**

Ümumilikdə bütün insanlara bir-birlərinə təşəkkür etmək, yaxşılığın əvəzini yaxşılıq edən üçün dua etmək, ona yaxşılıq etmək və sairə gözəl üslubda qaytarmaq əmr olunmuşdur. Peyğəmbər ﷺ buyurmuşdur:

«مَنْ لا يَشْكُرُ النَّاسَ لا يَشْكُرُ اللَّهَ» أخرجه أبو داود في سننه والترمذي في سننه وإسناده صحيح.

***"Kim insanlara təşəkkür etməzsə, Allaha da şükür etməz"[1].***

Peyğəmbər ﷺ digər hədisdə isə belə buyurmuşdur:

«مَنْ صَنَعَ إِلَيْكُمْ مَعْرُوفًا فَكَافِئُوهُ فَإِنْ لَمْ تَجِدُوا مَا تُكَافِئُونَهُ فَادْعُوا لَهُ حَتَّى تَرَوْا أَنَّكُمْ قَدْ كَافَأْتُمُوهُ» . أخرجه أبو داود في سننه والنسائي في سننه، وإسناده صحيح.

***"Sizə yaxşılıq edən adamın yaxşılıq əvəzini qaytarın. Əgər yaxşılığın əvəzini verməyə bir şey tapmasanız onun üçün yaxşılığın əvəzi qədər dua edin"[2].***

İslam dininin qanunlarına əməl edən müsəlman cəmiyyət xoşbəxt və gözəl cəmiyyətdir. Çünki onlar yaxşılıq edənə təşəkkür edər, pislik edənin pisliyinə səbir edər və onu bağışlayarlar. Bu, insanların daima bir-birlərinə yaxşılıq etməsinə əsas verir. Edilən

---

[1] Əbu Davud: 5\ 157-158\ № 4811. Tirmizi: 4\ 298-299\ № 1954. Hədis səhihdir.
[2] Əbu Davud: 2\ 310\ № 1672. Nəsai: 5\ 87\ № 2567. Hədis səhihdir.

yaxşılıqların əvəzinə pislik və kobudluq etmək isə həmin yaxşılıqların qarşısını kəsir.

Mömin kimsə başqalarının bilmədikləri bir sevinc yaşayır. Çünki mömin bəndəyə nemət verildikdə nemət sahibi Allaha şükür edər. Beləliklə, ona verilən nemət daha da artar. Ona müsibət baş verdikdə isə səbir edər və onun əvəzində savab diləyər. Belə halda müsibət ona təsir etməz və heç bir zərər verməz. Peyğəmbər ﷺ buyurmuşdur:

«عَجَبًا لأَمْرِ الْمُؤْمِنِ إِنَّ أَمْرَهُ كُلَّهُ خَيْرٌ وَلَيْسَ ذَاكَ لأَحَدٍ إِلاَّ لِلْمُؤْمِنِ إِنْ أَصَابَتْهُ سَرَّاءُ شَكَرَ فَكَانَ خَيْرًا لَهُ وَإِنْ أَصَابَتْهُ ضَرَّاءُ صَبَرَ فَكَانَ خَيْرًا لَهُ» . أخرجه مسلم.

***"Möminin işi necə də qəribədir. Onun bütün işləri xeyirdir və bu yalnız möminə məxsusdur. Onu bir iş sevindirdikdə Allaha şükür edər və bu onun üçün xeyirli olar. Ona bir pislik baş verdikdə səbirli olar və bu onun üçün xeyirə çevrilər"[1].***

**Həya:**

İslamın həyanı əmr etməsi, onun əzəmətini və gözəlliyini bildirir. Hər bir dinin öz əxlaqı meyarı varsa, İslamın əxlaqı da həyadır. Peyğəmbərin ﷺ buyurduğu kimi:

والحياء لا يأتي إلا بخير كما قال رسول الله ﷺ . أخرجه البخاري في صحيحه ومسلم.

***Həya yalnız xeyir gətirir[2].***

Həyalı əxlaq ən gözəl, əzəmətli, üstün və çox faydalı əxlaqdır. Həm də o insana xas olan xüsusiyyətlərdəndir. Kimin həyası yoxdursa insanlıqda onun payı yalnız bədənindəki ət, qan və onun zahiri görünüşüdür. Belə adamda xeyirdən də bir pay olmaz. Əgər

[1] Müslim: 4\ 2295\ № 2999.
[2] Buxari: 10\ 521\ № 6117. Müslim: 1\ 64\ № 37.

həya olmasaydı qonağa hörmət olunmaz, vədə sadiqlik olmaz, əmanətlər qaytarılmaz, heç kəsin ehtiyacı ödənilməz, insan yaxşı işləri axtarmaz, pisliklərdən çəkinməz, ayıb yerlərini qorumaz, fahişəlikdən çəkinməzdi. Çox adamlar var ki, həyası olmasaydı onlara əmr edilənləri yerinə yetirməz, heç kəsin haqqına fikir verməz, qohumluq əlaqələrini saxlamaz və ya atadan yaxşılıq görməzdilər. Bu əməllərin həyata keçirilməsinə səbəb dini və ya dünyəvi ola bilər. Dini səbəb: etdiyi bu əməlin savabını arzu etmək, dünyəvi səbəb isə: insanın öz əxlaqında olan həyası ilə deyilən əməlləri etməsidir. Deyilənlərdən görünür ki, əgər Allahdan və bəndədən həya edilməsə adını çəkdiyimiz əməllərin heç biri həyata keçməz.

Ona görə Peyğəmbər ﷺ ənsarlardan *(Mədinəli səhabələrdən)* birinin öz qardaşını həyaya görə danladığını eşitdikdə buyurmuşdu:

مَرَّ رَسُولُ اللهِ ﷺ عَلَى رَجُلٍ مِنَ الأَنْصَارِ وَهُوَ يَعِظُ أَخَاهُ فِي الْحَيَاءِ فَقَالَ رَسُولُ اللَّهِ ﷺ: «دَعْهُ فَإِنَّ الْحَيَاءَ مِنَ الإِيمَانِ»، أخرجه البخاري في صحيحه ومسلم.

***"Ondan əl çək. Həqiqətən həya imandandır"[1].***

Digər hədisdə Peyğəmbər ﷺ buyurmuşdur:

«إِنَّ مِمَّا أَدْرَكَ النَّاسُ مِنْ كَلامِ النُّبُوَّةِ إِذَا لَمْ تَسْتَحْيِ فَافْعَلْ مَا شِئْتَ» أخرجه البخاري في صحيحه.

***"İnsanların eşitdikləri Peyğəmbər kəlamlarından biri: Əgər utanmırsansa istədiyini et! – kəlamıdır"[2].***

Yəni, kim öz həyasını itirərsə görülən yaxşı və ya pis işlərə fikir verməz.

**İffətli olmaq və ayıb yerlərini qorumaq:**

[1] Buxari: 1\ 74\ № 24. Müslim: 1\ 63\ № 36.
[2] Buxari: 6\ 515\ № 3483.

İslam dininin, əsası paklıq, şərəf, ləyaqət, iffət olan bir cəmiyyət qurması onun daha bir özəlliyidir. O, Allah taala tərəfindən nazil edilən bir dindir. Bu əsaslar hər bir cəmiyyətin əsasını təşkil etdiyi üçün İslam dini bu əxlaq əsaslarına xüsusi yer vermiş və misli-bərabəri olmayan nizam-intizam qaydaları yaratmışdır. Bu qaydaların əsas prinsipi insanın fitrətinə, yaradılış əslinə uyğunluğudur. Bu əxlaq qaydaları insanı pis və rəzil işlərə düşməkdən qoruyur. Amma bu heç də sizə təəccüblü və qəribə gəlməsin. Çünki bu əxlaq qanunlarını buyuran bütün varlıqların xaliqi Allah taaladır. O, bəndələrinin ehtiyaclarını və onları islah edəcək amilləri yaxşı bilir. Allah taala bunu təkidlə belə buyurur:

﴿ أَلَا يَعۡلَمُ مَنۡ خَلَقَ وَهُوَ ٱللَّطِيفُ ٱلۡخَبِيرُ ﴿١٤﴾ ﴾ (الملك:١٤)

**"Məgər yaradan (sizin gizli saxladığınız hər şeyi) bilməzmi?! O, (hər şeyi) incəliyinə qədər biləndir, (hər şeydən) xəbərdardır!" (əl-Mülk: 14).**

Bu mövzuda İslamın buyurduğu əsas və qaydalardan danışmaq çoxşaxəli mövzudur. Hörmətli oxucu! Ona görə də yalnız: İslamın cəmiyyəti və fərdi iffət və şərəflə tərbiyə etməsinin gözəlliyini və doğru yolunu açıqlayan bəzi misallara nəzər yetirməklə kifayətlənəcəyəm:

— Allah taala mömin bəndələrinə ayıb yerlərini qorumağı əmr etmiş və buna görə onlara cənnəti vəd etmişdir. Allah taala buyurur:

﴿ قُل لِّلۡمُؤۡمِنِينَ يَغُضُّواْ مِنۡ أَبۡصَٰرِهِمۡ وَيَحۡفَظُواْ فُرُوجَهُمۡۚ ذَٰلِكَ أَزۡكَىٰ لَهُمۡۗ إِنَّ ٱللَّهَ خَبِيرُۢ بِمَا يَصۡنَعُونَ ﴿٣٠﴾ ﴾ (النور:٣٠)

**"*(Ya Rəsulum!)* Mömin kişilərə de ki, gözlərini haram edilmiş şeylərdən çevirsinlər *(naməhrəmə baxmasınlar)*, ayıb yerlərini *(zinadan)* qorusunlar *(və ya örtülü saxlasınlar)*. Bu onlar**

**üçün** ***(ədəb-ərkan, təmizlik baxımından)*** **daha yaxşıdır. Şübhəsiz ki, Allah onların nə etdiklərindən xəbərdardır!" (ən-Nur: 30).**

Allah taala, Öz bəndələrinə ayıb yerlərini və gözlərini qorumağı əmr etmişdir. Çünki, gözü qorumaq ayıb yerlərini qorumaq üçün bir vasitə və köməkçidir. Bundan sonra onları bu işə: *ayıb yerlərini və gözlərini qorumağa* təşviq edərək bu əməlin qəlb və dinləri üçün daha pak olduğunu buyurmuşdur.

— Dünyada ayıb yerlərini zinadan qoruyanlara cənnətdə hurilər vəd etmişdir. Hurilər də yaradılmış qadınların ən gözəlidir. İslam ilə qeyrisinin arasında olan fərq elə bundadır. İnsanın qoyduğu qanunlarda, fahişəlik cəzadan, rüsvaydan və biabırçılıqdan qorxaraq tərk edilir. Bu qorxu, yəni, işinin aşkara çıxması, olmasaydı o həmin əməli edərdi. İslamda isə belə deyil, əksinə müsəlman pis işləri Rəbbinin razılığını və vəd etdiyi savabı qazanmaq üçün tərk edir. Onun edə biləcəyi pis işi heç kəs görməsə də o yenə həmin pis əməli yerinə yetirməz. Çünki onun istəyi məxluqatın Rəbbinədir. Allah taala isə insanın nə etdiklərindən xəbərdardır.

— İslam, iffət və izzəti qorumaq və yad kişiləri məftun etməmək üçün qadınlara hicab geyməyi və ayıb yerlərini yad kişilərdən qorumağı əmr etmişdir. Allah taala buyurur:

﴿ وَقُل لِّلْمُؤْمِنَٰتِ يَغْضُضْنَ مِنْ أَبْصَٰرِهِنَّ وَيَحْفَظْنَ فُرُوجَهُنَّ وَلَا يُبْدِينَ زِينَتَهُنَّ إِلَّا مَا ظَهَرَ مِنْهَا ﴾ (النور: ٣١)

**"Mömin qadınlara de ki, gözlərini haram buyurulmuş şeylərdən çevirsinlər** ***(naməhrəmə baxmasınlar),*** **ayıb yerlərini** ***(zinadan)*** **qorusunlar** ***(və ya örtülü saxlasınlar);*** **öz-özlüyündə görünən** ***(əl, üz)*** **istisna olmaqla, zinətlərini** ***(zinət yerləri olan boyun, boğaz, qol, ayaq və s. naməhrəmə)*** **göstərməsinlər;..." (ən-Nur: 31).**

İslam şəriəti belə halların qarşısını almaq, gənclərin şəhvətinin təmin edilməsi və onların haramdan qorunması üçün onlara evlənməyi əmr, onu tezləşdirməyi isə tövsiyə etmişdir. Evlənmək iqtidarında olmayanlara isə oruc tutmağı tövsiyə etmişdir. Oruc: hər hansı bir gün Allaha ibadət olaraq yemək və içməkdən imtina etməkdir. Belə olduqda oruc onun şəhvətini yüngülləşdirir. Peyğəmbər ﷺ buyurmuşdur:

«يَا مَعْشَرَ الشَّبَابِ مَنِ اسْتَطَاعَ مِنْكُمُ الْبَاءَةَ فَلْيَتَزَوَّجْ فَإِنَّهُ أَغَضُّ لِلْبَصَرِ وَأَحْصَنُ لِلْفَرْجِ وَمَنْ لَمْ يَسْتَطِعْ فَعَلَيْهِ بِالصَّوْمِ فَإِنَّهُ لَهُ وِجَاءٌ» . أخرجه البخاري في صحيحه ومسلم.

***"Ey Cavanlar! Kim evlənməyi bacarırsa evlənsin. Çünki evlənmək gözün və ayıb yerlərinin qorunması üçün vasitədir. Kim evlənməyi bacarmırsa onda oruc tutsun. Və oruc onun (şəhvətin qarşısını almağın.) dərmanıdır"[1].***

— İffətin dünyəvi faydası: bədənin sağlam və cəmiyyətin xəstəliklərdən salamat olmasıdır. Həkimlər yekdilliklə deyirlər ki, cəmiyyətdə xəstəliklərin yayılmasının ən başlıca səbəbi həmin cəmiyyətdə edilən fahişəliklərdir.
— Fahişəliyin yayılması və iffətin itməsinin nəticələri isə cinayətlərin yayılması və nəsil-nəcabətin itməsi ilə əlaqəlidir.
— Iffətini itirmiş cəmiyyət xəstə və fitnə-fəsadlı, ləyaqət və şərəfdən uzaq düşmüş bir toplumdur. Çünki insanı heyvandan fərqləndirən ən böyük səbəb iffətdir.

**Müsəlmanın eybini örtmək:**

Bu əzəmətli din, çətinlik deyil asanlıq, rəhmət və mərhəmət dinidir. Allahın dininə riayət edən müsəlman günah etdikdə ona həmin günahdan tövbə etmək əmr olunur. Əgər o Allaha tövbə edərsə Allah taala onun tövbəsini qəbul edər və onun günahını

[1] Buxari: 4\ 119\ № 1905. Müslim: 2\ 1018-1019\ № 1400.

bağışlar. Onun günah işlətdiyini görən müsəlmanlara isə həmin günahkarı rüsvay etməmək üçün onun eybini örtmək əmr olunur. Çünki belə halda o, daha rahat və asan tövbə edə bilər. Müsəlmanın eybini örtmək din qardaşlığı haqlarındandır. Hədislərin birində Peyğəmbər ﷺ buyurur:

«مَنْ سَتَرَ مُسْلِمًا سَتَرَهُ اللَّهُ يَوْمَ الْقِيَامَةِ» . أخرجه البخاري في صحيحه ومسلم.

***"Kim bir müsəlmanın eybini örtərsə Allah taala qiyamət günü onun eyiblərini örtər"[1].***

Ona görə də müsəlman cəmiyyətlərinin üzvləri çox arxayınlıq və rahatlıqda yaşayırlar. Digər cəmiyyətlərdən fərqli olaraq, onların etdikləri günahlar şişirdilmir. Çünki pis iş görən adamın eybi örtülür və rüsvay edilmir. İnsan öz evində hər tərəfdən örtülüdür. Onun evinin sirlərini bilmək üçün casusluq etmək və övrətlərini araşdırmaq olmaz. Peyğəmbər ﷺ buyurmuşdur:

«يَا مَعْشَرَ مَنْ آمَنَ بِلِسَانِهِ وَلَمْ يَدْخُلِ الإِيمَانُ قَلْبَهُ لاَ تَغْتَابُوا الْمُسْلِمِينَ وَلاَ تَتَّبِعُوا عَوْرَاتِهِمْ فَإِنَّهُ مَنْ اتَّبَعَ عَوْرَاتِهِمْ يَتَّبِعُ اللَّهُ عَوْرَتَهُ وَمَنْ يَتَّبِعْ اللَّهُ عَوْرَتَهُ يَفْضَحْهُ فِي بَيْتِهِ» . أخرجه أبو داود في سننه وأحمد في مسنده، وسنده حسن.

***"Ey dilləri ilə iman gətirib, qəlblərinə iman daxil olmayanlar! Müsəlmanların qeybətini etməyin. Onların eyiblərini axtarmayın. Həqiqətən kim onların eyiblərini axtararsa Allah taala da onun eyiblərini araşdırar. Və Allah taala kimin eyiblərini araşdırarsa onu olduğu evində rüsvay edər"[2].***

---

[1] Buxari: 5\ 97\ № 2442. Müslim: 4\ 1996\ № 2580.

[2] Əbu Davud: 5\ 194\ № 4880. Əhməd: 4\ 421. Hədis həsəndir *(yəni, qəbul ediləndir)*.

Hətta bəndəyə pis iş etdikdə öz eyiblərini örtmək əmr olunmuşdur. O, etdiyi əməlini insanlar qarşısında danışmaq və günahını ifşa etməklə Allahın ona verdiyi örtüyü açmasın. Çünki belə etmək onun tövbəsi üçün daha yaxşıdır. Günahı ifşa etmək və o haqda başqasına danışmaq günaha kiçik baxış yaradır. Günaha kiçik baxmaq isə ondan tövbə etməməklə nəticələnir. Müsəlmanın eyibni örtmək edilən günahların yayılmamasına səbəbdir. Bu isə İslama riayət edən digər müsəlmanların günahlardan qorunmalarına kömək edir. Həmçinin eyiblərin gizli saxlanması həmin adamı rəzalətdən qoruyur. Çünki günahlar insanı rəzalətə uğradır. Peyğəmbər ﷺ buyurmuşdur:

«كُلُّ أُمَّتِي مُعَافًى إِلَّا الْمُجَاهِرِينَ وَإِنَّ مِنَ الْمُجَاهَرَةِ أَنْ يَعْمَلَ الرَّجُلُ بِاللَّيْلِ عَمَلًا ثُمَّ يُصْبِحَ وَقَدْ سَتَرَهُ اللَّهُ عَلَيْهِ فَيَقُولَ: يَا فُلَانُ عَمِلْتُ الْبَارِحَةَ كَذَا وَكَذَا وَقَدْ بَاتَ يَسْتُرُهُ رَبُّهُ وَيُصْبِحُ يَكْشِفُ سِتْرَ اللَّهِ عَنْهُ» . أخرجه البخاري في صحيحه ومسلم.

***"Mücahirlərdən (günahlarını və pis işlərini ifşa edənlərdən) başqa, bütün ümmətim bağışlanandır. Mücahirliyə məsəl olaraq: Kimsə gecə vaxtı bir pis iş görür və Allah taala onun bu eybini örtür. O isə deyir: Ey filankəs! mən dünən belə-belə iş görmüşəm. Allah taala gecə o yatan zaman onun eybini örtür, o isə səhər açılan kimi öz eybini ifşa etməklə üzərindən Allah örtüyünü götürür"[1].***

İslam şəriətinin günahları bu üsulla müalicə etməsi çox təəccüblü bir üsuldur. Bu üslubun günah işlətməklə haqq yoldan azanlara çox böyük müsbət təsiri var. Bununla onlar islah olunur, fəlakət yolundan uzaqlaşır, öz namus və ləyaqətlərini insanların dedi-qodusundan qoruyarlar.

[1] Buxari: 10\ 486\ № 6069. Müslim: 4\ 2291\ № 2990.

Bu həmçinin cəmiyyətdə yaranmış gizli xəstəliklərin ictimai müalicəsidir. Beləliklə, həmin günahlar cəmiyyətdə yayılmaz və ümumi qaydaya çevrilməz. Eyiblərin ifşa edilməsi nifrət, qəzəb və cəmiyyətdə parçalanma ilə nəticələndiyi halda, eyiblərin gizli saxlanması insanlar arasında mehribançılıqla nəticələnir.

**Öyüd-nəsihət:**

Möminlərə öz aralarında bir-birlərinə öyüd-nəsihət verməyi əmr etmək İslam şəriətinin əzəmət və mərhəmətini göstərir. Hər bir müsəlman öz qardaşına öyüd-nəsihətlə, onu yaxşı işlərə təşviq edir və şər işlərdən isə çəkindirir.

Öyüd-nəsihət möminlərin simalarındandır. Bu haqda Allah taala buyurur:

﴿ وَٱلۡعَصۡرِ ۝١ إِنَّ ٱلۡإِنسَٰنَ لَفِي خُسۡرٍ ۝٢ إِلَّا ٱلَّذِينَ ءَامَنُواْ وَعَمِلُواْ ٱلصَّٰلِحَٰتِ وَتَوَاصَوۡاْ بِٱلۡحَقِّ وَتَوَاصَوۡاْ بِٱلصَّبۡرِ ۝٣ ﴾ (العصر:١-٣)

"**And olsun axşam çağına** *(ikindi vaxtına, əsr namazına)* **ki, İnsan** *(ömrünü bihudə işlərə sərf etməklə, dünyanı axirətdən üstün tutmaqla)* **ziyan içindədir? Yalnız iman gətirib yaxşı əməllər edən, bir-birinə haqqı tövsiyə edən və səbri tövsiyə edən kimsələrdən başqa!** *(Beləlləri Cənnətə nail olub əbədi səadətə qovuşanlardır!)*" **(əl-Əsr: 1-3).**

Bu ayələrdə Allah taala, iman gətirib, yaxşı əməl görən, haqqı, səbri tövsiyə və öyüd-nəsihət edənlərdən başqa bütün insanların ziyan içində olduqlarını qeyd edir.

İslam, öyüd-nəsihəti müsəlmanın qardaşlıq haqlarından etmişdir. Bir müsəlman mülayim şəkildə digərinin səhvlərini ona çatdırmalı və ona öyüd-nəsihət etməlidir. Onu insanlar qarşısında rüsvay etməməlidir. Əslində onun öyüd-nəsihətdə məqsədi qardaşının xətasını düzəltmək və ona tövsiyə etmək olmalıdır. Çox

vaxt insan öz xətalarından qafil olduğu üçün bir müsəlmanın digərinə nəsihət etməsi əmr edilmişdir. Peyğəmbər ﷺ hədislərinin birində buyurur:

«حَقُّ الْمُسْلِمِ عَلَى الْمُسْلِمِ سِتٌّ، قِيلَ: مَا هُنَّ يَا رَسُولَ اللَّهِ ؟ قَالَ: إِذَا لَقِيتَهُ فَسَلِّمْ عَلَيْهِ، وَإِذَا دَعَاكَ فَأَجِبْهُ، وَإِذَا اسْتَنْصَحَكَ فَانْصَحْ لَهُ، وَإِذَا عَطَسَ فَحَمِدَ اللَّهَ فَشَمِّتْهُ، وَإِذَا مَرِضَ فَعُدْهُ، وَإِذَا مَاتَ فَاتْبَعْهُ» . أخرجه مسلم.

***"Bir müsəlmanın digəri üzərində altı haqqı vardır". Səhabələr: onlar hansılardır? – deyə soruşdular. O buyurdu: "Səninlə qarşılaşdıqda ona salam ver, səni qonaq çağırdıqda onun dəvətini qəbul et, səndən öyüd-nəsihət istədikdə ona öyüd-nəsihət ver, asqırıb Əlhəmdulilləh dedikdə, ona Yərhəmukəllah de, xəstələndikdə onu ziyarət et və öldükdə onun cənazəsini müşayiət et"[1].***

Heç şübhə yoxdur ki, öyüd-nəsihət cəmiyyətin islah edilməsi üçün ən gözəl vasitədir. Öyüd-nəsihətlə xətalar düzələr, şərəf və ləyaqət yayılar, zəlalətdə olan doğru yola gələr, qafil insan qəflətdən ayılar.

**Susmaq və dili qorumaq:**

İnsana dilini qorumasını və batil sözlərdən çəkinməsini əmr etmək İslam şəriətinin kamilliyindəndir. Çünki dilin həcmi kiçik, təhlükəsi isə böyükdür. İslam, müsəlmana yalnız xeyir danışmağı əmr etmişdir. Danışmağa xeyirli sözü olmadıqda isə susmağı ona əmr etmişdir. Peyğəmbər ﷺ buyurmuşdur:

«مَنْ كَانَ يُؤْمِنُ بِاللَّهِ وَالْيَوْمِ الآخِرِ فَلْيَقُلْ خَيْرًا أَوْ لِيَصْمُتْ» . أخرجه البخاري في صحيحه ومسلم.

---

[1] Müslim: 4\ 1705\ № 2162.

*"Kim Allaha və axirət gününə iman gətirirsə xeyir söyləsin və ya sussun"*[1].

Qurani Kərimdə deyilir ki, kim nə danışırsa onun əməl kitabına yazılır və qiyamət günü ona görə sorğu-sual olunacaqdır. Allah taala buyurur:

﴿ مَّا يَلْفِظُ مِن قَوْلٍ إِلَّا لَدَيْهِ رَقِيبٌ عَتِيدٌ ﴿١٨﴾ ﴾ (قٓ:١٨)

**"Dediyi hər sözü (yazmaq üçün) onun yanında hazır durub gözləyən (iki mələk) vardır!" (Qaf: 18).**

Bu İslam üslubu çox əzəmətli üslubdur. O, dilin böyük təhlükəsini nəzərə alaraq onu qorumağı əmr etmişdir. Çünki tarix boyu dil: ixtilaflar, qırğınlar, nifrət, qəzəb, müharibələr, qan axıtmaq və .s bu kimi - çox bəlalar gətirmişdir.

Ona görə də İslam şəriəti dili yersiz işlətməkdən çəkindirmişdir. Buna misal olaraq aşağıdakıları demək olar:

- Yalan danışmağın qadağan edilməsi. Bu haqda sadiqlik haqda danışanda qeyd etmişdik.
- Qeybətin qadağan edilməsi. Qeybət, qardaşının xoşlamadığı pis işləri başqalarının hüzurunda danışmaqdır. Qeybət, müsəlmanlar arasında olan mehribançılığa son qoyur və aralarına nifaq salır. Bu, qeybət edənin pis əməlini və nəfsi alçaqlığını göstərir. Peyğəmbər ﷺ buyurmuşdur:

«أَتَدْرُونَ مَا الْغِيبَةُ ؟» قَالُوا: اللَّهُ وَرَسُولُهُ أَعْلَمُ. قَالَ: «ذِكْرُكَ أَخَاكَ بِمَا يَكْرَهُ» قِيلَ: أَفَرَأَيْتَ إِنْ كَانَ فِي أَخِي مَا أَقُولُ ؟. قَالَ: «إِنْ كَانَ فِيهِ مَا تَقُولُ فَقَدْ اغْتَبْتَهُ، وَإِنْ لَمْ يَكُنْ فِيهِ مَا تَقُولُ فَقَدْ بَهَتَّهُ». أخرجه مسلم.

---

[1] Buxari: 10\ 445\ № 6018. Müslim: 1\ 68\ № 47.

***"Bilirsinizmi qeybət nədir?" Səhabələr dedilər: Allah və rəsulu daha yaxşı bilərlər. O, buyurdu: "Qeybət: qardaşının xoşlamadığını onun haqda danışmaqdır". Orada olanlar dedilər: bəs əgər dediyim doğurdan da qardaşımda olarsa, onda necə? O, buyurdu: "Əgər dediyin qardaşında varsa sən onun qeybətini edirsən. Əgər sənin dediyin onda yoxdursa onda ona böhtan atmış olursan"[1].***

- Nəmmamlığın *(söz gəzdirməyin)* qadağan edilməsi. Nəmmamlıq: insanların bir-birlərinə dedikləri pis sözləri onlara çatdırmaqdır. Bu əməl mehriban insanların arasını vurur, bir-birlərinə qarşı düşmənçilik yaradır, məhəbbət və ülfəti yox edir. Əməlin belə pis nəticəsi onu edən adamın şərəfsiz və ləyaqətsiz olduğunu göstərir. Ona görə Peyğəmbər ﷺ buyurmuşdur:

«لاَيَدْخُلُ الْجَنَّةَ نَمَّامٌ» . أخرجه البخاري في صحيحه ومسلم.

***"Nəmmamlıq edən cənnətə daxil olmayacaqdır!"[2].***

- Lağa qoymağın və istehza etməyin qadağan edilməsi. Bu əməllər insanın haqlarını tapdalamaq, cəmiyyətin ləyaqətini pozmaqdır. İstehza olunan istehza edəndən özünün qisasını almağa bir fürsət axtarır. Allah taala buyurur:

﴿ يَٰٓأَيُّهَا ٱلَّذِينَ ءَامَنُواْ لَا يَسۡخَرۡ قَوۡمٞ مِّن قَوۡمٍ عَسَىٰٓ أَن يَكُونُواْ خَيۡرٗا مِّنۡهُمۡ وَلَا نِسَآءٞ مِّن نِّسَآءٍ عَسَىٰٓ أَن يَكُنَّ خَيۡرٗا مِّنۡهُنَّۖ وَلَا تَلۡمِزُوٓاْ أَنفُسَكُمۡ وَلَا تَنَابَزُواْ بِٱلۡأَلۡقَٰبِۖ بِئۡسَ ٱلِٱسۡمُ ٱلۡفُسُوقُ بَعۡدَ ٱلۡإِيمَٰنِۚ وَمَن لَّمۡ يَتُبۡ فَأُوْلَٰٓئِكَ هُمُ ٱلظَّٰلِمُونَ ۝١١ ﴾(الحجرات:١١)

---

[1] Müslim: 4\ 2001\ № 2589.

[2] Buxari: 10\ 472\ № 6056. Müslim: 1\ 101\ № 105.

**"Ey iman gətirənlər! Bir qövm digərini lağa qoymasın. Ola bilsin ki, onlar *(lağa qoyulanlar)* o birilərindən *(lağa qoyanlardan Allah yanında)* daha yaxşı olsunlar. Qadınlar da bir-birinə *(rişxənd eləməsinlər)*. Bəlkə, onlar *(rişxənd olunanlar)* o birilərindən *(rişxənd edənlərdən)* daha yaxşıdırlar. Bir-birinizə tənə etməyin *(ayıb tutmayın)* və bir-birinizi pis ləqəblərlə *(ey kafir, ey fasiq, ey münafiq və i. a.)* çağırmayın. İman gətirdikdən sonra fasiq adını qazanmaq necə də pisdir. Məhz tövbə etməyənlər zalımlardır! *(Özlərinə zülm edənlərdir!)*" (əl-Hucurat: 11).**

- Yalandan şahidlik etməyin qadağan edilməsi. Bu, batilə: nəfsi tələf etmək, malı mənisəmək, insanlara zülm etmək və s. - nail olmaq üçün yalandan şahidlik etməkdir. Yalançı şahidlik insanların haqlarını tapdalayır, ədalət və insaf nişanələrini məhv edir. Beləliklə cəmiyyətdə onu məhv edəcək kütləvi fitnə-fəsad yayılır, əminəmanlıq və sabitlik pozulur. Peyğəmbər ﷺ buyurmuşdur:

«أَلَا أُنَبِّئُكُمْ بِأَكْبَرِ الْكَبَائِرِ» ثَلَاثًا ؟ قَالُوا: بَلَى يَا رَسُولَ اللَّهِ، قَالَ: «الْإِشْرَاكُ بِاللَّهِ وَعُقُوقُ الْوَالِدَيْنِ» - وَجَلَسَ وَكَانَ مُتَّكِئًا - فَقَالَ: «أَلَا وَقَوْلُ الزُّورِ» قال الراوي: (فَمَا زَالَ يُكَرِّرُهَا حَتَّى قُلْنَا لَيْتَهُ سَكَتَ) أخرجه البخاري في صحيحه ومسلم.

*"Sizə günahların ən böyüyünü söyləyimmi?" bunu üç dəfə təkrarladıqdan sonra, səhabələr: "Bəli", deyərək cavab verdilər. O, buyurdu: "Allaha şərik qoşmaq, valideynlərin üzünə ağ olmaq", o, dirsəklənmişdi və bunları dedikdən sonra oturdu və buyurdu: "Həmçinin yalan deyilən söz". Rəvayətçi deyir: (o, bu sözü o qədər söylədi ki, hətta biz "kaşki susaydı" dedik)*[1].

[1] Buxari: 5\ 261\ № 2654. Müslim: 1\ 91\ № 87.

- Batil münaqişə, münazirə və mübahisə etməyin qadağan edilməsi. Çünki belə münaqişələr nifrətlə nəticələnir. İşi-gücü münaqişə yaratmaq olan adam çox nadir hallarda haqqa çatır. Allah taala buyurur:

﴿وَلَا تُجَٰدِلُوٓاْ أَهۡلَ ٱلۡكِتَٰبِ إِلَّا بِٱلَّتِي هِيَ أَحۡسَنُ إِلَّا ٱلَّذِينَ ظَلَمُواْ مِنۡهُمۡۖ وَقُولُوٓاْ ءَامَنَّا بِٱلَّذِيٓ أُنزِلَ إِلَيۡنَا وَأُنزِلَ إِلَيۡكُمۡ وَإِلَٰهُنَا وَإِلَٰهُكُمۡ وَٰحِدٞ وَنَحۡنُ لَهُۥ مُسۡلِمُونَ ٤٦﴾ (العنكبوت:٤٦)

**"Kitab əhlinin zülm edənləri *(cizyə verməyənləri, sizinlə vuruşmaq istəyənləri)* istisna olmaqla, onlarla ən gözəl tərzdə mücadilə edin! *(Onlarla söhbət etdikdə)* belə deyin: "Biz həm özümüzə nazil olana *(Qurana)*, həm də sizə nazil olana *(Tövrata və İncilə)* inanırıq. Bizim də Allahımız, sizin də Allahınız birdir. Biz yalnız ona təslim olanlarıq!"" (əl-Ənkəbut: 46).**

**Əhdə vəfalı olmaq :**

Vədi yerinə yetirməyi və əhdə vəfalı olmağı əmr etmək İslam şəriətinin gözəlliklərindəndir. Bu haqda Allah taala buyurur:

﴿يَٰٓأَيُّهَا ٱلَّذِينَ ءَامَنُوٓاْ أَوۡفُواْ بِٱلۡعُقُودِ﴾ (المائدة:١)

**"Ey iman gətirənlər! Əhdlərə sadiq olun. ..." (əl-Maidə: 1).**

﴿وَأَوۡفُواْ بِٱلۡعَهۡدِۖ إِنَّ ٱلۡعَهۡدَ كَانَ مَسۡـُٔولٗا ٣٤﴾(الإسراء: ٣٤)

**"Əhdə vəfa edin. Çünki *(insan)* əhd barəsində *(qiyamət günü)* cavabdehdir. *(İnsan verdiyi əhdi yerinə yetirib-yetirmədiyi haqda sorğu-suala tutulacaqdır)*." (əl-İsra: 34).**

Vəfalı olmaq İslam cəmiyyətinin bünövrəsinin əsaslarındandır. Çünki vəfalı olmaq, digər işləri də əhatə edir. İctimaiyyətdə olan bütün əlaqələr, vədlər və əhdlər vəfalılığa əsaslanır. Vəfalılıq itdikdə inam da itir. Bu isə işlərin korlanması və

məcrasından çıxması deməkdir. Peyğəmbər ﷺ xəyanətin, xainliyin və vəfasızlığın möminlərin sifətlərindən deyil, münafiqlərin sifətlərindən olmasını qeyd edərək buyurmuşdur:

«أَرْبَعٌ مَنْ كُنَّ فِيهِ كَانَ مُنَافِقًا خَالِصًا وَمَنْ كَانَتْ فِيهِ خَصْلَةٌ مِنْهُنَّ كَانَتْ فِيهِ خَصْلَةٌ مِنَ النِّفَاقِ حَتَّى يَدَعَهَا إِذَا اؤْتُمِنَ خَانَ وَإِذَا حَدَّثَ كَذَبَ وَإِذَا عَاهَدَ غَدَرَ وَإِذَا خَاصَمَ فَجَرَ» .

أخرجه البخاري في صحيحه ومسلم.

***"Dörd əlamət kimdə olarsa o xalis münafiq olar. Bu dörd əlamətdən biri olarsa o əməli tərk edənə qədər həmin adamda münafiqliyin bir xüsusiyyəti olar. Əmanətə xəyanət edər, danışanda yalan danışar, vəd verdikdə vəfasızlıq edər, münaqişə etdikdə günah (pis, nalayiq sözlərlə) danışar"[1].***

Şübhə yoxdur ki, İslamın qadağan etdiyi vəfasızlıq sifəti həmin adamın nəfsinin alçaqlığını göstərir. Belə adam cəmiyyət arasında nifrət olunan və sevilməyən insandır.

Vəfalı cəmiyyət bir-birinə inanan güclü cəmiyyətdir və düşmənləri ondan qorxarlar. Çünki vəfalı adam dediyini yerinə yetirəndir.

**Yetimə himayədarlıq etmək:**

İslam şəriəti cəmiyyətin bütün üzvlərinə və təbəqələrinə diqqət yetirən, hər kəsin haqqını verən kamil bir sistemdir. Onun qaydalarından biri də atasını itirmiş yetimə himayədarlıq etməkdir. Ata nəvazişindən məhrum olmuş bu kiçik uşaq istədiyinə lazımınca nail ola bilmir. Onun yeganə köməkçisi Allah taaladır. Belə halda İslam şəriəti yetimi himayəsinə götürüb onu tərbiyələndirənə böyük fəzilət bəxş etmişdir. Peyğəmbər ﷺ buyurmuşdur:

---

[1] Buxari: 1\ 89\ № 34. Müslim: 1\ 78\ № 58.

«كَافِلُ الْيَتِيمِ لَهُ أَوْ لِغَيْرِهِ أَنَا وَهُوَ كَهَاتَيْنِ فِي الْجَنَّةِ»، وَأَشَارَ رَاوِيهِ مَالِكٌ: بِالسَّبَّابَةِ وَالْوُسْطَى. أخرجه مسلم.

***"Öz yaxını olan və yaxını olmayan yetimə himayədarlıq edən, mənimlə cənnətdə belə olacaqdır" – deyərək şəhadət və orta barmağını bir yerdə göstərdi[1].***

Yetimə əziyyət vermək Qurani Kərimin çox ayələrində qadağan edilmişdir. Allah taala buyurur:

﴿ فَأَمَّا ٱلۡيَتِيمَ فَلَا تَقۡهَرۡ ۝٩ ﴾ (الضحى:٩)

**"Elə isə yetimə zülm etmə!" (əd-Duha: 9).**

﴿ أَرَءَيۡتَ ٱلَّذِي يُكَذِّبُ بِٱلدِّينِ ۝١ فَذَٰلِكَ ٱلَّذِي يَدُعُّ ٱلۡيَتِيمَ ۝٢ ﴾ (الماعون:١-٢ )

**"*(Ya Peyğəmbər!)* Dini *(haqq-hesab gününü)* yalan hesab edəni gördünmü? O elə adamdır ki, yetimi itələyib qovar *(haqqını verməz)*;" (əl-Maun: 1-2).**

Yəni, yetimi təhqir edər, ona zülmkarlıq göstərər, yaxşılıq etməz və onu yedizdirməz .

﴿ إِنَّ ٱلَّذِينَ يَأۡكُلُونَ أَمۡوَٰلَ ٱلۡيَتَٰمَىٰ ظُلۡمًا إِنَّمَا يَأۡكُلُونَ فِي بُطُونِهِمۡ نَارًاۖ وَسَيَصۡلَوۡنَ سَعِيرًا ۝١٠ ﴾ (النساء:١٠)

**"Həqiqətən, yetimlərin mallarını haqsızlıqla yeyənlərin yedikləri qarınlarında oda çevriləcək və onlar *(qiyamətdə)* alovlu Cəhənnəmə girəcəklər." (ən-Nisa: 10).**

---

[1] Müslim: 4\ 2287\ № 2983.

Şübhə yoxdur ki, cəmiyyətdə yaşayanların yetimlərə himayədarlıq etmələri həmin toplumda şəfqət və mərhəmətin yayılması deməkdir.

Həmçinin yetimləri başsız buraxmaq böyük fitnə-fəsaddır. Əgər yetimi islah edən himayədar olmasa o zəlalət içərisində boğular və pis insanların əlinə keçər. Ona görə İslam şəriəti yetimə belə böyük əhəmiyyət vermişdir.

**Mal-dövləti ədalətlə xərcləmək:**

Bu dinin gözəlliklərindən biri də müsəlmana öz malını ədalətlə xərcləməsini əmr etməsidir. O, yemək, içmək, geyim və yaşayışı üçün böyük məbləğdə pul xərcləyərək həddini aşmamalıdır. Bunun qaydası isə ehtiyacından artıq xərcləməməkdir. O, ehtiyacı olan miqdarda xərcləməli və ondan artığını isə etməməlidir. Çünki artıq xərc malı faydasız yerə israf etməkdir. Allah taala buyurur:

﴿ يَٰبَنِيٓ ءَادَمَ خُذُواْ زِينَتَكُمۡ عِندَ كُلِّ مَسۡجِدٖ وَكُلُواْ وَٱشۡرَبُواْ وَلَا تُسۡرِفُوٓاْۚ إِنَّهُۥ لَا يُحِبُّ ٱلۡمُسۡرِفِينَ ٣١ ﴾ (لأعراف:٣١)

**"Ey Adəm oğulları! Hər bir ibadət vaxtı** ***(namaz qılarkən, məscidə gedərkən və ya təvaf edərkən)*** **gözəl libaslarınızı geyin, yeyin-için, lakin israf etməyin, çünki** ***(Allah)*** **israf edənləri sevməz!" (əl-Əraf: 31).**

Peyğəmbər ﷺ buyurmuşdur:

«كلوا وتصدّقوا والبسوا في غير إسراف ولا مخيلة» . أخرجه النسائي في سننه وابن ماجه في سننه، وهو حديث حسن.

*"İsraf etmədən və xülyalara dalmadan (təkəbbürlük etmədən) yeyin, geyinin və sədəqə verin"*[1].

İslam dini israfçılığı və yersiz pul xərcləməyi qadağan etmişdir, həmçinin onun əksi olan paxıllıq və xəsislikdən də çəkindirmişdir. Allah taala buyurur:

﴿وَلَا يَحْسَبَنَّ ٱلَّذِينَ يَبْخَلُونَ بِمَآ ءَاتَىٰهُمُ ٱللَّهُ مِن فَضْلِهِۦ هُوَ خَيْرًا لَّهُم ۖ بَلْ هُوَ شَرٌّ لَّهُمْ ۖ سَيُطَوَّقُونَ مَا بَخِلُوا۟ بِهِۦ يَوْمَ ٱلْقِيَٰمَةِ ۗ وَلِلَّهِ مِيرَٰثُ ٱلسَّمَٰوَٰتِ وَٱلْأَرْضِ ۗ وَٱللَّهُ بِمَا تَعْمَلُونَ خَبِيرٌ ﴿١٨٠﴾﴾ (آل عمران:١٨٠)

**"Allah tərəfindən bəxş olunmuş var-dövləti sərf etməyə xəsislik edənlər heç də bunu özləri üçün xeyirli hesab etməsinlər. Xeyr, bu onlar üçün zərərlidir. Onların xəsislik etdikləri şey qiyamət günü boyunlarına dolanacaqdır. Göylərin və yerin mirası Allaha məxsusdur. Allah hər bir əməlinizdən xəbərdardır!" (Ali İmran: 180).**

İslam var-dövləti xərcləmək üçün: israfla xəsislik və paxıllıq arasında orta və ədalətli qayda qoymuşdur. İnsan ona, ailəsinə və qohumlarına vacib olan qədər xərcləməlidir. Bundan imtina etmək paxıllıqdır. Bundan artıq xərcləmək isə israf və yersiz xərcdir. Allah taala var-dövlətin xərclənməsi üçün İslam qaydasını açıqlayaraq buyurur:

﴿وَٱلَّذِينَ إِذَآ أَنفَقُوا۟ لَمْ يُسْرِفُوا۟ وَلَمْ يَقْتُرُوا۟ وَكَانَ بَيْنَ ذَٰلِكَ قَوَامًا ﴿٦٧﴾﴾ (الفرقان:٦٧)

**"Onlar *(mallarını)* xərclədikdə nə israfçılıq, nə də xəsislik edər, bu ikisinin arasında orta bir yol tutarlar." (əl-Furqan: 67).**

---

[1] Nəsai: 5\ 83\ № 2558. Ibn Macə: 2\ 1192\ № 3605. Hədis həsəndir *(yəni, qəbul ediləndir)*.

Bu qaydanın səmərəsi, İslam toplumunu iflasa uğramaqdan, onun iqtisadiyyatının zəifləməsindən qorumasıdır. Çünki israfçılıq kasıbçılığı xəbər verir.

Bu qaydanın faydalarından biri də cəmiyyətin hər üzvünün öz işi ilə məşğul olmasıdır. Paxıllığa alışan insan, vacib xərclərdən *özünə, ailəsinə, qohumlarına və kasıblara əl tutmaqdan* imtina edər. Ümumiyyətlə İslam şəriətinin buyurduğu gözəl əxlaq nümunələri haqda danışdıqca bitməz. İslam şəriəti bütün gözəl əxlaq normalarını təşviq etmiş, hər bir pis əxlaqdan çəkindirmişdir. Biz bütün bunları araşdırsaq çox uzun çəkər. Ona görə mən şəriətimizin buyurduğu bəzi əxlaqi nümunələrə qısaca işarə edəcəyəm. Bu ədəb-əxlaqlar, müsəlmanlar arasında birliyin yaranmasına, mülayimlik və mehribançılığa səbəb olur, cəmiyyəti yüksəldir və hər kəsin haqqını özünə nəsib edir.

Peyğəmbərin ﷺ hədislərində müsəlmanın qardaşı üzərində olan haqlarından danışılır və orada belə buyurulur:

«حَقُّ الْمُسْلِمِ عَلَى الْمُسْلِمِ سِتٌّ، قِيلَ: مَا هُنَّ يَا رَسُولَ اللَّه ؟ قَالَ: إِذَا لَقِيتَهُ فَسَلِّمْ عَلَيْهِ، وَإِذَا دَعَاكَ فَأَجِبْهُ، وَإِذَا اسْتَنْصَحَكَ فَانْصَحْ لَهُ، وَإِذَا عَطَسَ فَحَمِدَ اللَّهَ فَشَمِّتْهُ، وَإِذَا مَرِضَ فَعُدْهُ، وَإِذَا مَاتَ فَاتَّبِعْهُ» . أخرجه مسلم.

***"Bir müsəlmanın digəri üzərində altı haqqı vardır". Səhabələr: onlar hansılardır? – deyə soruşdular. O buyurdu: "Səninlə qarşılaşdıqda ona salam ver, səni qonaq çağırdıqda onun dəvətini qəbul et, səndən öyüd-nəsihət istədikdə ona öyüd-nəsihət ver, asqırıb Əlhəmdulilləh dedikdə ona Yərhəmukəllah de, xəstələndikdə onu ziyarət et və öldükdə onun cənazəsini müşayiət et"[1].***

---

[1] Müslim: 4\ 1705\ № 2162.

Böyük səhabələrdən biri, Bəra İbn Azib ﵁ belə deyir:

«أَمَرَنَا رَسُولُ اللَّهِ ﷺ بِسَبْعٍ وَنَهَانَا عَنْ سَبْعٍ: أَمَرَنَا بِعِيَادَةِ الْمَرِيضِ وَاتِّبَاعِ الْجَنَازَةِ وَتَشْمِيتِ الْعَاطِسِ وَإِجَابَةِ الدَّاعِي وَإِفْشَاءِ السَّلَامِ وَنَصْرِ الْمَظْلُومِ وَإِبْرَارِ الْمُقْسِمِ، وَنَهَانَا عَنْ خَوَاتِيمِ الذَّهَبِ وَعَنْ الشُّرْبِ فِي الْفِضَّةِ أَوْ قَالَ آنِيَةِ الْفِضَّةِ وَعَنْ الْمَيَاثِرِ وَالْقَسِّيِّ وَعَنْ لُبْسِ الْحَرِيرِ وَالدِّيبَاجِ وَالْإِسْتَبْرَقِ» . أخرجه البخاري في صحيحه ومسلم.

***Peyğəmbər ﷺ bizə yeddi işi əmr etmiş və yeddi işi qadağan etmişdir. Bizə, xəstəyə baş çəkməyi, cənazənin ardınca getməyi, asqırana yərhəmukəllah deməyi, dəvətə cavab verməyi, salamı yaymağı, məzluma kömək etməyi və and içənin andına inanmağı əmr etmişdir. Bizə, (kişilərə) qızıl üzük taxmağı, gümüş qablarda su içməyi, ipək yastığı, kətanla ipəyin qarışığından hazırlanan geyimi, ipək, adi və qalın fars ipəyini (dibac və istəbrəq) geyinməyi də qadağan etmişdir"[1].***

Digər hədisdə isə Peyğəmbər ﷺ buyurmuşdur:

«لَا تَحَاسَدُوا، وَلَا تَنَاجَشُوا، وَلَا تَبَاغَضُوا، وَلَا تَدَابَرُوا، وَلَا يَبِعْ بَعْضُكُمْ عَلَى بَيْعِ بَعْضٍ، وَكُونُوا عِبَادَ اللَّهِ إِخْوَانًا، الْمُسْلِمُ أَخُو الْمُسْلِمِ، لَا يَظْلِمُهُ، وَلَا يَخْذُلُهُ، وَلَا يَحْقِرُهُ، التَّقْوَى هَاهُنَا -وَيُشِيرُ إِلَى صَدْرِهِ ثَلَاثَ مَرَّاتٍ، بِحَسْبِ امْرِئٍ مِنَ الشَّرِّ أَنْ يَحْقِرَ أَخَاهُ الْمُسْلِمَ، كُلُّ الْمُسْلِمِ عَلَى الْمُسْلِمِ حَرَامٌ دَمُهُ وَمَالُهُ وَعِرْضُهُ» . أخرجه البخاري في صحيحه ومسلم.

---

[1] Buxari: 10\ 96\ № 5635. Müslim: 3\ 1635\ № 2066.

***"Bir-birinizə qarşı həsəd aparmayın, malı satmaq üçün bir-birinizi aldatmayın, bir-birinizə nifrət etməyin, bir-birinizdən üz çevirməyin, biriniz digərinin satışına qarışmasın və Allahın qardaş bəndələri olun. Müsəlman müsəlmanın qardaşıdır. Ona zülm etməz, onu alçaltmaz və təhqir etməz". Sonra üç dəfə: "Təqva buradadır" deyərək: - əli ilə sinəsinə işarə edir. "Müsəlman qardaşını təhqir edən kimsə artıq şər iş görmüşdür. Hər bir müsəlmanın qanı, malı və namusu digər müsəlmana haramdır"[1].***

Həmçinin yol kənarında oturanlar haqda da hədis buyurulmuşdur. Peyğəmbər ﷺ əshabəsinə yol kənarında oturmağı qadağan etmiş və yalnız yolun haqqını verdikdə buna icazə verərək buyurmuşdur:

«إِيَّاكُمْ وَالْجُلُوسَ فِي الطُّرُقَاتِ،» قَالُوا: يَا رَسُولَ اللَّهِ مَا لَنَا بُدٌّ مِنْ مَجَالِسِنَا نَتَحَدَّثُ فِيهَا، قَالَ رَسُولُ اللهِ ﷺ: «فَإِذَا أَبَيْتُمْ إِلاَّ الْمَجْلِسَ فَأَعْطُوا الطَّرِيقَ حَقَّهُ» قَالُوا: وَمَا حَقُّهُ؟ قَالَ: «غَضُّ الْبَصَرِ وَكَفُّ الأَذَى وَرَدُّ السَّلاَمِ وَالأَمْرُ بِالْمَعْرُوفِ وَالنَّهْيُ عَنْ الْمُنْكَرِ» . أخرجه البخاري في صحيحه ومسلم.

***"Yolların kənarında oturmayın!" səhabələr dedilər: Ey Allahın Elçisi! Bizə söhbət etmək üçün mütləq bir yer lazımdır. Peyğəmbər ﷺ buyurdu: "Əgər siz oturmaqda israr edirsinizsə onda yolun haqqını verin" onlar: haqqı nədir? - deyə soruşdular. O buyurdu: "(naməhrəm qadınlara baxmamaqla) gözü qorumaq, insanlara əziyyət verməmək, salamı qaytarmaq, yaxşı (məruf) işləri əmr etmək və pis (münkər) işlərdən çəkindirmək"[2].***

---

[1] Buxari: 10\ 484\ № 6066. Müslim: 4\ 1986\ № 2564.
[2] Buxari: 5\ 112\ № 2465. Müslim: 3\ 1675\ № 2121.

Peyğəmbər ﷺ buyurur:

«اضْمَنُوا لِي سِتًّا مِنْ أَنْفُسِكُمْ أَضْمَنْ لَكُمْ الْجَنَّةَ: اصْدُقُوا إِذَا حَدَّثْتُمْ، وَأَوْفُوا إِذَا وَعَدْتُمْ، وَأَدُّوا إِذَا اؤْتُمِنْتُمْ، وَاحْفَظُوا فُرُوجَكُمْ، وَغُضُّوا أَبْصَارَكُمْ، وَكُفُّوا أَيْدِيَكُمْ» .

أخرجه أحمد في مسنده وقال محققوه: حسن لغيره.

***"Mənə nəfsinizdə olan altı işə zəmanət verin, mən də sizə cənnəti vəd edim. Danışanda doğru danışın, vəd verdikdə vədinizdə vəfalı olun, əmanəti sahibinə qaytarın, övrət yerlərinizi qoruyun, gözlərinizi (harama baxmamaq üçün) yumun və əllərinizi (başqalarına pislik etməkdən) çəkin"[1].***

Belə ədəb-ərkandan məqsəd müsəlmanın yaxşılığa vərdiş edməsidir. Ona hər gün yaxşılıq etmək tövsiyə edilir. Bu haqda Peyğəmbər ﷺ buyurur:

«كُلُّ سُلَامَى مِنْ النَّاسِ عَلَيْهِ صَدَقَةٌ كُلَّ يَوْمٍ تَطْلُعُ فِيهِ الشَّمْسُ، قَالَ: تَعْدِلُ بَيْنَ الاثْنَيْنِ صَدَقَةٌ، وَتُعِينُ الرَّجُلَ فِي دَابَّتِهِ فَتَحْمِلُهُ عَلَيْهَا أَوْ تَرْفَعُ لَهُ عَلَيْهَا مَتَاعَهُ صَدَقَةٌ، قَالَ: وَالْكَلِمَةُ الطَّيِّبَةُ صَدَقَةٌ، وَكُلُّ خُطْوَةٍ تَمْشِيهَا إِلَى الصَّلَاةِ صَدَقَةٌ، وَتُمِيطُ الْأَذَى عَنْ الطَّرِيقِ صَدَقَةٌ» . أخرجه البخاري في صحيحه ومسلم.

***"Bütün insanlar günəş doğduqdan sonra sədəqə verməlidirlər. (məs.) İki nəfərə ədalətli hökm kəsmək sədəqədir, kiməsə miniyində kömək etmək və onu miniyinin tərkinə mindirib aparmaq, yaxud yükünü miniyin üzərinə qaldırmaq sədəqədir. Yaxşı söz sədəqədir.***

---

[1] Əhməd: 5\ 323. Kitabın tədqiqatçıları hədisin həsən olduğunu deyiblər.

***Namaza gedərkən atdığın hər bir addım sədəqədir. Yolda camaata əziyyət verən maneələri təmizləmək sədəqədir"[1].***

Bunlar, müsəlmandan hər gün tələb olunan yaxşılığın müxtəlif növləridir. Müsəlman hər gün bunların hansınısa etməlidir. Bir dəfə səhabələrdən biri Peyğəmbərdən ﷺ hədisdə buyurduğu yaxşılıqların heç birini edə bilmədiyi haqda soruşduqda belə buyurmuşdu:

«يُمْسِكُ عَنْ الشَّرِّ فَإِنَّهَا صَدَقَةٌ» . أخرجه البخاري في صحيحه ومسلم.

**"Şər işdən əl çəkməsi də sədəqədir"[2].**

Allah taala müsəlmanı yaxşılıq etməyə təşviq etmək üçün, öz müsəlman qardaşına kömək edənə, O isə ona kömək edəcəyini vəd etmişdir. Peyğəmbər ﷺ buyurur:

«مَنْ نَفَّسَ عَنْ مُؤْمِنٍ كُرْبَةً مِنْ كُرَبِ الدُّنْيَا نَفَّسَ اللَّهُ عَنْهُ كُرْبَةً مِنْ كُرَبِ يَوْمِ الْقِيَامَةِ وَمَنْ يَسَّرَ عَلَى مُعْسِرٍ يَسَّرَ اللَّهُ عَلَيْهِ فِي الدُّنْيَا وَالْآخِرَةِ وَمَنْ سَتَرَ مُسْلِمًا سَتَرَهُ اللَّهُ فِي الدُّنْيَا وَالْآخِرَةِ وَاللَّهُ فِي عَوْنِ الْعَبْدِ مَا كَانَ الْعَبْدُ فِي عَوْنِ أَخِيهِ» . أخرجه مسلم.

***"Kim bir mömininin dünya kədərlərindən (sıxıntılarından) birini azaldarsa, Allah taala qiyamət günü onun kədərlərindən (sıxıntılarından) birini azaldar. Kim çətinliyə düşənin işini asanlaşdırarsa, Allah taala da onun işini dünyada və axirətdə asanlaşdırar. Kim müsəlmanın eybini örtərsə, Allah taala həm dünyada, həm də axirətdə onun eybini örtər. Allah, öz qardaşına kömək edən bəndənin köməyində olar"[3].***

---

[1] Buxari: 6\ 85\ № 2891. Müslim: 2\ 699\ № 1009.
[2] Buxari: 3\ 307-308\ № 1445. Müslim: 2\ 699\ № 1008.
[3] Müslim: 4\ 2074\ № 2699.

**Son söz:**

Nеməti ilə saleh əməllər tamam olan Allaha həmd olsun. Onun minnəti ilə müsəlman ən yüksək məqamlara, lütfü ilə həm dünyada, həm də axirətdə qələbəyə nail olur. Sonra, Onun Elçisi Məhəmmədə, ailəsinə və əshabına Allah taalanın salat və salamı olsun.

Geniş İslam şəriəti və onun gözəllikləri haqda danışdıqdan sonra onu bildirmək istərdik ki, Allah taalanın bu şəriəti göndərməkdə məqsədi, müsəlmanın axirətdə Onun rizasını qazanması, dünya həyatını xoşbəxt yaşamasıdır. Bəşəriyyətə bundan xeyirli din, mükəmməl nizam, mərhəmətli və aliməqam şəriət verilməmişdir. İslam öz gözəlliyi, aliliyi və valehediciliyi ilə hər kəsi böyüyü və kiçiyi, qadını və kişini, rəhbəri və sıravi insanı, ağanı və köləni əhatə etmişdir.

Əslində İslam dini insanın beş zəruriyyətini: din, nəfs, var-dövlət, namusu və ağılı qorumaq üçün gəlmişdir.

Rəblərinə ibadət etmələri üçün onlara şəriət vermiş və dinə riayət etməyi buyurmuşdur. Sonra dində bir çox əmr və qadağalar qoymuş, dinə tam yiyələnmək üçün müəyyən təlim-tərbiyə üsulları buyurmuşdur. Bu təlim-tərbiyəyə yiyələnən hər bir kəs öz dinini mühafizə etdiyinin, şeytanın zəlil olduğunun və qəlbinin Allaha ibadət ilə dolduğunun şahidi ola bilər.

Həmçinin şəriət nəfsləri tələf olmaqdan qorumağı da diqqətdə saxlamışdır. Bədən sağlamlığı xoşbəxt həyatın zaminlərindəndir. Ona görə şəriət yaxşı nemətləri yeməyi əmr etmiş, pis qidaları isə haram etmişdir. Başqasının nəfsinə hər hansı yolla qəsd etməyi isə haram etmişdir. Bütün bunları tənzimləmək və insan nəfsini qorumaq üçün qayda-qanunlar qoymuş və cəzalar təyin etmişdir.

Şəriətin nəzərə aldığı daha bir zəruriyyət müsəlmanın var-dövlətini qorumaqdır. Çünki var-dövlət həyatın əsas tərkib

hissələrindən biridir. İslam, yaxşı qazancı halal etmiş və pis qazancları isə haram etmişdir. Həmçinin başqasının malına: oğurluqla, aldatmaqla, qəsb etməklə, qumarla və s. bu kimi yollarla təcavüz etməyi haram etmişdir.

İslam şəriəti namusu qorumağı öz məqsədlərindən etmişdir. O, müsəlmanın namusunu mühafizə etmiş və ona düşmənçilik etməyi haram qılmışdır. Ona görə heç bir müsəlmanın namusuna söz və ya əməllə təcavüz etmək olmaz və buna görə İslam şəriəti tənə, qeybət və nəmmamlıq edənləri pisləmişdir. Belə əməl sahiblərinə isə Allah taala bu dünyada şiddətli əzab vəd etmişdir. Bu dünyada cəzasına çatmayanlar qiyamət günü mütləq cəzalarını çəkəcəklər. Axirətin əzabı daha şiddətli, daha dəhşətlidir.

İslamın qoruduğu daha bir zərurət ağıldır. Ağıl insanı heyvandan fərqləndirən cəhətdir. Ağılın böyük əhəmiyyətini nəzərə alaraq onu tələf olmaqdan, itirməkdən qorumaq üçün qanunlar qoymuşdur. İçki içməyi, sərxoşedici və uyuşdurucu sulu və ya iyli maddələrin qəbulunu haram etmişdir. Bu əməllərlə məşğul olanlara qarşı kəskin və şiddətli cəzalar təyin etmişdir.

Bu beş zəruriyyət insanın dünya və axirət həyatını əks etdirdiyi üçün İslam şəriəti onu qorumuş və ona böyük əhəmiyyət vermişdir. Allah taala bu dini: dünyanın ən xoşbəxt məqamına, axirətdə isə Rəhman və Rəhimin razılığına yetişmək üçün, - asan bir vasitə etmişdir.

Adını çəkdiyimiz İslam gözəllikləri xatırlayanlar üçün xəbərdarlıq, qafillər üçün agah olmaq, əməl edənlər üçün təşviqat və inadkarlar üçün dəlildir.

Doğru yola yönəldən yalnız Allahdır.

**Peyğəmbərimiz Məhəmmədə, onun ailəsinə və səhabələrinə salavat və salam olsun!**

# Mündəricat

**İffətli olmaq və ayıb yerlərini qorumaq:**....................278